


# الخلافة أم الخرافة

# XİLAFƏT YOXSA XURAFAT

(iddiaların təhlili, hökmlərin təhriri)

SAMİR FİRDOVSİOĞLU



**Dəyərli vaxtını düşünərək ilk başdan bir nəsihət etmək istəyirik. Əgər zamanımızda sözü gedən xilafət mövzusu ilə maraqlanan biri deyilsənsə, lakin ibadətlərinlə məşğul olan və ümmətə bacardığın qədər kömək etməyə çalışan birisənsə o zaman bu kitabı oxumağa ehtiyacın yoxdur. Oxuya biləcəyin daha xeyirli kitablar vardır. Əgər iddia olunan xilafəti qəbul edən kəslərdənsənsə o zaman oxumağı tövsiyə edirik. Əgər qəbul etmirsənsə, lakin şübhə içindəsənsə sənə də oxumağı tövsiyə edirik. İslamda idarə sistemi ilə bağlı mövzuları araşdıran elm əhlisənsə o zaman bu kitabda faydalı ola biləcək məlumatlar vardır.**

# Kitabın mühtəvası

# MÜQƏDDİMƏ

“وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا مِنْكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُمْ فِي الْأَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِنْ قَبْلِهِمْ وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِي ارْتَضَىٰ لَهُمْ وَلَيُبَدِّلَنَّهُمْ مِنْ بَعْدِ خَوْفِهِمْ أَمْنًا يَعْبُدُونَنِي لَا يُشْرِكُونَ بِي شَيْئًا وَمَنْ كَفَرَ بَعْدَ ذَٰلِكَ فَأُولَٰئِكَ هُمُ الْفَاسِقُونَ”

**“Allah sizlərdən iman gətirib yaxşı işlər görənlərə vəd etmişdir ki, özlərindən əvvəlkiləri varislər etdiyi kimi onları da yer üzünün varisləri edəcək, möminlər üçün onların Özünün bəyəndiyi dinini möhkəmləndirəcək və onların qorxusunu sonra arxayınçılıqla əvəz edəcəkdir. Onlar Mənə ibadət edir və heç nəyi Mənə şərik qoşmurlar. Bundan sonra küfr edənlər – məhz onlar fasiqlərdir.”**

Bəşəriyyəti yaradan, onları başı boş buraxmayan, aralarında ədalətlə hökm olunması üçün, insanları zülmətlərdən aydınlığa çıxarmaq üçün məsləhətləri cəlb edən, məfsədətləri dəf edən mübarək və qüsursuz şəriəti göndərən göylərin və yerlərin Yaradıcısına, qiyamət gününün Sahibinə sonsuz həmd olsun! Bütün işlərimizdə yalnız Ondan kömək diləyirik, nüsrəti yalnız Ondan gözləyirik və Ona ibadət edirik. Şahidlik edirik ki, Ondan başqa ibadətə layiq məbud yoxdur, Təkdir və şəriki yoxdur və şahidlik edirik ki, Muhəmməd bin Abdilləh – salləllahu aleyhi va əlihi va səlləm – Onun quludur və qulları arasından seçdiyi elçisidir, nəbisidir.

Keçən ilin sonları internet aləmində azərbaycan dilində bir məqalə paylaşıldı. Məqalənin sahibi Əbul-Məhasin ləqəbi altında bir başqa məqaləyə cavab yazmışdı. Digər məqalənin sahibi Əbu Bəkr əl-Bağdadi’yə tabe olan camaatın elan etdiyi xilafətin batil olduğunu isbat etməyə çalışmışdı. Əbul-Məhasin qardaşımız isə həmin məqalədə yazılanlar ilə razılaşmadığı üçün ona uzun bir cavab vermək məqsədi ilə başqa bir məqalə yazıb və orada xilafətin səhih əsaslar üzərində qurulduğunu isbat etməyə çalışıb. Qarşınızdakı bu kitab da Əbul-Məhasin qardaşın yazdığı məqalədən yaranan ehtiyacın tələbindən əmələ gəlmişdir. İlk öncə biz də bir məqalə yazmaqla kifayətlənmək istədik, lakin mövzunun uzandığını gördükdə bunun adi bir məqalə formatına sığışmayacağını

anladıq və işimizə davam etməyə qərar verdik. Nəticədə qarşınızdakı bu kitab hasil oldu.

Heç kəsə gizli deyildir ki, kitabın üzərində dayandığı bu mövzu müsəlman gənclər arasında təhlükəli bir mövzuya çevrilib. Bu barədə yazanlar, söz bildirənlər məsələni tam şəkildə təhrir etmədən, onun haqqını vermədən danışırlar və özləri azdıqları kimi gəncləri də azdırırlar. Oxuduqları materiallar elan olunmuş xilafəti dəstəkləyən camaatlar tərəfindən hazırlanmış və internet aləminə yüklənmiş bəzi yazılardan ibarətdir. Bunları belə əminliklə deməyimizə əsas verən onların etdikləri xətaların eynisini internet şəbəkələrində paylaşılan ərəb dili məqalələrdə də tapmağımızdır. Ərəb dilində yazılmış eyni xətalar, eyni cümlə quruluşları sübut edir ki, bu mövzularda azərbaycan dilində yazan qardaşlarımız bu məqalələrdəki mətnləri bəzən olduğu kimi, bəzən də dəyişdirilmiş şəkildə oxuculara çatdırırlar. Əlbəttə ki, bunu edərkən haqq əhli olduqlarına, haqqa tabe olduqlarına etiqad edərək edirlər.

Sözünü etdiyimiz məqaləni ilk oxuduqda Əbul-Məhasin'in kim olması haqqında heç bir anlayışa sahib deyildik. Ancaq daha sonra onun kim olduğunu bizə söylədilər. Ona görə də məqalənin sahibinin kim olduğunu, onun elmi səviyyəsinin nə olduğunu bilərək bu sətrləri yazırıq. Düşünürəm ki, nə onun elmi səviyyəsi, nə də mənim elmi səviyyəm bu mövzularda yazmağı əslən bizə halal etmir, lakin şəriətimizin təsdiq etdiyi qaydaya əsasən "zərurətlər qadağaları mübah edir." Bizim bu mövzuda yazmağımız da zərurət babındandır, çünki cəmiyyətmizdə bu barədə yazanların etdikləri xətalar çox aşkardır və gənclərimiz bunların xəta olduğunu görə bilməyəcək qədər cahildirlər. Çox təəssüf ki, bu gənclərimiz Allah uğrunda fəzilətli iş gördüklərini zənn edərək alovlanmış fitnəni daha da qızışdırırlar, parçalanmanı daha da böyüdürlər, müsəlman qanlarının axmasına rəvac verirlər, özləri də bilmədən çox böyük bir günahın altına keçirlər. Bu səbəbdən bu mövzu barədə yazmağı zəruri gördük.

Yuxarıda qeyd etdiyimiz kimi Əbul-Məhasin qardaşımızı şəxsən tanıyırıq, onun fiqhi biliklərinin hansı səviyyədə olmasının da birinci əldən şahidi olmuşuq. Ona görə də məqaləsinin müqəddiməsində işlətdiyi bu sözlər bizə təəccüblü gəldi:

> "**Əslində onun kimi bir cahilin bu cür taleyüklü mövzulara baş vurmaması və ən azından bu haqda susması lazım idi. Çünki həmin şəxs bu işin əhli deyil və bunu onun yazdığı məqalə sübut edir.**"

Təəccüblü olan budur ki, biz qardaşımızın özünün də bu işdə əhliyyət sahibi olmadığını bilirik. Buna baxmayaraq iddia olunan "xilafəti" müdafiə etmək namına məqaləsində böyük alimlərin məzhəblərini batil çıxarmış, onlara qarşı həddini aşmışdır. Məqalədə düşdüyü ziddiyyətlər, etdiyi xətalar, nəqlləri əsllərindən dəqiqləşdirmədən götürməsi onu göstərir ki, qardaşımız da gərək bu mövzu barədə susardı və ümumiyyətlə o yazdığını yazaraq nə özünü, nə də başqalarını aldatmazdı! Bu yazımızda onun nə qədər yanıldığını qardaşımızın

özünə və ümumilikdə mövzu ilə maraqlanan azərbaycanlı müsəlmanlara göstərməyə çalışacağıq. Müzakirə boyunca onun şəxsinə qarşı hörmətli olmağa çalışdıq və ümid edirik ki, Əbul-Məhasin qardaşımız bu kitabımızı insaf gözü ilə mütaliə edəcək və xətalarını düzəldəcək. Tövfiq Allahdandır.

Bu yazımızda həmçinin xəlifəlik, imamlıqla bağlı ümumi faydalar zikr etmişik. Düşünürəm ki, mövzu ilə bağlı araşdırma edənlər yazımızda öz məramlarına müvafiq olan faydalı məlumatlar ilə qarşılaşacaqlar. Təbii ki, bu yazımızdakı hər bir xəta öz nəfsimizdən və şeytandandır, haqqa müvafiq hər sözümüz isə ilahi tövfiq, lütf və mərhəmətdir.

28 cumədəl-axir, 1437 hicri/6 aprel, 2016 miladi

Yötebory, İsveç Krallığı

# Xilafət mövzusuna giriş

Keçən il qardaşlarımdan biri ilə müzakirə ərəfəsində qardaşımız bizə səudiyyəli şeyx Əhməd ən-Nəcmi'nin – Allah rəhmət etsin! – sözünü təqdim etdi. Şeyxin sözlərinin məğzi budur ki, xilafətə dəvət ilə mükəlləf deyilik və xilafət uzun zamandır yoxdur, bir daha Mehdi'nin zühuru ilə qurulacaq. Sözlərindən anlaşılırdı ki, səudiyyəli bu şeyx ümumiyyətlə xilafəti qurmaq fikrini tərk etməyi doğru, xilafəti qurmaq üçün göstərilən səyləri isə bihudə görürdü. Çox təəssüflə söyləməliyik ki, Şeyxin təmsil etdiyi bu itticəh əslində son əsrlərə xarakterikdir və qətiyyən sünnət əhlinin rəyini təmsil etmir. Çünki sünnət əhli əsrlər boyunca xilafət qurmağın fərzu-kifayə olmasında ittifaq ediblər. Bu barədə o qədər alimlərimizdən nəqllər varid olub ki, onların hamısını bir araya toplasaq müstəqil bir kitab olar. Allah Adəmi yaradarkən onu yer üzündə xəlifə edəcəyini mələklərinə xəbər verir. Bu ayənin təfsirində böyük təfsir alimi əl-Qurtubi deyir:

“هَذِهِ الْآيَةُ أَصْلٌ فِي نَصْبِ إِمَامٍ وَخَلِيفَةٍ يُسْمَعُ لَهُ وَيُطَاعُ، لِتَجْتَمِعَ بِهِ الْكَلِمَةُ، وَتَنْفُذُ بِهِ أَحْكَامُ الْخَلِيفَةِ. وَلَا خِلَافَ فِي وُجُوبِ ذَلِكَ بَيْنَ الْأُمَّةِ وَلَا بَيْنَ الْأَئِمَّةِ”

> “**Bu ayə dəlildir ki, dinlənilən və itaət olunan bir imam və xəlifə təyin olunlıdır ki, bununla (müsəlmanların) sözləri bir olsun və xəlifənin hökmləri bununla icra edilsin. Bunun vacib olmasında nə ümmət arasında, nə də imamlar arasında bir ixtilaf yoxdur.**”[1]

Alimlərimiz qeyd edirlər ki, bu məsələdə əl-Əsam kimi bəzi mötəzili alimləri və “nəcədət” kimi bəzi xarici firqələrindən başqa heç kim müxalif olmayıb. Çox təəssüf ki, zamanımızda bu rəyə yaxın fikirlər ortaya çıxıb. Bilmək lazımdır ki, hər bir müsəlman bütün varlığı ilə şəriətlə idarə olunan, müsəlmanların birliyini, diriliyini təmin edən, ümməti birləşdirən bir xəlifəliyin, islam dövlətinin qurulmasını istəməlidir, çünki bunun qurulması fərzu kifayədir. Lakin bu fərzi yerinə yetirmək iki sinif insanın üzərinə düşür. İmam Yusuf bin əl-Həsən bin Abdilhədi əl-Məqdisi[2] (hicri 841-909) bu barədə deyir:

---

[1] “Təfsir əl-Qurtubi”, 1/264;

[2] İbnul-Mibrad ləqəbi ilə tanınır. Tələbəsi hənəfi alimi İbn Tulun onu “şeyxul-islam”, “çox səfərlər edən mühəddis” olaraq tanıdır.

“قال القاضي وهي أي الإمامة تعتبر فرضا على الكفاية يخاطب بها طائفتان من الناس: إحداهما أهل الاجتهاد حتى يختاروا والثاني وجود من اجتمعت فيه شروطها حتى ينصّب...”

**“əl-Qadi dedi: Bu – yəni imamlıq – fərzu kifayədir və bunun (vacibliyi i)lə iki qrup insan müxatibdir: bunlardan birincisi (imamı) seçənə qədər ictihad əhli, ikincisi isə seçilib təyin olunana qədər imamlığın şərtlərini özündə daşıyan kəsdir...”**[3]

Bu sözlərin mahiyyəti budur ki, xilafəti qurmağın fərzliyi hər bir müsəlman fərdin üzərində deyildir, ümmətin böyüklərinin, alimlərinin üzərindədir. Həmçinin imam olmağa yararlı olan müsəlmanlar da bununla mükəlləfdirlər. Bu barədə əslində sözü uzatmağa heç bir ehtiyac yoxdur. Kim bu həqiqət ilə tanış olmaq istəyirsə şəriət siyasəti barəsində yazılmış və imamlıq mövzularına toxunmuş istənilən kitabı ələ alıb oxuya bilər. İmamlıq mövzularına girmədən öncə bir çox müəllif məsələnin hökmünü bəyan edir və orada bunun üzərində alimlərdən nəql olunmuş icmalar ilə tanış olmaq mümkündür.

Burada bilinməsi və idrak edilməsi önəmli olan məsələlərdən biri də imamətlə bağlı məsələlərin təbiətidir. Bil ki, imamət, yəni imamlıq və xilafət ilə bağlı məsələlərin əksəriyyəti qəti olmayan, zənni olan olan məsələlərdir, alimlərin ictihadına tabedir. Bu barədə İməmul-Harameyn əl-Cuveyni (419-478) buyurur:

“وَلَكِنَّ الْمَسْأَلَةَ مَظْنُونَةٌ مُجْتَهَدٌ فِيهَا، وَمُعْظَمُ مَسَائِلِ الْإِمَامَةِ عَرِيَّةٌ عَنْ مَسْلَكِ الْقَطْعِ، خَلِيّةٌ عَنْ مَدَارِكِ الْيَقِينِ.”

**“Lakin məsələ zənnidir, ictihada tabedir və imamətin əksər məsələləri qətiyyət məsləkindən məhrumdur, yəqinliklə idrak etmə yolundan xalidir.”**[4]

Ona görə də heç kim – xüsusilə də ictihad mərtəbəsinə çatmamış biri – imamətlə bağlı alimlərin ictihad etdiyi yerlərdə görüşlərdən hər hansısa birini “batil” və ya “fasid” sözləri ilə vəsf etməməlidir. Yalnız batilliyi qəti olaraq bilinən rəylər üçün bu cür hökm edilə bilər. Həmçinin bu kimi məsələlərdə səninlə razılaşmayanları zəlalətdə ittiham etmək də aşırılıqdır, cahillikdir. Əksinə alimlərin ictihadına ehtiram göstərməli, onların cəhdlərinə şükür etməlidir.

Bununla yanaşı nizamı qorumaq üçün, intizama sarılmaq üçün imamlıqla bağlı rəyləri hər kəsin ixtiyarına buraxmamaq lazımdır. Bu məsələ namazda imam seçmək məsələsi deyildir ki, hər bir məsciddə üstün olan məzhəbin görüşü ilə əməl olunmasına göz yuma bilək. Lakin bütün ümmətin üzərində təsiri hiss

[3] “İydah Turuqil-İstiqamə”, səh: 65;
[4] “əl-Ğiyasi”, səh: 75

olunan bir məsələdir, əgər seçiləcək rəy üçün bir ölçü və bir qayda qoyulmazsa, hər kəs öz bildiyi ilə davranarsa hərc-mərclik olar, fəsad yayılar. Ona görə də alimlərimiz tərəfindən qoyulmuş ölçü budur ki, bu mövzudakı məsələlərdə tabe olunması doğru olan rəy öz dövrünün alimləri arasında ən çox yayılan, hakim olan rəydir. Bu barədə Əbu Həmid əl-Ğazəli (450-505) deyir:

“وأكثر مسَائِل الإمامة وأحكامها مسَائِل فقهية ظنية يحكم فِيهَا بِمُوجب الرأى الأغلب”

**“İmamət məsələlərinin və hökmlərinin əksəriyyəti fiqhi, zənni məsələlərdir ki, onlardan çoxluq olan rəyin tələbi ilə hökm olunar.”**[5]

Bu zikr etdiklərimizi dərk etmək çox önəmlidir, çünki bu məsələlərdə nəfsinə xoş gələn rəyi götürüb getməyin, beləcə də əksəriyyətin rəyinə tabe olmamağın sənin üçün fayda verməyəcək, əksinə ortaya çıxan fəsadın yükünü daşıyanlara səni şərik edəcəkdir. Bu yükün altına keçmək istəmirsənsə bizim zamanımızdakı elm əhlinin əksəriyyətinin kitabımızdakı məsələlər haqqındakı rəyini öyrənmən icab edər. Elm əhli dedikdə isə fiqhi ilə, elmi ilə ümmətin tanınmış, seçilmiş alimlərini qəsd edirik. Çünki Allah – azzə va cəllə - bizə bilmədiyimiz təqdirdə zikr əhlindən soruşmağımızı əmr edir və məlumdur ki, zikr əhli ümmətin arasında tanınan zikr əhli ola bilər. Kimsə tanımadığı, etibar etmədiyi kəsdən bir məsələnin hökmünü soruşmadığı üçün Allahın Kitabındakı bu buyuruğunda sözü gedən zikr əhli ilə qulları arasında seçilən, sayılan, etimad qazanan zikr əhlini qəsd etdiyini başa düşürük.

Biz bu kitabı izləməyi asanlaşdırmaq üçün onu bəzi hissələrə ayırdıq və ümimilikdə kitab üç hissədə əmələ gəldi. Birinci hissədə ümmətin üzərində bir imam, bir xəlifə seçmək üçün tələb olunan beyət haqqındadır, daha dəqiq desək xəlifə seçiminin səhih və etibarlı olması üçün “həll və əqd əhlindən” tələb olunan miqdar haqqındadır. Kitabın ikinci hissəsində isə bəzi etirazlara və şübhələrə cavab verməyə çalışmışıq. Bu etirazları və şübhə adlandırdığımız dəlilləri Əbul-Məhasin qardaşımızın məqaləsindən seçmişik. Üçüncü hissədə isə günümüzdə iddia olunan “xilafətin” özü haqqında, bu iddiadakı qüsurlar, problemli tərəflər haqqında yazmışıq.

[5] “Fədaihul-Bətiniyyə”, səh: 192;

## Tələb olunan beyət nə qədərdir?

Alimlər şəriət siyasəti haqqında yazdıqları kitablarında imamın seçilməsi üçün nə qədər beyətin toplanmasının şərt olmasında ixtilaf ediblər. Bu mövzuda əşarilərin, mötəzililərin, hənbəlilərin və qeyrilərinin görüşləri fərqlənir. İlk öncə məzhəblərə görə bu görüşləri qeyd edək. “əl-Kuveytiyyə” fiqh ensiklopediyasında bu barədə deyilir:

“اخْتَلَفَ فِي ذَلكَ الْفُقَهَاءُ، فَنُقل عَنْ بَعْض الْحَنَفيَّة أَنَّهُ يُشْتَرَطُ جَمَاعَةٌ دُونَ تَحْديد عَدَد مُعَيَّنٍ. وَذَهَبَ الْمَالكيَّةُ وَالْحَنَابِلَةُ إِلَى أَنَّهَا لاَ تَنْعَقدُ إلاَّ بِجُمْهُور أَهْل الْحَل وَالْعَقْد، بِالْحُضُور وَالْمُبَاشَرَةِ بِصَفْقَة الْيَد، وَإِشْهَاد الْغَائِب منْهُم منْ كُل بَلَد،ليَكُونَ الرِّضَا بِه عَامًّا، وَالتَّسْليمُ بِإِمَامته إجْمَاعًا .وَذَهَبَ الشَّافعيَّةُ إِلَى أَنَّهُ لاَ يُشْتَرَطُ اتِّفَاقُ أَهْل الْحَل وَالْعَقْد منْ سَائِرِ الْبِلاَد، لِتَعَذُّرِ ذَلِكَ وَمَا فِيه مِنَ الْمَشَقَّة”

**“Bu barədə fəqihlər ixtilaf ediblər. Hənəfilərin bəzilərindən nəql olunub ki, müəyyən bir ədədlə məhdudlaşdırma etmədən (beyət edənlərin) bir camaat olması şərtdir. Malikilər və hənbəlilər isə bu görüşdədirlər ki, (imamlıq) əqdi yalnız həll və əqd əhlinin cumhuru ilə, onların iştirakı, əli sıxaraq görüşməklə və başqa ölkələrdən onlardan iştirak etməyənləri şahidlərlə xəbərdar etməklə bağlanır ki, onun üzərinə razılıq ümumi olsun və imamlığını qəbul etmək icma ilə olsun. Şafi’ilər isə bu rəydədirlər ki, bütün ölkələrdən olan həll və əqd əhlinin ittifaqı şərt deyildir, çünki bu, imkansızdır və bunda məşəqqət vardır..”**[6]

Ümumi olaraq məzhəblərin rəyləri ilə tanış olduqdan sonra ayrı-ayrılıqda o görüşlər, onların əsasları haqqında xəbər verəcəyik. İlk öncə hənəfi alimlərin, sonra şafi’ilərin sözlərini zikr edəcəyik. Sonda isə maliki alimləri ilə hənbəlilərin sözlərini bir yerdə qeyd edəcəyik, çünki mahiyyət və nəticə baxımından hər iki məzhəbin rəyi eynidir və ya bir-birinə yaxındır.

[6]“əl-Məvsuatul-Fiqhiyyətul-Kuveytiyyə”, 6/221;

## Hənəfi məzhəbinin görüşü

Hənəfi fəqihləri bu barədə şafi'ilər kimi fiqh kitablarında tez-tez bu məsələyə toxunmayıblar. Ona görə də hənəfilərdən bizə gəlib çatan nəqllər arasında fərqlər vardır. Ən qədim mənbələrdən başlamaq məqsədi ilə "şəri siyasət" haqqında kitab yazmış bir hənəfi müəllifdən başlayırıq. İbnus-Simnəni adı ilə tanınmış hənəfi fəqihi Əbul-Qasim Əli bin Muhəmməd ər-Rahəbi (vəfatı hicri 499) bu barədə deyir:

"والاختيار أن يجتمع جماعة من صلحاء الأمة وأهل الحل والعقد والعلم والأمانة فيعقدوا للإمام.ولا يفتقر إلى جميع الأمة في ذلك، كما ينعقد نكاح المرأة ببعض الأولياء.واختلف في البعض الذي تنعقد به (الإمامة) فأكثر أصحابنا يقولون: جميع الناس..."

**"İxtiyar/seçim (yolu ilə imamlığı qurmaq) isə ümmətin salehlərindən, həll və əqd əhlindən, elm və əmanət əhlindən ibarət bir camaatın toplanması və imam üçün əqd bağlamasıdır. Bunu etməkdə ümmətin hamısına ehtiyac yoxdur, necə ki, qadının nikahı vəlilərdən bəzisi ilə qüvvəyə minir. İmamlığın qüvvəyə minməsi üçün bu "bəzi" barəsində ixtilaf ediblər; əshabımızın əksəri deyir: "insanların hamısı..."**[7]

Burada alimin sözləri zahirən ziddiyyətli görünür. Lakin bu zahiri ziddiyyət arasında təvafuq görmək mümkündür. Demək olar ki, imamın seçilməsi üçün toplanan və ya tələb olunan həll və əqd əhlinin hamısının icması şərtdir. Bütün ümmətin həll və əqd əhlinin icmasını qəsd etmir, lakin beyət etmək üçün hazır olan bir qrup həll və əqd əhlinin hamısının ittifaq etməsi vacibdir. İbnus-Simnəni bu görüşü hənəfilərin əksəriyyətinə nisbət etmişdir. Onun sözlərini bu cür anlamaq daha sonra gəlmiş hənəfi alimlərinin görüşlərindən uzaqlaşmır. Bir başqa hənəfi fəqihi əl-Kəməl bin Əbi Şərif bu barədə əl-Kəməl İbnul-Huməm əs-Sivasi'nin sözlərini şərh edərək deyir:

[7] "Ravdatul-Qudat va Tariqun-Nəcət", səh: 70;

“ويثبت عقد الإمامة بأحد أمرين إما باستخلاف الخليفة إياه... وإما ببيعة من تعتبر بيعته من أهل الحل والعقد ولا يشترط بيعة جميعهم ولا عدد محدود بل يكفي بيعة جماعة من العلماء أو جماعة من أهل الرأي والتدبير.”

**“İmamlıq əqdi iki yoldan biri ilə sabit olur: ya xəlifənin özündən sonra təyin etməsi ilə... ya da həll və əqd əhlindən olan beyəti etibara alınan kəslərin beyəti ilə; onların hamısının beyət etməsi, nə də məhdud bir say şərt deyildir. Əksinə alimlərdən bir camaatın və ya rəy və tədbir əhlindən bir camaatın beyəti kifayət edir.**”[8]

Burada da hamısının icmasının şərt olmadığını, lakin həll və əqd əhlindən bir camaatın beyətinin kifayət etdiyini deyir. Lakin burada camaatda gərəkli olanları aydın şəkildə zikr etməsələr də sözlərinin zahirindən anladığımız budur ki, onlar ümmət tərəfindən itaət olunan bir camaat olmalıdır. Son dönəm hənəfi fəqihlərindən İbn Nuceym əl-Misri deyir:

“وَالْمُرَادُ بِالْإِمَامِ السُّلْطَانُ أَوْ نَائِبُهُ قَالَ فِي الْخَانِيَّةِ مِنْ السِّيَرِ قَالَ عُلَمَاؤُنَا السُّلْطَانُ مَنْ يَصِيرُ سُلْطَانًا بِأَمْرَيْنِ بِالْمُبَايَعَةِ مَعَهُ وَيُعْتَبَرُ فِي الْمُبَايَعَةِ أَشْرَافُهُمْ وَأَعْيَانُهُمْ وَالثَّانِي أَنْ يَنْفُذَ حُكْمُهُ فِي رَعِيَّتِهِ خَوْفًا مِنْ قَهْرِهِ وَجَبَرُوتِهِ فَإِنْ بَايَعَ النَّاسَ وَلَمْ يَنْفُذْ حُكْمُهُ فِيهِمْ لِعَجْزِهِ عَنْ قَهْرِهِمْ لَا يَصِيرُ سُلْطَانًا”

**“İmam ilə qəsd olunan sultan və onun naibidir. “əl-Xaniyyə” kitabında “əs-Siyər” kitabından nəqlən dedi: Alimlərimiz deyirlər ki, sultan iki şey ilə sultan olandır: ona beyət etməklə və beyət edənlərdə etibara alınanlar onların ən şərəfliləri və statusu ən yüksək olanlarıdır. İkinci isə onun qəhrindən və qüdrətindən qorxmaqla rəiyyəsi arasında hökmünün nüfuz etməsidir. Əgər insanlar beyət edərsə, lakin onları qəhr etməkdən aciz olarsa sultan olmaz.**”[9]

Beləliklə də buradan başa düşdüyümüz budur ki, hənəfilərə görə iki şərt olmalıdır. Beyət edənlər insanlar arasında ən şərəflilər, sözlərinə itaət olunan ən seçkin kimsələr olmalıdır. İkinci şərt isə seçilənin qərarlarını rəiyyət arasında tətbiq edə bilməsi üçün qüvvəsi, qüdrəti, hegemonluğu olmalıdır. “əl-Xaniyyə” fətvaları Fəxruddin Qadi Xan əl-Fərğani’nin fətvaları toplusudur. Onun təqdim etdiyi rəyi İbn Abidin və başqa hənəfi alimləri hənəfilərin rəyi olaraq təsdiq edirlər.

---

[8]“Kitəbul-Musəmməratu fi Şərhil-Musəyəra”, 2/171;
[9]“əl-Bəhr ər-Raiq”, 5/152;

## Şafi'i məzhəbinin görüşü

Şafi'i fəqihlərinə gəldikdə isə əksər fiqh kitablarında bu məsələyə yer verirlər və bu barədə sözlərinin əksəriyyəti eyni və ya bir-birinə yaxın təbirlərdir. Sözümüzə şafi'ilərdə iki şeyxdən biri sayılan Əbul-Qasim Abdulkərim ər-Rafi'i əl-Qazvini'nin (vəfatı hicri 623) "əl-Aziz Şərhul-Vaciz" kitabındakı sözləri ilə başlayırıq:

"المعتبر بيعةُ أهْل الحلِّ والعقْد من العلماء والرؤساء، ووجوهِ النَّاس الذين يتيسَّر حضورهم؛ لأنه ينتظم الأمر برأيهم واتفاقهم، ويتبعهم سائر الناس، ولا يُشْترط اتفاقُ أهل الحلِّ والعقْد في سائر البلاد والأصقاع، بل إذا وصل الخَبَر إلى أهل البلاد البعيدة، فعليهم الموافقة والمتابعة؛ وعلى هذا، فلا يتعيَن للاعتبار عددٌ بل لا يُشْترط العدَدُ، فلو تعلَّق الحلُّ والعقْد بواحدِ مطاعٍ، كفَتْ بيعته لانعقاد الإمامة، ولا بد أن يكون الَّذين يبايِعُون بصفاتِ الشهودِ"

**"Mötəbər olan iştirak etməkləri asan olan alimlərdən, başçılardan və insanların böyüklərindən ibarət həll və əqd əhlinin beyətidir, <u>çünki bu iş onların rəyi və ittifaqı ilə düzəlir və digər insanlar onlara tabe olur</u>. Digər ölkələrdəki və bölgələrdəki həll və əqd əhlinin də ittifaq etməsi şərt deyildir, əksinə xəbər uzaq ölkələrin əhlinə çatarsa o zaman onlara razılaşmaq və tabe olmaq vacibdir. Buna əsasən etibarlılıq üçün bir say vacib deyildir. Hətta burada say şərt deyildir, beləliklə də əgər "həll və əqd"<u>itaət olunan</u> bir nəfərdən asılı olarsa onun beyət etməsi imamlığın qüvvəyə minməsi üçün kifayət edir. <u>Beyət edənlərin şahid sifətində olması labüddür.</u>"**[10]

ər-Rafi'inin bu görüşünə İmam ən-Nəvəvi "ər-Ravda" kitabında heç bir etiraz etmir və ən-Nəvəvi də digər kitablarında bu rəyi qeyd etmişdir. Mütəaxxir şafi'ilərin muhəqqiq fəqihi İbn Həcər əl-Heytəmi bu barədə deyir:

[10]"əl-Aziz Şərh əl-Vaciz", 11/73;

“(وَالْأَصَحُّ) أَنَّ الْمُعْتَبَرَ، هُوَ (بَيْعَةُ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ مِنْ الْعُلَمَاءِ وَالرُّؤَسَاءِ وَوُجُوهِ النَّاسِ الَّذِينَ يَتَيَسَّرُ اجْتِمَاعُهُمْ) حَالَةَ الْبَيْعَةِ بِأَنْ لَمْ يَكُنْ فِيهِ كُلْفَةٌ عُرْفًا فِيمَا يَظْهَرُ؛ لِأَنَّ الْأَمْرَ يَنْتَظِمُ بِهِمْ وَيَتَّبِعُهُمْ سَائِرُ النَّاسِ وَيَكْفِي بَيْعَةُ وَاحِدٍ انْحَصَرَ الْحَلُّ وَالْعَقْدُ فِيهِ أَمَّا بَيْعَةُ غَيْرِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ مِنْ الْعَوَامّ فَلَا عِبْرَةَ بِهَا”

**“[Ən səhih olan] budur ki, etibara alınan, beyət halında örfən bir külfət/çətinlik olmamaq surəti ilə [toplaşmaqları asan olan alimlər, liderlər və insanların böyüklərindən ibarət həll və əqd əhlinin beyətidir], <u>çünki iş onların vasitəsi ilə düzəlir və digər insanlar da onlara tabe olur</u>. Həll və əqd əhlinin yalnız ondan ibarət olduğu bir nəfərin də beyəti kifayət edir. <u>Həll və əqd əhlindən olmayanların, avamın beyətində isə ibrət yoxdur.</u>”**[11]

Şəriət siyasəti haqqında ayrıca kitab yazmış İbn Cəmə’a və əl-Qalqaşəndi kimi şafi’i fəqihləri də kitablarında məzhəblərinin məşhur və mötəbər rəyini zikr edirlər və o rəydən kənara çıxmırlar. İmam Bədruddin İbn Cəmə’a (hicri 639-733) deyir:

“وَلَا يشْتَرط فِي أهل الْبيعَة عدد مَخْصُوص، بل من تيَسّر حُضُوره عِنْد عقدهَا، وَلَا تتَوَقَّف صحَّتهَا على مبايعة أهل الْأَمْصَار، بل مَتى بَلغهُمْ لَزِمَهُم الْمُوَافقَة إِذا كَانَ الْمَعْقُود لَهُ أهلا لَهَا.”

**“Beyət əhlində məxsus bir say şərt deyildir, əksinə əqd zamanı iştirak etməsi mümkün olanlar (yetərlidir) və (bunun) səhihliyi bütün ölkələrin əhlinin beyət etməsindən asılı deyildir, əksinə <u>əgər üzərinə (imamlıq) əqd(i) bağlanan kəs işin əhlidirsə</u> onlara (bunun xəbəri) nə zaman çatarsa razılaşmaqları vacibdir.”**[12]

Həmçinin Əhməd bin Abdilləh əl-Qalqaşəndi (hicri 756-821) xilafət haqqında yazdığı kitabında bir rəy ilə kifayətlənmir, bu barədə gəlmiş bütün rəyləri qeyd edir və sonunda şafi’ilərin görüşünü qeyd edir və deyir:

“وَالثَّامِن وَهُوَ الْأَصَح عِنْد أَصْحَابنَا الشَّافِعِيَّة رَضِي الله عَنْهُم أَنَّهَا تَنْعَقِد بِمن تيَسّر حُضُوره وَقت الْمُبَايعَة فِي ذَلِك الْموضع من الْعلمَاء والرؤساء وَسَائِر وُجُوه النَّاس المتصفين بِصِفَات الشُّهُود حَتَّى لَو تعلق الْحل وَالْعقد بِوَاحِد مُطَاع كفى لِأَن الْأَمر اذا لم يكن صادرا عَن راي من لَهُ تقدم فِي الْوَضع وَقَول مَقْبُول لم تؤمن اثارة فتْنَة وَلَا الْتِفَات الى أهل الْبِلَاد النائية”

[11]“Tuhfətul-Muhtəc”, 9/76;
[12]“Təhrirul-Əhkəm fi Tədbiri Əhlil-İsləm”, səh: 53;

> “**Səkkizinci görüş; və bu, əshabımız şafi’ilərdə - radiyallahu anhum - ən səhih rəydir ki, (imamlıq) beyət vaxtı həmin yerdə iştirak etməsi mümkün olan şahidlərdə axtarılan vəsflərlə vəsf olunan alimlər, liderlər və insanların digər böyükləri(nin beyət etməsi) ilə qüvvəyə minir, hətta (bütün) “həll və əqd” itaət olunan bir nəfərdən asılı olarsa (onun beyəti ilə) kifayət edər, çünki bu iş əgər bu vəziyyətdə öndər olan, sözü qəbul olunan birindən sadir olmazsa fitnənin qopmasından arxayın olmaq mümkün olmaz.**”[13]

Bu nəqllərdən aşkar şəkildə anlayırıq ki, şafi’i fəqihlər mütəkəllimlər kimi mütləq olaraq həll və əqd əhlindən bir nəfərin beyətini keçərli görmürlər və onlardan bu tərəfdən fərqlənirlər. Fərq budur ki, mütəkəllimlərə görə əgər həll və əqd əhli çox olarsa, onlardan birinin beyəti ilə imamlıq səhih ola bilər, halbuki şafi’ilər “bir nəfərin beyətindən” danışarkən həll və əqd vəzifəsinin onda toplanmış olmasını şərt görürlər. Ona görə də onu vəsf edərkən “**inhəsara əl-həllu val-aqdu fihi**” şəklində qeyd qoyurlar, yəni “**həll və əqdin onda münhəsir olduğu bir kəsdən**” bəhs edirlər. Munhəsir olması isə həll və əqdin yalnız bir nəfərdə olması anlamına gəlir. Başqa sözlə desək bütün ümmətdə əgər yalnız bir nəfər həll və əqdi varsa onun beyəti kifayət edir. Mütəkəllimlər isə belə bir qeydi zikr etmirlər.

Həmçinin şafi’ilərə görə beyət edənlərin vəsfləri önəmlidir və onlarda şafi’ilər şahidlərdə tələb olunan vəsflərin olmasını tələb edirlər. Şahidlərdə isə adillik, büluğ, əql, islam və azadlıq kimi vəsflər tələb olunur. Beyət edənlərin müctəhid olması və ya aralarında birinin müctəhid olması şərtdirmi? Bu barədə şafi’ilərdə ixtilaf vardır. ər-Rafi’iyə görə aralarında birinin müctəhid olması şərtdir, lakin şafi’ilərdə bu, zəif görüş sayılır və onlara görə tələb olunan sadəcə olaraq elm əhli olması, rəy və hikmət sahibi olmasıdır.

Eləcə də anlayırıq ki, əgər bir bölgədə həll və əqd əhlinin ittifaqı ilə və ya əksərinin razılığı ilə imam seçilərsə və ona beyət edilərsə o zaman digər bölgələrdə yaşayanlara bu qərarı qəbul etmək və buna tabe olmaq vacib olur. Lakin İbn Cəmə’a’nın da qeyd etdiyi kimi bu hökm beyət olunan imamın imamlığa əhl olması halına aiddir, əgər imamlığa əhl olmazsa o zaman başqalarına bu seçimə tabe olmaq vacib olmaz. Lakin zərurət halında tabe olmağın, təsdiqləməyin vacibliyi ictihadi məsələdir, yəni alimlər arasında müzakirə məsələsidir və qarşıda bu barədə ət-Təftəzəni’nin bu nöqtə ilə bağlı sözlərini təqdim edəcəyik.

Bu nəqlləri doğru anlamaq üçün bəzi nöqtələr üzərində diqqəti cəmləşdirmək lazımdır. Bu nöqtələrdən biri budur ki, şafi’i fəqihləri bir bölgədəki həll və əqd əhlinin beyət etməsinin kifayət etməsini deyərkən bununla qəsd etdikləri nədir?

---

[13]“Məəsirul-İnəqati fi Mə’alimil-Xiləfəti”, 1/44;

Misal üçün Azərbaycan kimi bir yerdə həll və əqd əhli yaxın ölkələrin həll və əqd əhlinin rəyini öyrənmədən, onlarla məşvərət etmədən, məsələni onlara qaldırmadan bir kəsə imam olaraq beyət edərsə bu kifayət edirmi? Cavab budur ki, xeyr, bu alimlərin qəsdi bu deyildir. Şəriət elmlərini öyrənənlər bilirlər ki, "təhqiqul-mənət" deyilən bir anlayış vardır və bu, alimlər tərəfindən verilmiş bir hökmün verilmə səbəbini dəqiqləşdirməkdir, müəyyənləşdirməkdir. Şafi'i fəqihləri bütün ölkələrin həll və əqd əhlinin beyət etməsinin şərt olmadığını, yalnız bir bölgədəkilərin beyətinin kifayət etdiyini deyərkən bunu işin çətinliyi və imkansızlığı ilə əlaqələndirirlər, çünki onların dövründə İraqda beyət ediləcək imam üçün İspaniyadakı həll və əqd əhlinin və ya İndoneziyadakıların rəyini öyrənmək imkansızdır, o zamanda onların rəyini gözləmək aylar çəkərdi, bu isə öz növbəsində bu vaxt ərzində məsləhətlərin əldən getməsinə və fəsadın ortaya çıxmasına səbəb olardı. Ona görə də şafi'i fəqihləri bütün ümmətin bir-birindən çox uzaqda yaşayan həll və əqd əhlinin əksəriyyətinin beyət etməsini şərt görməyiblər, lakin bir-birinə yaxın olan ərazilərdəki həll və əqd əhlinin razılığı şərtdir, çünki hətta bu alimlərin zamanında belə bir-birinə yaxın coğrafiyada yaşayan həll və əqd əhlinin rəyini öyrənmək və onların imam seçimində iştirak etməsi heç də çətin bir şey olmamışdır. Ona görə də məşhur imam Muhyis-Sunnə Əbu Muhəmməd əl-Hüseyn bin Məsud əl-Bəğavi (hicri 433-516) deyir:

"والأصح؛ أنه يشترط مبايعة أهل الحل والعقد من العلماء والرؤساء أهل العدالة دون الفسقة من البلاد المتقاربة، ثم إذا بلغ الخبر إلى البلاد البعيدة-: يجب عليهم الانقياد والطاعة."

"**Ən səhih olan fasiq olmayan, adil olan alimlərdən və liderlərdən ibarət olan və bir-birinə yaxın ölkələrdən olan həl və əqd əhlinin beyət etməsi şərtdir, sonra əgər xəbər uzaq ölkələrə çatarsa onlara boyun əymək və itaət etmək vacib olar.**"[14]

əl-Bəğavi bu sözləri ilə təsdiq edir ki, yaxınlıq və uzaqlıq zamana görədir, nisbidir və önəmli olan həll və əqd əhlinin – bir-birilərindən nə qədər uzaqda yaşamaqlarından asılı olmayaraq – imamlığa namizəd haqqında rəyini bildirmək üçün bir araya gələ bilmək imkanıdır. əl-Bəğavi'nin sözləri təsdiqləyir ki, İraq, Şam, Misir və Hicaz kimi yaxın ölkələrdəki həll və əqd əhlinin rəyi etibara alınır, lakin İspaniya, İndoneziya kimi ölkələrdəkilərin rəyi üçün gözləmək məsləhətə müxalif olduğu üçün onların rəyini gözləmək şərt deyildir. Ona görə də o zaman deyilmiş sözləri mütləq olaraq bizim zamanımızda da eyni cür qəbul etmək doğru deyildir, çünki o zaman Bağdadın bir başında oturanların o biri başında yerləşən bir alimin rəyini öyrənmək üçün ehtiyac duyduqları vaxtdan da çox daha qısa bir vaxta bu gün Azərbaycandakıların İndoneziyadakıların rəyini öyrənmək imkanımız vardır. Bu nöqtə çox önəmlidir, lakin çoxları bundan ya

[14]"ət-Təhzib", 7/273

qafildirlər, ya da təcəhül edirlər. Halbuki şafi’ilərin sözləri çox aşkardır, ər-Rafi’i, ən-Nəvəvi, İbn Cəmə’a, Zəkəriyyə əl-Ənsari, Xatib əş-Şirbini, İbn Həcər əl-Heytəmi, ər-Ramli və digələri eyni cümləni təkrarlayırlar:

“...بَيْعَةُ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ مِنْ الْعُلَمَاءِ وَالرُّؤَسَاءِ وَوُجُوهِ النَّاسِ الَّذِينَ يَتَيَسَّرُ اجْتِمَاعُهُمْ...”

“**...bir araya gəlməkləri asanlıqla mümkün olan alimlərdən, liderlərdən və insanların böyüklərindən ibarət olan həll və əqd əhlinin beyəti...**”

Bu gün də müxtəlif ölkələrdə yaşayan həll və əqd əhlinin qərar verməsi üçün bir araya gəlməsi asandır, örfən çətin heç bir şey yoxdur, çünki şafi’ilər beyətin səhih olması üçün fiziki olaraq imamın hüzurunda iştirak etməsini şərt qoymurlar, belə ki, beyət bir əqddir və əqdlərdə vəkalət keçərlidir. Bu gün hətta uzaq ərazilərdə olanların müasir vasitələr ilə beyətdə iştirak etməkləri mümkündür və heç bir çətinlik yoxdur.

Üstəlik qeyd etməliyik ki, şafi’ilər də digər həll və əqd əhlinin razılığını önəmli görürlər. Əgər ümmətin həll və əqd əhlinin əksəriyyəti bəzilərinin beyət etdiyi imamı qəbul etməzsə, rədd edərsə bu beyət səhih olmaz. Ona görə də Zeynuddin əl-Məlibəri (vəfatı hicri 987) imamın olmadığı təqdirdə həll və əqd əhlinin qazi seçməsi barədə danışarkən deyir:

“فإن فقد الإمام فتولية أهل الحل والعقد في البلد أو بعضهم مع رضا الباقين”

“**Əgər imam yoxdursa ölkədəki həll və əqd əhli və ya onların bəzisi tərəfindən – digərlərinin razılığı ilə - (qazi) seçilməlidir.**”[15]

əl-Məlibəri’nin sözlərini şərh edən şafi’i fəqihi Osman bin Muhəmməd əd-Dimyəti bu barədə deyir:

“(وقوله: أهل الحل والعقد) أي حل الامور وعقدها من العلماء ووجوه الناس المتيسر اجتماعهم.(قوله: أو بعضهم) أي بعض أهل الحل والعقد، ولو كان واحدا لكن مع رضا الباقين.”

“**Onun “həll və əqd əhli” sözü; yəni məsələlərin həll edilməsi və bağlanılması(nda sözü olan və) bir araya gəlməkləri mümkün olan alimlər və insanların rəhbərləri. Onun “və ya onların bəzisi” sözünə gəldikdə isə yəni həll və əqd əhlinin bəzisi, hətta tək olsa belə, lakin digərlərinin razılığı olmalıdır.**”[16]

---

15“Fəthul-Muin bi Şərhi Qurratil-Ayn bi Muhimmətid-Din”, səh: 609;
16“İanətut-Talibin fi Həlli Əlfəzi Fəthil-Muin”, 4/241;

Bu nöqtə ilə bağlı belə bir sual verməliyik. Nə üçün şafi'i fəqihləri hakim, sultan olmayan bir bölgədə qazinin seçilməsi üçün o bölgənin həll və əqd əhlinin icma etməsini şərt görürlər, lakin qazilikdən də daha əhəmiyyətli məqam olan imamlıq, xəlifəlik məqamında həll və əqd əhlinin icma etməsini şərt görmürlər? Bu sual şafi'ilərin rəyini anlamağımız üçün çox önəmli bir sualdır. Bu sualın cavabını bizə İbn Həcər əl-Məkki verərək deyir:

"وَيُفْهَمُ مِنْ كَلَامِ الْمَاوَرْدِيِّ فِي الْحَاوِي أَنَّهُ لَا بُدَّ أَنْ يَتَّفِقَ عَلَى نَصْبِهِ أَهْلُ الْحَلِّ وَالْعَقْدِ حَيْثُ قَالَ فَقَلَّدَ أَهْلُ الاخْتِيَارِ أَوْ بَعْضُهُمْ وَاحِدًا بِرِضَا الْبَاقِينَ وَبِهِ يُنْظَرُ فِي قَوْلِ الْأَصْبَحِيِّ ثَلَاثَةٌ مِنْ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ وَقَوْلِ السَّمْهُودِيِّ جَمَاعَةٌ مِنْ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ لَكِنَّ مَا قَالَهُ هُوَ الْقِيَاسُ فِي نَصْبِ الْإِمَامِ فَإِنَّهُ لَا يُشْتَرَطُ فِيهِ اتِّفَاقُ جَمِيعِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ بَلْ صَرَّحُوا بِأَنَّهُ لَوْ انْحَصَرَ الْحَلُّ وَالْعَقْدُ فِي وَاحِدٍ مُطَاعٍ كَفَى وَكَذَا يُقَالُ بِهِ هُنَا وَلِلْمَاوَرْدِيِّ أَنْ يُفَرِّقَ بِأَنَّ تِلْكَ وِلَايَةٌ عَامَّةٌ فَلَوْ اشْتَرَطْنَا حُضُورَ جَمِيعِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ لَتَعَسَّرَ أَوْ تَعَذَّرَ وَفَاتَ الْمَقْصُودُ وَعَظُمَ الْخَطْبُ وَلَمْ يَتَيَسَّرْ نَصْبُ إمَامٍ لِبُعْدِ اجْتِمَاعِهِمْ عَلَى وَاحِدٍ فَاقْتَضَتْ الضَّرُورَةُ الْمُسَامَحَةَ ثَمَّ بِالِاكْتِفَاءِ بِمَنْ تَيَسَّرَ مِنْهُمْ وَأَمَّا هُنَا فَهَذِهِ وِلَايَةٌ خَاصَّةٌ عَلَى قَوْمٍ مَخْصُوصِينَ فَاشْتُرِطَ رِضَا جَمِيعِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ بِهَا إذْ لَا عُسْرَ فِي ذَلِكَ وَلَا مَشَقَّةَ وَهَذَا هُوَ الَّذِي يَتَّجِهُ تَرْجِيحُهُ، وَاَللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ."

**"əl-Məvardi'nin "əl-Havi" kitabındakı sözlərindən anlaşılır ki, (qazinin) təyini üzərində həll və əqd əhlinin ittifaq etməsi vacibdir, belə ki, demişdir: "ixtiyar əhli və ya bəziləri geridə qalanlarının razılığı ilə bir nəfərə vəzifə verərsə". Bununla əl-Əsbəhi'nin "həll və əqd əhlindən üç nəfər" sözünə və əs-Səmhudi'nin "həll və əqd əhlindən bir qrup" sözünə nəzər salınmalıdır. Lakin onun dediyi imam seçiminə qiyasın tələbidir, beləki imam seçimində həll və əqd əhlinin ittifaq etməsi şərt deyildir, əksinə hətta aşkar sözlərlə deyiblər ki, həll və əqd itaət olunan bir nəfərdə məhdudlaşarsa/toplanarsa (onun beyəti) kifayət edər. Eyni şeyi burada da demək olar. əl-Məvardiyə görə bu ikisi arasında belə fərq qoymaq olar ki, o, ümumi vilayətdir, beləliklə də əgər həll və əqd əhlinin hamısının iştirak etməsini şərt qoyarsa çətin olar və ya imkansız olar və məqsəd əldən qaçırılar, vəziyyət ağırlaşar və bir nəfər üzərində toplaşmaqları uzaq olduğu üçün imamın seçilməsi mümkün olmaz, ona görə də zərurət güzəştə gedilməsini, beləliklə də onlardan (toplanması) mümkün olanlarla kifayətlənməyi tələb edir. Buraya gəldikdə isə bu məxsus bir qövm üzərində xüsusi bir vilayətdir, ona görə də həll və əqd əhlinin hamısının buna razı olması şərt görülüb, çünki bunda bir çətinlik və bir məşəqqət yoxdur. Tərcih edilmək üçün tutarlı olan rəy budur. Doğrusunu Allah – subhənəhu va təalə - bilir."**[17]

[17] "əl-Fətəva əl-Fiqhiyyə əl-Kubra", 4/299;

Bu sözlərdən sənə aydın oldu ki, əziz oxucu, qazidə həll və əqd əhlinin ittifaq etməsi şərt görülməyinə baxmayaraq imamda bunu şərt görməməklərinin yeganə səbəbi zərurətdir. Çünki yuxarıda izah etdiyimiz kimi bunu şərt görmək onların zamanına görə məsləhətlərin zay olmasına, fəsadın ortaya çıxmasına səbəb olurdu. O zaman zərurətlə bağlı önəmli bir qaydanı xatırlatmaq istəyirik.

"الضَّرَورَاتُ تُقَدَّرُ بِقَدْرِهَا"

"**Zərurətlər miqdarları dərəcəsində ölçülürlər.**"

Bu qayda üzərində ittifaq edilmiş bir qaydadır. Ona görə də həlak edici aclıqla üzləşən insana donuz əti yeməyi yalnız ehtiyacı miqdarında icazə verirlər. Yoxsa bir insan həlak edici aclıqla üzləşdikdə "artıq donuz əti mənə halaldır" deyərək doyana qədər yeyə bilməz, bu cür edərsə haram etmiş olar. Ona icazəli olan zərərdən onu qurtaracaq miqdarını yeməkdir. Sözünü etdiyimiz bu hal da bunun kimidir. Zərurət imkan vermir ki, bütün həll və əqd əhlinin ittifaqı şərt görülsə, lakin mümkün olan miqdarının ittifaq etməsi öz əsli şərtiyyəti üzərində qalmalıdır. Məhz bu perspektivdən biz şafi'ilərin - "**bir araya gəlməkləri asanlıqla mümkün olan**" – şəklində işlətdikləri sözləri anlaya bilərik. Daha öncə əl-Bəğavi'nin sözlərində bunun bir-birinə yaxın bölgələrə aid olduğunu gördük. Məhz bu səbəbdən şafi'i fəqihləri nə həll və əqd əhlinin icma etməyini, nə də müəyyən bir sayın tamamlanmasını şərt görüblər, lakin deyiblər ki, beyətdə iştirak etməsi asanlıqla mümkün olan kəslərin razılaşması şərtdir. Onların sayı qırx da ola bilər, yüz də ola bilər, hətta həll və əqd əhli yalnız bir nəfərin əlində də məhsur ola bilər, yəni ümmətin içindən elə bir kəs çıxa bilər ki, onun sözü ilə kütlələr hərəkətə gəlsin, onun sözünə itaət olunsun və şafi'ilərə görə belə biri olarsa onun beyəti kifayət edəcək. Yuxarıda biz bu nöqtəni təfsilatı ilə izah etdik və burada önəmli olduğu üçün bir daha təkrarladıq. Şafi'i alimlərinin qəsdi bu deyil ki, toplanmaqları mümkün olan həll və əqd əhlindən bir iki nəfərin beyəti kifayət edir, xeyr, belə bir mənanı qəsd etmirlər. Onlara görə toplanmaqları asanlıqla mümkün olan həll və əqd əhlinin hamısının razılığı olmalıdır, onların arasında ixtilaf olmamalıdır, onların bir hissəsi birinə beyət edərkən, digərləri buna qarşı müxalif olmamalıdır. Şafi'i mütəkəllimlər arasından bir çox alim bu mövzuda fəqihlər ilə mütəkəllimlərin rəyini birləşdirərək ortaq bir görüş də səsləndiriblər. Misal üçün şafi'i üləmasından Əbul-Fəth Abdulkərim əş-Şəhristəni (479-548) deyir:

"ولو عقد واحد ولم يسمع من الباقين نكير كفى ذلك"

> "**Əgər (həll və əqd əhlindən) bir nəfər (imamlıq əqdini) bağlayarsa və digərlərindən bunu inkar etdikləri eşidilməzsə bu, kifayət edər.**"[18]

Bu sözlərinin məfhumundan anlaşılır ki, əgər digərləri bunu inkar edərsə kifayət etməz, əks təqdirdə bu qeydi zikr etməsinin faydası yoxdur. Bu baxımdan əş-Şəhristani'nin rəyi mütəkəllimlərdən çox şafi'i fəqihlərinin rəyinə yaxındır. Halbuki qarşıda zikr edəcəyimiz kimi mütəkəllimlər mütləq şəkildə bir nəfərin beyətinin kifayət edəcəyini deyirlər və təfsilatlı bir qeyd zikr etmirlər. Qarşıda

[18]"Nihəyətul-Əqdəm", səh: 494

mütəkəllimlərin rəyini də müzakirə edəcəyik və onların arasında ən böyük mütəkəllim imamların da mahiyyət etibarı ilə necə cumhur ilə razılaşdığını göstərəcəyik.
Burada önəmli olan digər bir məqam imam seçiminin fitnəyə səbəb olmamasıdır. Ona görə də fəqihlər həll və əqd əhlini vəsf edərkən onların ümmətin böyükləri, alimləri, qaziləri, avtoritetlər olmasını qeyd edirlər. Həmçinin həll və əqd əhlinin itaət olunan bir nəfərdə cəm olması halını da qeyd edirlər. Bütün bunların önəmi imam seçiminin məfsədəyə götürməməsinə görədir. Ona görə də əl-Qalqaşəndi'dən yuxarıda zikr etdiyimiz sözlərində deyir: "**...çünki bu iş əgər bu vəziyyətdə öndər olan, sözü qəbul olunan birindən sadir olmazsa fitnənin qopmasından arxayın olmaq mümkün olmaz.**" İbn Həcər, Xatib əş-Şirbini, Şəmsuddin ər-Ramli və digər şafi'i fəqihləri də həll və əqd əhlinin beyətinin önəmindən danışarkən deyirlər ki, çünki "**<u>digər insanlar da onlara tabe olur.</u>**"
Beləliklə də bu təqriratdan anlayırıq ki, həll və əqd əhli insanların onlara tabe olduğu kəslərdir, ümmətin tanımadığı kəslər qətiyyən həll və əqd əhli ola bilməzlər və onların seçiminin qətiyyən heç bir təsiri yoxdur.
Hətta bəzi şafi'i alimləri bu məsələdə daha da irəli gedərək bir imamın özündən sonrakı vəliəhdi seçməsi halında bütün həll və əqd əhlinin razılığını şərt görüblər. Bu barədə Cəmələddin Abdurrahim əl-İsnəvi "əl-Muhimmət" kitabında deyir:

"وحكى الماوردي والروياني كلاهما في كتاب الوصاية عن بعضهم أنه لا يصح إلا بالرضا ورضاهم أن يعلموا به فلا ينكروا كما وقع في استخلاف أبي بكر لعمر"

"**əl-Məvardi və ər-Ruyəni'nin hər ikisi "əl-Vasayə" kitabında bəzilərindən hekayət edirlər ki, (bir xəlifənin özündən sonrakını təyin etməsi) yalnız razılıq ilə səhihdir və razılıqları onu tanımaqları və inkar etməməkləridir, necə ki, bu, Əbu Bəkrin Öməri seçməsində baş vermişdir.**"[19]

Şafi'i fəqihlərindən bəziləri isə imamlığın səhih olması üçün həll və əqd əhlindən ən az qırx nəfərin beyət etməsini şərt görüblər və bu, əl-Həlimi'nin görüşü olaraq bilinir. Əbu Abdilləh əl-Hüseyn bin əl-Həsən əl-Həlimi əl-Curcəni əl-Buxari (hicri 338-403) deyir:

"فإن لم يكن لمن جمع شرائط الإمامة عهد من إمام قبله واحتيج إلى نصب المسلمين إياه فأشبه ما يقال في هذا الباب عندي وأملاه بالحق أنه إذا اجتمع أربعون عدلا من المسلمين أحدهم عالم يصلح للقضاء بين الناس فعقد..."

"**İmamlıq şərtlərini özündə toplamış bir kəs özündən əvvəlki imam tərəfindən vəliyul-əhd seçilməyibsə və müsəlmanların onu seçməsinə ehtiyac varsa, o zaman bu mövzuda mənə görə ən doğru olan, haqla ən dolğun olan budur ki, içlərindən insanlar arasında qazi olmağa yararlı olan bir şəxs olmaqla**

[19]"əl-Muhimmət fi Şərhir-Ravdati var-Rafi'i", 8/285;

**müsəlmanlardan qırx adil kəs (onun üzərində) razılaşarsa əqd bağlanar…”**[20]

əl-Qadi əl-Həlimi şafi’i məzhəbində vəch sahiblərindən sayıldığı üçün onun bu görüşünün də şafi’i məzhəbində bir vəch olduğunu deyə bilərik. Bu görüşünü cümə namazında imamla birlikdə qırx nəfərin toplanması məsələsinə qiyas etmişdir. “Nihəyətul-Ərab fi Fununil-Ədəb” adlı ensiklopediya kitabının sahibi, tarixçi alim Şihəbuddin Əhməd bin Abdilvahhab ən-Nuveyri də (hicri 667-733) kitabında məhz əl-Həlimi’nin görüşünə üstünlük vermişdir. Şafi’ilərin bir hissəsi bu məsələdə hənbəlilər və malikilər kimi əksəriyyətin beyəti ilə imamlığın sabit olduğunu deyirlər. Bu rəydə olanlardan biri böyük alimi Alləmə Əbul-Abbas Muhibbuddin Əhməd bin Abdilləh ət-Tabəri (615-694) olmuşdur. O, cənnətlə müjdələnmiş mübarək səhabi Əbu Bəkr haqqında yazdığı kitabında deyir:

“ولا يقال: إن التخلف إنما يكون تخلفًا عن الحق إذا انعقدت الإمامة وهي إنما تنعقد بإجماع أهل الحل والعقد, ومن ذكر من المتخلفين عن البيعة من أجلة أهل الحل والعقد؛ لأنا نقول: جمهور أهل الحل والعقد بايعوا أبا بكر وإذا اجتمع الجمهور على من تكاملت آلته واجتمعت خصال الأهلية فيه ولم يكن مفضولًا وكان على رأي انعقدت الولاية ولزم الباقين المتابعة على المبايعة, إذا كانوا معترفين بأهليته لها, وإلا جعل ذلك طريقًا إلى عدم انعقاد كل بيعة وتطرق الخلل وانتشار المفاسد فلا يقوم للدين نظام أبدًا.”

“**(Burada) “imamlıq əqdi bağlandıqdan – və o, həll və əqd əhlinin icması ilə bağlanır - sonra beyətdən geri qalmaq haqdan geri qalmaqdır, halbuki beyətdən geri qalanlar həll və əqd əhlinin ən dəyərlilərindəndir” demək doğru olmaz. Çünki biz deyirik ki, həll və əqd əhlinin cumhuru/əksəriyyəti Əbu Bəkrə beyət etmişdilər və əgər alətləri tamamlanmış, əhliyyət xüsusiyyətlərini özündə birləşdirmiş biri üzərindı əksəriyyət razılaşarsa, ondan daha əfzəli olmazsa, fikir/rəy sahibidirsə onun vilayəti qüvvəyə minər/sabitləşər və geridə qalanlara - əgər onun imamlığa əhl olduğunu etiraf edərlərsə - beyətdə ona tabe olmaqları vacib olar, yoxsa əks təqdirdə bu, heç bir beyətin sabit olmamasına, araya xələllərin daxil olmasına və fəsadların yayılmasına aparan yol olacaq, o zaman da dünyada heç zaman nizam-intizam qurula bilməz.”**[21]

Alimin bu sözlərindən anlaşılan budur ki, cumhurun beyət etməsi ilə imamlıq səhih olur. Lakin şafi’ilərdə mötəməd olan rəy yuxarıda onlardan nəql etdiyimiz

[20] “əl-Minhəc fi Şuabil-İmən”, 3/155;
[21] “ər-Riyad ən-Nədira fi Mənəqibil-Aşəra”, 1/244-245;

və izah etdiyimiz rəydir. Şafi'ilərin görüşləri ilə tanış olduqdan sonra yerdə qalan məzhəblərə keçirik.

## Malikilərin və hənbəlilərin rəyi

“əl-Kuveytiyyə” kitabından zikr etdiyimiz nəqldən anlaşıldı ki, malikilər ilə hənbəlilərin bu məsələdəki görüşləri eynidir və ya bir-birinə yaxındır. Malikilərə gəldikdə “əş-Şərh əl-Kəbir” kitabının sahibi Şeyx Əhməd əd-Dərdir əl-Məliki deyir:

“(الْبَاغِيَةُ فِرْقَةٌ) أَيْ طَائِفَةٌ مِنْ الْمُسْلِمِينَ (خَالَفَتْ الْإِمَامَ) الَّذِي ثَبَتَتْ إمَامَتُهُ بِاتِّفَاقِ النَّاسِ عَلَيْهِ وَيَزِيدُ بْنُ مُعَاوِيَةَ لَمْ تَثْبُتْ إمَامَتُهُ؛ لِأَنَّ أَهْلَ الْحِجَازِ لَمْ يُسَلِّمُوا لَهُ الْإِمَامَةَ لِظُلْمِهِ وَنَائِبُ الْإِمَامِ مِثْلُهُ.”

**“[Bağilər imama] - hansı ki, imamlığı insanların onun üzərində ittifaq etməsi ilə sabit olub - [qarşı çıxan bir firqədir], yəni müsəlmanlardan ibarət bir qrupdur və Yezid bin Müaviyə’nin imamlığı sabit olmayıb, çünki Hicaz əhli zülmünə görə onun imamlığını qəbul etməmişdilər. İmamın naibi də onun kimidir.”**[22]

Şeyxin bu sözlərindən anlaşılır ki, imamlığın sabit olması üçün həll və əqd əhlinin ittifaq etməsi lazımdır. “əş-Şərh əs-Sağir” kitabında isə deyir:

“فَشَرْطُ الْإِمَامِ: تَسْلِيمُ الْعُدُولِ ذَوِي الرَّأْيِ؛ فَلَا يَرِدُ قِتَالُ الْإِمَامِ الْحُسَيْنِ يَزِيدَ بْنَ مُعَاوِيَةَ؛ لِأَنَّ يَزِيدَ لَمْ يُسَلِّمْ أَهْلَ الْحِجَازِ إمَامَتَهُ لِظُلْمِهِ”

**“İmamın şərti, görüş sahibi olan adil kəslərin onu qəbul etməsidir, İmam Hüseyn’in Yezid bin Müaviyə’yə qarşı vuruşması etiraz kimi gətirilə bilməz, çünki Hicaz əhli Yezidin zülmünə görə onun imamlığını qəbul etməyiblər.”**

“əş-Şərh əs-Sağir” kitabında malikilərin son əsrlərdə yaşamış ən böyük fəqihlərindən Əbul-Abbas əs-Savi əl-Xalvati haşiyə yazıb. Haşiyəsində bu sözləri şərh edərkən buyurur:

“فَتَحَصَّلَ أَنَّ الْمُتَغَلِّبَ لَا تَثْبُتُ لَهُ الْإِمَامَةُ إلَّا إنْ دَخَلَ عُمُومُ النَّاسِ تَحْتَ طَاعَتِهِ وَإِلَّا فَالْخَارِجُ عَلَيْهِ لَا يَكُونُ بَاغِيًا كَقَضِيَّةِ الْحُسَيْنِ مَعَ الْيَزِيدِ.”

[22]“əş-Şərh əl-Kəbir”, 4/298;

“**Beləliklə də buradan çıxan nəticə budur ki, güc ilə hakimiyyəti ələ alanın imamlığı yanız insanların ümumunun onun itaətinə daxil olması halında sabit olur, əks təqdirdə ona qarşı çıxan baği sayılmır, necə ki, əl-Hüseynin halı Yezid ilə belə idi.**”[23]

Bu, malikilərin rəyidir. Onlara görə Yezidin imamlığı sabit olmamışdı, çünki Hicaz əhlindən olan həll və əqd əhli onun imamlığını qəbul etməmişdilər. O dövrün həll və əqd əhlindən önəmli bir pay hicazlılara düşürdü. Hənbəli alimlərinin də rəyi bu baxımdan malikilərin rəyinə yaxındır. əl-Qadi Əbu Yalə Muhəmməd bin əl-Hüseyn əl-Fərra (hicri 380-458) “əl-Əhkəmus-Sultaniyyə” kitabında deyir:

“فَأَمَّا انْعِقَادُهَا باختيار أهل الحل والعقد فلا تنعقد إلا بجمهور أهل الحل والعقد.”

“**Amma həll və əqd əhlinin seçimi ilə imamlığın qüvvəyə minməsinə gəldikdə isə yalnız həll və əqd əhlinin əksəriyyəti ilə qüvvəyə minir.**”[24]

əl-Qadi Əbu Yalə’nin təqrir etdiyi bu rəy hənbəli üləması arasında məşhurdur. İbnul-Mibrad adı ilə tanınmış Alləmə İmam Yusuf bin Həsən bin Abdilhədi əd-Diməşqi əl-Hənbəli (hicri 841-909) deyir:

“فأما انعقادُها باختيار أهل الحل والعقد فلا تنعقد إلا بجمهورهم وأكثر أهل الحل والعقد...”

“**Həll və əqd əhlinin seçimi ilə (imamlığın) qüvvəyə minməsinə gəldikdə isə yalnız onların cumhuru ilə, həll və əqd əhlinin əksəriyyəti ilə qüvvəyə minir.**”[25]

İbnul-Mibrad xüsusilə Şeyxul-İslam İbn Teymiyyə’nin mirasından faydalanmış alimlərdəndir. Hədis əhlinin zamanında ən bariz şəxsiyyətlərindən olmuşdur. Hənbəli mütəkəllimlərdən sayılan İbnuz-Zəğuni adı ilə tanınmış hənbəli fəqihi İmam Əbul-Həsən Əli bin Ubeydilləh əl-Bəğdədi isə (hicri 455-527) deyir:

“وإذا كانت البيعة على سبيل الاختيار والرضا وجب أن يحضرها أهل العقد والحل, المقصود من هذا إرادة الإجماع على الاختيار فحكمها في ذلك حكم الإجماع عند الجماعة المختلفين وقد زعمت طائفة أنه إذا بايع أربعة من أهل

[23]“Haşiyətus-Savi aləş-Şərhis-Sağir”, 4/427;
[24] “əl-Əhkəmus-Sultaniyyə”, səh: 23;
[25]“İydah Turuqil-İstiqamə”, səh: 79;

العقد كفى ذلك وذهبت الأشعرية إلى أنه إذا بايعه واحد كفى وهو قول جماعة من الشيعة"

**"Əgər beyət seçim və razılıq yolu ilə olarsa əqd və həll əhlinin iştirak etməsi vacibdir və bununla məqsəd seçim üzərində icmanın hasil olmasıdır, beləliklə də burada bunun hökmü ixtilaf etmiş camaat nəzdində icma hökmüdür. Bir qrup iddia edib ki, əqd əhlindən dörd nəfər beyət edərsə kifayət edər və əşarilər isə bir nəfərin beyət etməsinin kifayət edəcəyini deyirlər və bu, şiələrdən bir qrupun rəyidir."**

Daha sonra İbnuz-Zəğuni həll və əqd əhlinin beyəti ilə hənbəlilərdə nəyin qəsd olunduğunu bizə öyrədəcək sözlərə yer vermişdir və bu, müxaliflərin etirazlarına cavab məqamındadır. Ona görə də həm etirazı, həm də etirazın cavabını burada zikr edirik:

" قالوا أليس قد تأخر علي بن أبي طالب رضي الله عنه عن بيعة أبي بكر وهو من أهل العقد والحل؟ فإن كانت بيعته تمت قبل أن يبايع فقد صح أنه لا يشترط فيها ما قلتم وإن كانت لم تتم خلافته حتى بايع على بن أبي طالب فقد حكم ونفذ وأمضى في تلك المدة فيجب أن يكون تصرفه باطلا لأنه حكم قبل ثبوت ولايته وهذا لا يجوز. قلنا: إن عليا – عليه السلام – لم يخالف في البيعة عند تأخّره وتخلّفه بل كان راضيا وإنما عاقه رأي رآه في ذلك ولما ارتفع مانعه خرج إلى البيعة وإنما يقدح في البيعة إذا أظهر الخلاف وامتنع من الرضا بالعقد."

**"Dedilər: Məgər Əli bin Əbi Talib – radiyallahu anhu – Əbu Bəkrə beyətdən geri qalmadımı, halbuki o, əqd və həll əhlindəndir? Əgər Əbu Bəkrin beyəti Əli beyət etmədən öncə tamamlanmışdısa o zaman sizin dediyinizin şərt olmaması rəyi doğru çıxır. Əgər Əli bin Əbi Talib beyət etməyənə qədər (Əbu Bəkrin) xəlifəliyi tamamlanmamışdısa o zaman o müddətdə hökm vermiş, hökmlərini həyata keçirmişdi, deməli onun etdiklərinin batil olması vacibdir, çünki vilayət sabit olmadan verilmiş hökmdür, bu isə icazəli deyildir.**

**(Bunun cavabında) deyirik ki, Əli – aleyhissələm – (beyət etməkdə) gecikməsi və geri qalması ilə beyətdə müxalif olmamışdır, əksinə razı idi, sadəcə olaraq bu barədə sahib olduğu rəy ona (beyət etməkdə) mane olmuşdu və bu maneə aradan qalxdıqda beyət etmək üçün çıxdı. Yalnız aşkarda müxalifət etmək və (imamlıq) əqdi ilə razılaşmaqdan imtina etmək beyətə zərər verir."**

İbnuz-Zəğuni'nin bu sözlərindən anlaşılır ki, hənbəlilər həll və əqd əhlinin əksəriyyətinin və ya hamısının beyət etməsini tələb etdikdə bununla şəxsən hər bir kəsin beyət etməsi tələb olunmur, lakin etibara alınan həll və əqd əhlindən bir hissənin beyət etməsi, digərlərinin isə müxalifət etməməsi, etiraz etməməsi və razılıq bildirməsidir. Davamında buyurur:

"قالوا فما تذهبون إليه أمر لا يكاد يقدر عليه وذلك أن أهل الحل والعقد كثيرون متفرقون في البلاد فلو طالبنا بجمعهم ومبايعتهم تعذر ذلك ووقف الأمر وخيف من الهرج الفساد وتوثب الطالبين فيؤدي إلي أمر صعب وما يؤدي إلي ذلك يجب تركه.

قلنا: إنما ذكرنا هذا عند الاختيار والفسحة والمهلة ووقوف الأمر على الرضا فإذا لم يؤمن ذلك كان عذرا في ترك اعتباره ولأن العادة في الأعم أن أهل العقد والحل يكثرون في موضع يكون فيه الإمام ويقلون في غير موضعه فإذا بادر هؤلاء إلى العقد وبقي الأقل والبعيد الذي يتعذر تحصيله عفي عنه لتعذره."

**"Dedilər: Sizin qəbul etdiyiniz rəy az qala imkansız olan bir şeydir, belə ki, həll və əqd əhlinin sayı çoxdur, fərqli ölkələrə səpələniblər. Əgər onların bir arada toplanmaqlarını, beyət etməklərini tələb etsək bu imkansız olar, proses durar, hərc-mərclik, fəsad olar və vəzifəyə gəlmək istəyənlər zülm ilə istila edərlər. Beləliklə də çətin/ağır bir vəziyyətə gətirib çıxarır və belə bir vəziyyətə gətirən bir şeyi tərk etmək vacibdir.**

**(Bunun cavabında) deyirik: Biz bunu seçim imkanı, genişlik/rahatlıq və möhlət və işin razılıqla həll edilə bilməsi halında zikr etdik, əgər belə bir halın olmasından əmin olmaq olmazsa bunu etibara almamaq üçün üzr olacaq və çünki çox zaman adət budur ki, əqd və həll əhli imamın olduğu bölgədə çox olurlar və olmadığı bölgədə az olurlar və əgər bunlar (imamlıq) əqdini bağlamağa tələsərlərsə, sayları az olanlar və uzaqda olanlar – hansılar ki, onların da gətirilməsi imkansızdır – qalarsa imkansız olduğu üçün bağışlanar."**[26]

əl-Qadi Əbu Yalə və İbnul-Mibrad'dan zikr etdiyimiz sözlər onların xüsusilə şəri siyasət haqqında yazdıqları kitablarında keçir. Müşahidə etdiyimiz kimi bu kitablarda "həll və əqd əhlinin əksəriyyəti" zikr olunur, lakin hənbəlilərin mötəməd fiqh kitablarında "əksəriyyət" sözü yerinə "icma" sözünü zikr edirlər. İmam Mənsur bin Yunus əl-Buhuti deyir:

[26] "əl-İydah fi Usulid-Din", səh: 621-623;

“(وَيَثْبُتُ) نَصْبُ الْإِمَامِ (بِإِجْمَاعِ الْمُسْلِمِينَ عَلَيْهِ كَإِمَامَةِ أَبِي بَكْرٍ) الصِّدِّيقِ - رَضِيَ اللَّهُ عَنْهُ - خَلِيفَةِ رَسُولِ اللَّهِ - صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ - (مِنْ بَيْعَةِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ مِنْ الْعُلَمَاءِ وَوُجُوهِ النَّاسِ) الَّذِينَ (بِصِفَةِ الشُّهُودِ) مِنْ الْعَدَالَةِ وَغَيْرِهَا”

**“İmamın seçimi Allahın elçisinin – salləllahu aleyhi va səlləm – xəlifəsi əs-Siddiq [Əbu Bəkrin] – radiyallahu anhu – [imamlığında olduğu kimi insanların liderləri və alimlərdən – ] hansılar ki, [şahidlərdə olan] adillik və başqa [vəsflərə sahibdirlər - ibarət olan həll və əqd əhlinin beyət etməsi vasitəsilə müsəlmanların onun üzərində icma etməsi ilə sabit olur.”**[27]

“Muntəhə əl-İradət” kitabında da “icma” sözü keçir. əl-Qadi Əbu Yalə “əl-Əhkəm əs-Sultaniyyə” kitabında “əksəriyyət”, “əl-Mutəməd” kitabında isə “icma” zikr etmişdir. Ola bilsin ki, bu ikisi arasında ziddiyyət yoxdur və burada “icma” ilə qəsd edilən müxalifəti zəif olan icmadır, bu isə böyük əksəriyyət ilə mümkündür. Çünki fiqhdə bir rəyin hüccət olması üçün axtarılan icma ilə imamətdə imamlığın sabit olması üçün etibara alınan icma arasında fərq vardır. Bu fərqi biz Şeyxul-İslam İbn Teymiyyə’nin sözlərindən çıxarırıq, belə ki, o, buyurur:

“وَلَا رَيْبَ أَنَّ الْإِجْمَاعَ الْمُعْتَبَرَ فِي الْإِمَامَةِ لَا يَضُرُّ فِيهِ تَخَلُّفُ الْوَاحِدِ وَالاثْنَيْنِ وَالطَّائِفَةِ الْقَلِيلَةِ فَإِنَّهُ لَوِ اعْتُبِرَ ذَلِكَ لَمْ يَكَدْ يَنْعَقِدُ إِجْمَاعٌ عَلَى إِمَامَةٍ؛ فَإِنَّ الْإِمَامَةَ أَمْرٌ مُعَيَّنٌ فَقَدْ يَتَخَلَّفُ الرَّجُلُ لِهَوًى لَا يُعْلَمُ”

**“Şübhəsiz ki, bir və iki və az sayda qrupun (beyətdən) imtina etməsi imamlıqda nəzərə alınan icmaya zərər vermir, belə ki, əgər bu nəzərə alınsaydı az qala imamlıq üzərində heç zaman icma bağlanmazdı, çünki imamlıq təyin olunan bir vəzifədir və ola bilər ki, kimsə öz şəxsi marağına görə (beyət etməkdən) imtina etsin və bilinməsin.”**[28]

Məlumdur ki, Şeyxul-İslamın nəzərində fiqhi məsələlərdə icmanın hasil olması üçün hamının ittifaqı şərtdir, hətta alimlərin cumhurundan fərqli olaraq İbn Teymiyyə - rahiməhullah – İbn Həzm’in müxalifətini də etibara alır. Burada isə “imamlıqda nəzərə alınan icma” deyərək bu növ icmanı fərqləndirmişdir. Ona görə də “əl-Kuveytiyyə” ensiklopediyasını hazırlayan mütəxəssislər “Muntəhə əl-İradət” və “əl-İqna” kitablarında qeyd edilən “icma” sözünü məzhəbin rəyini təqdim edərkən “əksəriyyət” kimi qeyd ediblər.

Yaxud da deyə bilərik ki, İbnuz-Zəğuni’nin izah etdiyi kimi buradakı hökm əsli hökmdür və əgər icmanın hasil olması imkansızdırsa o zaman cumhurun rəyi

[27] “Kəşşəful-Qina”, 6/119;
[28] 1/535;

kifayət edir. Dolayısıyla da əksər həll və əqd əhlinin razılığı olmadan imamın imamlığı sabit olmaz. Bu, malikilərin və hənbəlilərin bu barədəki görüşlərinin xülasəsidir.

## Muhaqqiq alimlərin rəyləri

Məzhəblərin rəylərini təqdim etdikdən sonra bir də bəzi mütəxəssis alimlərin rəylərini ayrıca qeyd etməyin məsləhətdən olduğunu düşündük. Çünki bu məcəldə əsər yazmış, mövzuları təhrir etmiş, təfsilatlara dalmış alimlər çox olmayıblar. əl-Məvardi'nin "əl-Əhkəmus-Sultaniyyə" və ondan çoxca iqtibas etmiş Əbu Yalə'nin eyni adlı kitabları təfsilatlı kitablar deyildir. Xüsusilə də əl-Məvardi'nin öz zamanında mövcud siyasi vəziyyətdə sərbəst şəkildə təfsilatlı bir kitab yazmasının çətin olduğunu deyirlər. Lakin bu sahədə bizə miras qalmış bəzi əsərlər vardır ki, onların önəmini ixtisas əhli çox gözəl bilir. Bu mirasın başında İməmul-Harameyn Əbul-Məali əl-Cuveyni'nin "Ğiyəsul-Uməmi fi İltiyəsiz-Zuləmi" adlı kitabı durur və bu kitab "əl-Ğiyəsi" adı ilə məşhurlaşıb. Kitab ümumilikdə imamət ilə bağlı mövzulara toxunsa da müəllifin kitabdakı məqsədi daha xüsusidir. O, iki halı fərz etdiyi üçün bu kitabı qələmə almağa qərar verib. Birinci hal ümmətin imamsız qalması halı, ikinci hal isə ümmətə yol göstərəcək, rəhbərlik edəcək irşad əhli, müftilər və alimlərin olmadığı haldır. əl-Cuveyni bu kitabını səlcuqlu dövlətində Sultan Alp Arslan'ın vəziri Nizamul-Mulk üçün yazıb. Bu kitabından öncə ümumi şəkildə İslamın ərkanları və üsulud-din haqqında "əl-Aqidə ən-Nizamiyyə" kitabını onun üçün həsr etmişdi və o kitab "ən-Nizami" adı ilə, bu kitabı isə "əl-Ğiyasi" adı ilə tarixə düşüb. Nizamul-Mülk vəzir olsa da hakimiyyəti əslində o idarə edirdi və Sultar Alp Arslan sadəcə bir fiqur idi. əl-Cuveyni – rahiməhullah – Nizamul-Mülk'ü imamlıq vəzifələrini yerinə yetirən, İslam hövzəsini qoruyan, müsəlmanların hüquqlarını himayə edən, istirqarı sağlayan, kafirlərə və bidət əhlinə qarşı müqavimət göstərən yeganə əmr sahibi kimi görürdü. Ona görə də bu kitabın bizim zamanımızda əvəzsiz bir rolu vardır. Onu da əlavə edək ki, əl-Cuveyni bu kitabında özündən əvvəl "şəri siyasət" haqqında yazılmış kitabları tənqid edib və əl-Məvardi'nin "əl-Əhkəmus-Sultaniyyə" kitabını tənqidində xüsusiləşdirib. Tənqidi isə əsasən kitabda sadəcə görüşlərin müzakirə edilməsi, görüşlərin təfsilatlı müzakirəsinin olmaması ilə bağlıdır.

Mövzu haqqında həmçinin əl-Cuveyni'nin tələbəsi Alləmə Əbu Həmid əl-Ğazzəli də təfsilatlı yazmışdır. Şeyxi əl-Cuveyni qədər bu barədə ayrılıqda geniş bir kitab təlif etməsə də Xəlifə əl-Mustəzhir Billəh üçün yazdığı "Fədaihul-Bətiniyyə" adlı kitabında bu barədə digərlərindən fərqli olaraq təfsilatlara yer vermişdir. Kitabını əl-Ğazzəli özü "əl-Mustəzhiri" adlandırmışdır. Kitab özü ümumilikdə

batini şiələrinə rəddiyyə olaraq təlif edilib. Batinilərin dininin əslini təşkil edən mövzulardan da biri imamlıq mövzusu olduğu üçün Əbu Həmid bunu kitabında ələ almalı olub.

Rəyinə və sözlərinə əhəmiyyət verdiyimiz digər şəxsiyyət isə Şeyxul-İslam İbn Teymiyyə'dir. İbn Teymiyyə "əs-Siyəsə əş-Şər'iyyə" adlı müstəqil bir kitabın müəllifi olsa da orada imamlığın şərtləri, sabit olma yolları və bununla bağlı detallı müzakirələri işləməmişdir. Lakin on iki imam şiələrinin böyüklərindən İbnul-Mutahhir əl-Hilli'nin kitabına cavab yazdığı və "Minhəcus-Sunnə" adlandırdığı kitabında bu bəhslərə yaxından toxunur. Onun üçün o kitabda təqdim etdiyi fikirləri ayıraraq burada qeyd etdik.

## əl-Cuveyni'nin rəyi

Əbul-Məali əl-Cuveyni bu barədə gəlmiş fərqli görüşləri zikr edir. İcmanın şərt olduğunu deyənlərin görüşlərini, daha sonra isə müəyyən sayı şərt görənlərin görüşlərini qeyd edir və ən sonunda da bəzi mütəkəllim alimlərin görüşünü zikr edir və deyir:

“وَأَقْرَبُ الْمَذَاهِبِ مَا ارْتَضَاهُ الْقَاضِي أَبُو بَكْرٍ ، وَهُوَ الْمَنْقُولُ عَنْ شَيْخِنَا أَبِي الْحَسَنِ - رَضِيَ اللَّهُ عَنْهُمَا - وَهُوَ أَنَّ الْإِمَامَةَ تَثْبُتُ بِمُبَايَعَةِ رَجُلٍ وَاحِدٍ مِنْ أَهْلِ الْعَقْدِ”

“**Məzhəblərin (doğruya) ən yaxını əl-Qadi Əbu Bəkr'in seçdiyi görüşdür - və bu, şeyximiz Əbul-Həsən'dən – radiyallahu anhu – nəql olunub – ki, imamət/imamlıq həll və əqd əhlindən bir nəfərin beyət etməsi ilə də sabit olur**.”

əl-Cuveyni bunu qeyd etdikdən sonra nə üçün digər rəylərin batil olduğunu, bu rəyin isə doğru olduğunu qısa şəkildə izah edir:

“وَوَجْهُ هَذَا الْمَذْهَبِ أَنَّهُ تَقَرَّرَ أَنَّ الْإِجْمَاعَ لَيْسَ شَرْطًا فِي عَقْدِ الْإِمَامَةِ ، ثُمَّ لَمْ يَثْبُتْ تَوْقِيفٌ فِي عَدَدٍ مَخْصُوصٍ . وَالْعُقُودُ فِي الشَّرْعِ مَوْلَاهَا عَاقِدٌ وَاحِدٌ ، وَإِذَا تَعَدَّى الْمُتَعَدِّي الْوَاحِدَ ، فَلَيْسَ عَدَدٌ أَوْلَى مِنْ عَدَدٍ ، وَلَا وَجْهَ لِلتَّحَكُّمِ فِي إِثْبَاتِ عَدَدٍ مَخْصُوصٍ ، فَإِذَا لَمْ يَقُمْ دَلِيلٌ عَلَى عَدَدٍ لَمْ يَثْبُتِ الْعَدَدُ ، وَقَدْ تَحَقَّقْنَا أَنَّ الْإِجْمَاعَ لَيْسَ شَرْطًا ، فَانْتَفَى الْإِجْمَاعُ بِالْإِجْمَاعِ ، وَبَطَلَ الْعَدَدُ بِانْعِدَامِ الدَّلِيلِ عَلَيْهِ ، فَلَزِمَ الْمَصِيرُ إِلَى الِاكْتِفَاءِ بِعَقْدِ الْوَاحِدِ”

“**Bu məzhəbin izahı budur ki, daha əvvəl isbat edildi ki, (həll və əqd əhlinin) icma(sı) imamlıq əqdində şərt deyildir, sonra xüsusi bir say haqqında da şəriətdə bir dəlil gəlməyib və şəriətdə əqdi yerinə yetirən bir nəfər olur. Kim bir sayını aşıb keçərsə saylardan birinin digərindən üstünlüyü yoxdur, xüsusi bir sayı isbat etmək üçün mənasız əziyyətə qatlanmağın da bir yeri yoxdur. Beləliklə də hansısa saya dair dəlil yoxdursa say isbat olunmamış sayılır və əmin olduq ki, icma da şərt deyildir.**

**Beləliklə də icma (şərti) icma ilə aradan qaldırıldı, dəlilin olmaması səbəbi ilə də say (şərti) batil oldu və dolayısıyla da bir nəfərin əqdi ilə kifayətlənmək rəyini götürmək vacib olur.**”

əl-Cuveyni’nin burada izah etmək istədiyi budur ki, həll və əqd əhlinin icmasını şərt görənlərin məzhəbi batil oldu, çünki bunun batil olduğuna dəlalət edən elə icmanın özüdür və çünki bu xəlifə seçimini imkansız edir. Daha sonra əl-Cuveyni müəyyən bir sayı xüsusiləşdirməyin də dəlilinin olmadığını vurğulayır və ona görə geridə yalnız bir görüş qalır, o da ən az sayı qeyd edən görüşdür, yəni bir nəfərin əqdi bağlaması da bu görüşə görə kifayət edir.

İşin maraqlı tərəfi bundan sonra gəlir, belə ki, əl-Cuveyni daha sonra məsələ haqqında öz nəzərini izah edir və bu görüşün arxasında duran mənanı, baxış açısını bizə çatdırır. Deyir:

“وَهَا أَنَا الْآنَ أَذْكُرُ مَا يَلُوحُ عِنْدِي فِي هَذَا الْفَصْلِ ، وَفِيهِ ذِكْرُ كَلَامٍ يَنْعَطِفُ عَلَى الْفَصْلِ الْأَوَّلِ ، فَأَقُولُ : - الَّذِي أَرَاهُ أَنَّ أَبَا بَكْرٍ لَمَّا بَايَعَهُ عُمَرُ لَوْ ثَارَ ثَائِرُونَ ، وَأَبْدَوْا صَفْحَةَ الْخِلَافِ ، وَلَمْ يَرْضَوْا تِلْكَ الْبَيْعَةَ ، لَمَا كُنْتُ أَجِدُ مُتَعَلَّقًا فِي أَنَّ الْإِمَامَةَ كَانَتْ تَسْتَقِلُّ بِبَيْعَةِ وَاحِدٍ ، وَكَذَلِكَ لَوْ فَرَضْتُ بَيْعَةَ اثْنَيْنِ أَوْ أَرْبَعَةٍ فَصَاعِدًا ، وَقَدَّرْتُ ثَوَرَانَ مُخَالِفِينَ ، لَمَا وَجَدْتُ مُتَمَسَّكًا بِهِ اكْتِرَاثٌ وَاحْتِفَالٌ ، فِي قَاعِدَةِ الْإِمَامَةِ . وَلَكِنْ لَمَّا بَايَعَ عُمَرُ تَتَابَعَتِ الْأَيْدِي ، وَاصْطَفَقَتِ الْأَكُفُّ ، وَاتَّسَعَتِ الطَّاعَةُ ، وَانْقَادَتِ الْجَمَاعَةُ”

“**Mən indi bu fəsildə mənim nəzərimdə görünəni zikr edəcəm və burada birinci fəslə qayıdan bir söhbət vardır:Mənim rəyim budur ki, Əbu Bəkrə Ömər beyət etdikdə üsyan edənlər üsyan etsəydilər, ixtilaflarını üzə vursaydılar, o beyətdən razı olmasaydılar mən imamlığın bir nəfərin belə beyəti ilə qurulması(nı söyləməm) üçün əsaslanacağım bir şey tapa bilməzdim. Eyni şəkildə əgər iki nəfərin və ya dördünün və ya daha çoxunun beyət etdiyi fərz edilsəydi və müxaliflərin üsyan etməsi fərz edilsəydi, imamlıq qaydası ilə bağlı əsaslana biləcəyim bir şey tapa bilməzdim ki, onda əhəmiyyət olsun, könül sevindirsin. Lakin Ömər beyət etdikdə arxasınca digər (beyət) əllər(i) də uzandı, ovuclar sıxıldı, itaət genişləndi və camaat boyun əydi.**”

əl-Cuveyni’nin bu sözləri məsələnin özəyini, yəni ən əsas hissəsini təşkil edir və bu hissəni anlamaq çox önəmlidir. Beləliklə də bəzi mütəkəllimlər bir nəfərin belə beyəti ilə imamlıq əqdinin qüvvəyə minə biləcəyini dedikdə hər bir halı qəsd etmirlər, bununla xüsusi halı qəsd edirlər. Bunun üçün Ömərin Əbu Bəkrə etdiyi beyəti misal göstərirlər. Ömərin beyətinə həll və əqd əhlinin və kütlələrin

əksəriyyəti müvafiq olduğu üçün, camaat Ömərin qərarına tabe olduğu üçün və heç bir ixtilaf, fitnə çıxmadığı üçün bu halda bir nəfərin beyəti ilə imamlıq əqdinin qüvvəyə mindiyini deyirlər. Bu görüşdə olanların qəsdi budur. Ona görə də əl-Cuveyni sözünün davamında buyurur:

“فَالْوَجْهُ عِنْدِي فِي ذَلِكَ أَنْ يُعْتَبَرَ فِي الْبَيْعَةِ حُصُولُ مَبْلَغٍ مِنَ الْأَتْبَاعِ وَالْأَنْصَارِ وَالْأَشْيَاعِ ، تَحْصُلُ بِهِمْ شَوْكَةٌ ظَاهِرَةٌ ، وَمَنْعَةٌ قَاهِرَةٌ ، بِحَيْثُ لَوْ فُرِضَ ثَوَرَانُ خِلَافٍ ، لَمَا غَلَبَ عَلَى الظَّنِّ أَنْ يُصْطَلَمَ أَتْبَاعُ الْإِمَامِ ، فَإِذَا تَأَكَّدَتِ الْبَيْعَةُ ، وَتَأَطَّدَتْ بِالشَّوْكَةِ وَالْعَدَدِ وَالْعُدَدِ ، وَاعْتَضَدَتْ ، وَتَأَيَّدَتْ بِالْمُنَّةِ ، وَاسْتَظْهَرَتْ بِأَسْبَابِ الِاسْتِيلَاءِ وَالِاسْتِعْلَاءِ ، فَإِذْ ذَاكَ تَثْبُتُ الْإِمَامَةُ ، وَتَسْتَقِرُّ ، وَتَتَأَكَّدُ الْوِلَايَةُ وَتَسْتَمِرُّ ، وَلَمَّا بَايَعَ عُمَرُ مَالَتِ النُّفُوسُ إِلَى الْمُطَابَقَةِ وَالْمُوَافَقَةِ ، وَلَمْ يُبْدِ أَحَدٌ شِرَاسًا وَشِمَاسًا ، وَتَظَافَرُوا عَلَى بَذْلِ الطَّاعَةِ عَلَى حَسَبِ الِاسْتِطَاعَةِ ، وَبِتَعَيُّنِ اعْتِبَارِ مَا ذَكَرْتُهُ بِأَنِّي سَأُوَضِّحُ فِي بَعْضِ الْأَبْوَابِ الْآتِيَةِ أَنَّ الشَّوْكَةَ لَا بُدَّ مِنْ رِعَايَتِهَا”

“**Bu məsələdəən əsas olan mənim nəzərimdə budur; beyətdə tabe olanlardan, dəstəkçilərdən və tərəfdarlardan elə bir məbləğin hasil olması etibara alınmalıdır ki, onlarla (yeni imam üçün) aşkar bir qüdrət, üstün bir hegemonluq ortaya çıxır, o dərəcədə ki, əgər ortada bir müxalifət üsyanı fərz edilərsə (bunun nəticəsində) imama tabe olanların məğlub edilməsi barədə adamda ciddi bir güman olmaz. Beləliklə də əgər beyət möhkəmlənərsə, qüvvət, (dəstəkçilərin) say(ları) və hazırlıqlar ilə dəstəklənərsə və güc ilə qüvvətlənərsə, istila səbəbləri ilə üstünlük əldə edilərsə bax bu zaman imamlıq sabit olur, istiqrar tapır, vilayət təsdiqlənir və davamlı olur. Ömər beyət etdikdə insanların nəfsləri (bu beyətlə) razılaşmağa, ona müvafiq olmağa meyl etdi və heç kim narazılıq, etiraz və imtina göstərmədi, hamı imkan daxilində itaət göstərməkdə bir araya gəldilər. Mənim qarşıda gələn bablarda izah edəcəyimə dair söylədiyimi etibara almaq qaçınılmazdır ki, şövkət mütləq nəzərə alınmalıdır.**”

Beləliklə də buradakı açar məfhum, ən önəmli qavram şövkət qavramıdır. əl-Cuveyni qeyd edir ki, hətta əgər bir nəfərin beyəti ilə belə imam üçün qüdrət və hegemonluq (الْمَنْعَةُ) hasil olarsa o zaman bununla imamlıq hasil olur. Burada şövkət ilə qəsd etdiyi həmin beyət edənin dəstəkçilərinin, tabe olanlarının, tərəfdarlarının çoxluğudur və həmçinin onların hazırlıqları və digər maddi və hərbi qüvvələrdir. Sadəcə silahlı dəstənin olması kifayət etmir, lakin dəstəkçilərin, tərəfdarların çoxluğu tələb olunur. Bunsuz tək bir nəfərin beyətinin heç bir təsiri olmaz. Bu mənanı təsdiq edərək əl-Cuveyni sözlərinin davamında deyir:

“وممَّا يُؤَكِّدُ ذَلكَ اتِّفَاقُ الْعُلَمَاء قَاطبَةً ، عَلَى أَنَّ رَجُلًا منْ أَهْلِ الْحَلِّ وَالْعَقْد ، لَو اسْتَخْلَى بِمَنْ صَلُحَ لِلْإِمَامَةِ ، وَعَقَدَ لَهُ الْبَيْعَةَ لَمْ تَثْبُتِ الْإِمَامَةُ . وَسَنَذْكُرُ ذَلِكَ فِي مُخْتَتَمِ هَذَا الْفَصْلِ .

وَسَبَبُ تَعَلُّقِي بِذَلكَ أَنَّ مثْلَ هَذَا لَوْ قُدِّرَ لَمْ تَسْتَتِبَّ منْهُ شَوْكَةٌ ، وَلَمْ تَثْبُتْ بِهِ سَلْطَنَةٌ ، فَلَئِنْ كُنَّا نَتَّبِعُ مَا جَرَى ، فَقَدْ كَانَت الْبَيْعَةُ عَلَى هَذِهِ الْقَضِيَّةِ الَّتِي وَصَفْتُهَا ، وَظَهَرَ اعْتِبَارُ حُصُولِ الشَّوْكَةِ ; فَلْيُتَّبَعْ ذَلِكَ”

**“Bunu dəstəkləyən budur ki, alimlərin hamısı ittifaq ediblər ki, həll və əqd əhlindən bir nəfər imamlıq üçün yararlı olan biri ilə təklikdə qalarsa və onun üçün beyət əqdini bağlayarsa imamlıq sabit olmaz və biz bunu bu fəslin sonunda zikr edəcəyik. Mənim bu nöqtə üzərində durmağımınsəbəbi budur ki, əgər belə bir hal fərz edilərsə bundan şövkət (qüdrət, güc) ortaya çıxmaz, bununla səltənət sabit olmaz. Əgər (keçmişdə) baş verənləri nəzərdən keçirsək beyət mənim vəsf etdiyim bu hökm üzərində olacaq və şövkətin/qüdrətin hasil olmasının etibara alındığı aşkarca görünəcək. Bu nöqtə nəzərə alınmalıdır.”**

Bu sözləri ilə İməmul-Harameyn bizim anladığımız mənanı təsdiq etmiş olur, yəni etibar beyət edən həll və əqd əhlinin sayında deyildir, beyətdən ortaya çıxan nəticədədir. Əgər beyət ilə imama böyük bir dəstək, güc hasil olmursa istər bir nəfər, istərsə də bir neçə nəfər beyət etsin imamlıq bununla sabit olmaz. Davamında bu böyük alim buyurur:

“ثُمَّ أَقُولُ : إِنْ بَايَعَ رَجُلٌ وَاحدٌ مَرْمُوقٌ ، كَثِيرُ الْأَتْبَاعِ وَالْأَشْيَاعِ ، مُطَاعٌ فِي قَوْمه ، وَكَانَتْ مَنْعَتُهُ تُفِيدُ مَا أَشَرْنَا إِلَيْه ، انْعَقَدَت الْإِمَامَةُ . وَقَدْ يُبَايِعُ رِجَالٌ لَا تُفِيدُ مُبَايَعَتُهُمْ شَوْكَةً وَمُنَّةً قَهْرِيَّةً ، فَلَسْتُ أَرَى لِلْإِمَامَةِ اسْتِقْرَارًا”

**“Sonra deyirəm: əgər tabeçiləri və tərəfdarları çox olan, öz qövmündə itaət olunan yüksək statuslu bir kişi beyət edərsə və onun qüdrəti bizim işarə etdiyimiz hala uyğun olarsa imamlıq qüvvəyə minər. Bəzən çox sayda kişi beyət edir və beyətləri heç bir şövkət/qüdrət və qəhr edici gücü qarşılamır, bu halda imamlığın istiqrar tapdığını görmürəm.”**

Bu hissədə də bizim üçün önəmli olan məqama toxunur. Daha öncə İməmul-Harameyn nəzərində tutduğu şövkət, qüdrət, güc üçün ümumi bir vəsf təqdim etmişdi. Bu isə tərəfdarların, tabe olanların o dərəcə çox, maddi və hərbi gücün o qədər böyük olması halıdır ki, burada müxalif ola biləcək tərəfin güc gəlməsi güman edilməsin və imamlıq təhlükə altına düşməsin, yalnız bu zaman imamlıq istiqrar tapar və sabit olar. Burada “...**onun qüdrəti bizim işarə etdiyimiz hala**

**uyğun olarsa...**” cümləsindən bu mənanı başa düşürük, yoxsa hər bir güc, qüdrət bu tələbə cavab verməz. Mücərrəd olaraq silahlı dəstələrinin çoxluğu və aylarla sürən silahlı mücadilə nəticəsində bəzi yerləri istila etmək tələb olunan qüdrətin yerini vermir, çünki bu, ümmətin ən məhdud coğrafiyasında belə lazım olan hakimiyyəti əldə etmək üçün kifayət etmir. əl-Cuveyni’nin indi qeyd edəcəyimiz son cümləsi bu dediyimizin nöqtəsini qoyur:

“وَالَّذِي أَجَزْتُهُ لَيْسَ شَرْطَ إِجْمَاعٍ ، وَلَا احْتِكَامًا بِعَدَدٍ ، وَلَا قَطْعًا بِأَنَّ بَيْعَةَ الْوَاحِدِ كَافِيَةٌ. وَإِنَّمَا اضْطَرَبَتِ الْمَذَاهِبُ فِي ذَلِكَ لِوُقُوعِ الْبَيْعَةِ لِأَبِي بَكْرٍ مُبْهَمَةً مِنْ غَيْرِ اخْتِصَاصٍ بِعَدَدٍ ، وَلَمْ يَتَّجِهْ إِحَالَةُ إِنْبِرَامِ الْعَقْدِ عَلَى بَيْعَةِ وَاحِدٍ ; فَتَفَرَّقَتِ الطُّرُقُ ، وَأَغْوَصَ مَسْلَكُ الْحَقِّ عَلَى مُعْظَمِ النَّاظِرِينَ فِي الْبَابِ .

وَالَّذِي ذَكَرْتُهُ يَنْطَبِقُ عَلَى مَقْصِدِ الْإِمَامَةِ وَسِرِّهَا ، فَإِنَّ الْغَرَضَ حُصُولُ الطَّاعَةِ ، وَهُوَ مُوَافِقٌ لِلْإِبْهَامِ الَّذِي جَرَى فِي الْبَيْعَةِ”

> “**Mənim keçərli saydığım icma şərti deyildir, nə də müəyyən bir sayla məhdudlaşmaqdır, nə də bir nəfərin beyətinin kifayət etdiyini qəti olaraq söyləməkdir. Məzhəblər ona görə (burada) qarışıqlığa düşüblər ki, çünki Əbu Bəkrə beyət hər hansı bir say xüsusiləşdirilmədən, mübhəm olaraq baş vermişdir. Əqdin bağlanmasını da bir nəfərin beyətinə təslim etmək bir şeyə əsaslanmır, buna görə də fikirlər fərqlənmişdir və haqq məslək bu mövzuda fikir yürüdənlərin çoxuna qaranlıq qalmışdır.**
>
> **Mənim bu zikr etdiyim isə imamlığın məqsədinə və sirrinə uyğundur, belə ki, (imamlıqda) məqsəd itaətin hasil olmasıdır və bu, (Əbu Bəkrə) beyətdə baş vermiş mübhəmliyə/qeyri-müəyyənliyə müvafiqdir.**”[29]

İmamlığın məqsədi nədir? İtaətin hasil olmasıdır. Başqa sözlə itaətin hasil olmasını sağlamağı bacarmayan şövkət və qüdrət etibara alınmaz, etibara alınan bu itaəti təmin edən güc və qüvvətdir. Bu isə mücərrəd olaraq silah ilə deyil, həm də tabe olanların və dəstək verənlərin çoxluğu ilədir. Əgər müəyyən miqdarda hərbi gücün varsa, lakin lazım olan tərəfdarlara və dəstək verənlərə sahib deyilsənsə və imamlıq əqdini qoruya biləcək hərbi gücə sahib deyilsənsə bununla imamlıq əqdi qüvvəyə minməz. Ona görə də bütün alimlər bu məsələ üzərində danışdıqda Ömərin Əbu Bəkrə beyət etməsi üzərində danışırlar, ixtilafın hasil olması da - əl-Cuveyni’nin dediyi kimi – bu beyəti anlamaqda fərqlənmək səbəbilədir. Bizə də məlumdur ki, Əbu Bəkrin imam seçilməsi sadəcə olaraq Ömərin beyət etməsi ilə baş vermədi, əgər digər səhabələr və ümmətin

---

[29]“Ğiyəsul-Uməmi fi İltiyəs əz-Zuləmi”, səh: 69-72; Doktor Abdulazim əd-Dib’in təhqiqi, ikinci nəşr: hicri 1401; Həmçinin bax: Darul-Minhəc nəşri: səh: 249-251; birinci nəşr: 1432/2011;

əksəriyyəti Əbu Bəkrin imamlığını qəbul etməsəydi onun imamlığı səhih olmayacaqdı. Kim bunun əksini iddia edirsə o, bu nöqtədə rafizilərin iddiaları ilə razılaşmalı olacaq, çünki rafizilər də iddia edirlər ki, Əbu Bəkr imamlığı qəsb yolu ilə əldə etmişdir.

Burada digər bir nöqtəyə də toxunmalıyıq. əl-Cuveyni bu məsələdə görüşləri müzakirə edərkən hənbəlilərin görüşünə toxunmur və onların görüşlərinin doğru və ya xəta olması haqqında danışmır. Hənbəlilərin görüşü isə budur ki, həll və əqd əhlinin əksəriyyətinin razılaşması şərtdir. Bununla bağlı Əbul-Məhasin qardaşımızın düşdüyü bir xətaya diqqət çəkmək istəyirəm. O, "cumhur" görüşünü rədd etmək üçün bəzi nəqllər zikr edir, onların arasında bu nəqli də qeyd edir:

> "**Cuveyni demişdir:**
>
> فإذا لم يقم دليل على عدد؛ لم يثبت العدد فضلا انه لم يشترط الاجماع او الاغلبيه من اهل الحل و العقد بل كل ما يلزم هو قيام الشوكة بهم اى اهل الحل و العقد المبايعين."
>
> **"Müəyyən say üçün dəlil olmayacağı zaman say məsələsi sabit olmayacaq. Həll və əqd əhlinin icması yaxud çoxluğunun şərt olması barədə isə söhbət gedə bilməz. Əksinə gərəkli olan amil onların, yəni beyət edən həll və əqd əhlinin vasitəsilə şövkətin hasil olmasıdır."**

Gördüyümüz kimi bu şəkildə ərəbcə mətni yazmış və davamında onun tərcüməsini təqdim etmişdir. Lakin əl-Cuveyni'nin kitabında bu şəkildə cümlə yoxdur, bu, təhrif olunmuş cümlədir. Qeyd etdiyim kimi əl-Cuveyni həll və əqd əhlinin cumhurunun beyətini şərt görənləri rədd etmir, ümumiyyətlə bu barədə danışmır. əl-Cuveyni'yə nisbət olunan bu sözləri məqalənin müəllifinin təqdim etdiyi şəkildə ərəb dilində yalnız Bağdadinin camaatını dəstəkləyən bəzi səhifələrdə tapa bildim, lakin kitabın Doktor Abdulazim əd-Dib – rahiməhullah – tərəfindən təhqiqində və "Darud-Də'va" tərəfinfən nəşr olunmuş təhqiqində tapa bilmədim. Bunun əslində təhrif olunmuş bir sitat olduğuna inanmağımızın səbəbi budur ki, məqalədə bu sözlərin yeri olaraq 70-ci səhifə göstərilir və həqiqətən də "Məktəbətul-İməmil-Harameyn" tərəfindən nəşr olunmuş çapda 70-ci səhifədə buna yaxın bir sitat yer alır və sitat eyni tərzdə başlayır, lakin orada "əksəriyyət" haqqında bir söz deyilmir. Biz yuxarıda o hissəni oxuculara təqdim etdik və həmin yeri bir daha burada qeyd edirik:

"فَإِذَا لَمْ يَقُمْ دَلِيلٌ عَلَى عَدَد لَمْ يَثْبُت الْعَدَدُ ، وَقَدْ تَحَقَّقْنَا أَنَّ الْإِجْمَاعَ لَيْسَ شَرْطًا ، فَانْتَفَى الْإِجْمَاعُ بِالْإِجْمَاعِ ، وَبَطَلَ الْعَدَدُ بِانْعِدَامِ الدَّلِيلِ عَلَيْه ، فَلَزِمَ الْمَصِيرُ إِلَى الِاكْتِفَاءِ بِعَقْدِ الْوَاحِدِ"

> “**Beləliklə də hansısa saya dair dəlil yoxdursa say isbat olunmamış sayılır və əmin olduq ki, icma da şərt deyildir. Beləliklə də icma (şərti) icma ilə aradan qaldırıldı, dəlilin olmaması səbəbi ilə də say (şərti) batil oldu və dolayısıyla da bir nəfərin əqdi ilə kifayətlənmək rəyini götürmək vacib olur.**”

Beləliklə də əmin oluruq ki, Əbul-Məhasin qardaşımız əslində əl-Cuveyni’nin kitabını özü oxumayıb və özü araşdırmayıb, lakin internetdəki səhifələrdən birindən bunu götürüb. Burada əl-Cuveyni qətiyyən hənbəlilərin görüşünü rədd etməmişdir. Əlavə etməliyik ki, biz əl-Cuveyni’nin hənbəlilərə müvafiq olmadığını anlayırıq, amma burada məqam elmi əmanətə vəfalı olmaqla bağlıdır. əl-Cuveyni icmanı şərt görənlərin rəyini batil sayır və rədd edir. Lakin hənbəlilər əl-Cuveyni’nin rədd etdiyi icma şərtini demirlər, onların görüşləri yuxarıda izah etdiyimiz kimi fərqlidir. Dolayısıyla da əl-Cuveyni sözlərində “əksəriyyətin beyətini” şərt görənlərin məzhəbini hansısa hüccətə əsaslanaraq rədd etməmişdir.

## əl-Ğazəli’nin rəyi

İməmul-Harameyn əl-Cuveyni’nin bu məsələdəki görüşün təhrir etdikdən sonra tələbəsi Əbu Həmid əl-Ğazəli’nin bu mövzu ilə bağlı dediklərinə nəzər salaq və onun rəyini araşdıraq, çünki Əbul-Məhasin qardaşımızın sitat gətirdiyi və görüşlərinə əsaslandığı alimlərdən biri də əl-Ğazəli’dir. Əbu Həmid əl-Ğazəli “Fədaihul-Bətiniyyə” kitabında batinilərin imamət inancını rədd etdikdə ümumən imamlıq haqqında bizi maraqlandıran çox önəmli və faydalı məlumatlara yer vermişdir. əl-Ğazəli də müəllimi əl-Cuveyni kimi “şövkət” və “qüdrət” anlayışını tərədfarların, tabe olanların, dəstək verənlərin çoxluğu ilə ölçür və batinilərin imamına dəstək verənlərin azlığına işarə edərək deyir:

“أنّا نُسَلّم جدلا - على سبيل التبرع والتقرير لمورد هذا السؤال - أن صاحب الباطنية صالح للْإِمَامَة بِصَفَاء الإعتقاد وصحّة الدِّين وحُصول سَائِر الشُّرُوط فمسلك الترجيح غير مُنْحسم فإن الإمامة التي ندعيها أجمع عليها أئمة العصر وعلماء الدهر بل جماهير الخلق وأقاليم الأرض في أقصى المشرق وفي أقصى المغرب حتى تطوق الطاعة له والإنقيادلأمره كل من على بسيط الأرض إلا شرذمة الباطنية ولو جمع قضّهم وقضيضهم وصغيرهم وكبيرهم لم يبلغ عددهم عدد أهل بلدة واحدة من متبعي الإمامة العباسية فكيف اذا قيسوا بأهل ناحية أو بأهل إقليم أو بكافة من على وجه الأرض من منتحلى الإمام أفيتمارى المُنصف في أن الغلاة من الباطنية على أهل الحق لو جمع منهم الصغير والكبير لم يبلغ عشر العشير من ناصري هذه الدولة القاهرة ومتبعى هذه العصابة المحقة وإذا كانت الإمامة تقوم بالشوكة وانما تقوى الشوكة بالمظاهرة والمناصرة والكثرة في الأتباع والأشياع وتناصر اهل الاتفاق والاجتماع فهذا اقوى مسلك من مسالك الترجيح”

**“Biz arqument xatirinə - güzəşt olaraq və bu sualın varid olmasını təsdiq edərək – qəbul edirik ki, batinilərin böyüyü etiqadının saflığı, dininin doğruluğu və sair şərtlərin hasil olması ilə imamlığa yararlıdır. Belə olduqda tərcih etmək yolu həll edici deyildir, çünki bizim iddia etdiyimiz imamlıq üzərində əsrin imamları, zamanın alimləri, hətta insanların, ən uzaq şərqdən tutmuş ən uzaq qərbə qədər yer üzünün ölkələrinin böyük**

**əksəriyyəti icma ediblər, hətta ona itaət və əmrinə boyun əymək üçün batinilərin kiçik camaatından savayı yer üzünün bütün insanları ətrafında toplanıblar. (Batinilərə gəldikdə isə) əgər onların hamısını, böyüyünü də, kiçiyini də bir araya toplasan sayları abbasi imamətinə tabe olanlara aid şəhərlərdən birinin əhalisinin sayına belə çatmaz. O zaman İmama tabe olanlardan bir əyalətin əhli və ya bir iqlimin əhli və ya yer üzündəkilərinin hamısı ilə müqayisə edilsə necə?! Məgər insaf sahibi şübhə edirmi ki, batinilərdən aşırıların kiçikləri və böyükləri bir araya gətirilsələr (sayları) bu güclü dövləti dəstəkləyənlərin, haqlı isabətə/camaata tabe olanların yüzdə birinə çatmaz?! Əgər imamlıq şövkət/qüdrət ilə qurulursa və şövkət yalnız və yalnız dəstək və təyid ilə, tabe olanların və tərəfdarların çoxluğu, ittifaq və ictima əhlinin bir-birinə dəstəyi ilə qüvvətlənir, o zaman bu, tərcih məsləkləri arasında ən güclü olan məsləkdir.**”[30]

Beləliklə də şövkət nə ilə hasil olur? Nə ilə güc qazanır? əl-Ğazəli’nin də ifadə etdiyi kimi tabe olanların, dəstək verənlərin, tərəfdarların çoxluğu ilə, müxtəlif tərəflərdən gələn dəstək və munəsara ilə şövkət, qüdrət formalaşır. əl-Ğazəli bu fikrini sonra daha aydın sözlərlə ifadə edir:

“قُلْنَا نعم لَا ماخذ للامامة الا النَّص اَوْ الاخْتيَار وَنحن نقُول مهما بَطل النَّص ثَبت الاخْتيَار وَقَوْلهمْ ان الاخْتيَار بَاطل لأنه لايمكن اعْتبَار كَافَّة الْخلق وَلَا الاكْتفَاء بِوَاحد وَلَا التحكم بتَقْدير عدد معين بَين الْوَاحد وَالْكل فَهَذَا جهل بمذهبنا الَّذي نختاره وَنُقيم الْبُرْهَان على صحَّته وَالَّذي نختاره انه يَكْتَفِي بشخص وَاحد يعْقد الْبيعَة للامام مهما كَانَ ذَلِك الْوَاحد مُطَاعًا ذَا شَوْكَة لَا تطال وَمهما كَانَ مَال الى جَانب مَال بِسَبَبه الجماهير وَلم يُخَالفهُ الا من لَا يكرث بمخالفته فالشخص الْوَاحد الْمَتْبُوع المطاع الْمَوْصُوف بِهَذِه الصّفة اذا بَايع كفى اذ فِي مُوَافَقَته الجماهير فان لم يحصل هَذَا الْغَرَض الا لشخصين اَوْ ثَلَاثَة فلابد من اتِّفَاقهم وَلَيْسَ الْمَقْصُود اعيان الْمُبَايِعين وانما الْغَرَض قيام شَوْكَة الإمام بالأتباع والأشياع وَذَلِك يحصل بِكُل مستول مُطَاع وَنحن نقُول لما بَايع عمر ابا بكر رِضى الله عَنْهُمَا انْعَقَدت الامامة لَهُ بِمُجَرّد بيعَته وَلَكِن لتتابع الايدي الى الْبيعَة بِسَبَب مبادرته وَلَو لم يبايعه غير عمر وبقى كَافَّة الْخلق مخالفين اَوْ انقسموا انقساما متكافئا لَا يتَمَيَّز فيه غَالب عَن مغلوب لما انْعَقَدت الامامة فان شَرط ابْتدَاء الانْعقَاد قيام الشَّوْكَة وانصراف الْقُلُوب الى المشايعة ومطابقة البواطن والظواهر على الْمُبَايعَة فان الْمَقْصُود الَّذي طلبنا لَهُ الامام جمع شتات الاراء فِي مصطدم تعَارض الاهواء وَلَا تتفق الارادات المتنافضة والشهوات المتباينة المتنافرة على مُتَابعَة راى وَاحِد الا اذا ظَهرت شوكته وعظمت نجدته

[30]“Fədaihul-Bətiniyyə”, səh: 173-174;

وترسخت فِي النُّفُوس رهبته ومهابته ومدار جَميع ذَلك على الشَّوْكَة وَلَا تقوم الشَّوْكَة الا بموافقة الاكثرين من معتبري كل زمَان"

**"Deyirik: Bəli! İmamlıq nassdan və ya ixtiyardan/seçimdən başqa yol ilə olmur və biz deyirik: Nass batil olduğu üçün ixtiyar/seçim (yolu) sabit olur. Onların "ixtiyar/seçim (yolu) batildir, çünki insanların hamısını(n fikrini) etibara almaq və bir nəfər ilə kifayətlənmək, nə də bir ilə hamısı arasında müəyyən bir ədədi təqdir etməklə dəqiqləşmək mümkün deyildir" sözlərinə gəldikdə isə bu, bizim götürdüyümüz və doğruluğunu qəti dəlil ilə isbat etdiyimiz məzhəbimiz haqqında cahil olmaqdan irəli gəlir. Bizim rəyimiz budur ki, bir nəfərin - əgər bu bir nəfər itaət olunan, əzilməz qüdrətə sahib olan biridirsə və bir tərəfə meyl etdikdə müxalif olmaqlarına əhəmiyyət verilməyən kəslər istisna olmaqla (insanların) böyük əksəriyyəti (onun meyl etdiyi tərəfə) meyl edirsə - beyət əqdini imam üçün bağlaması kifayətdir.Beləliklə də tabe olunan, itaət olunan və bu özəlliklə vəsf olunmuş bir şəxs əgər beyət edərsə kifayət edər, çünki onun (imama) müvafiq olması (insanların) böyük əksəriyyətinin müvafiq olması anlamına gəlir. Əgər bu qəsd olunan hal yalnız iki nəfər və ya üç nəfər üçün hasil olubsa o zaman onların ittifaq halında olmaqları labüddür. Məqsəd beyət edənlərin özləri deyildir, burada yeganə məqsəd tabe olanlar(ın) və tərəfdarlar(ın çoxluğu) ilə imamın qüdrətinin əmələ gəlməsidir və bu, hökmran olan, itaət olunan hər kəs üçün hasil olur. Biz deyirik: Ömər Əbu Bəkrə - Allah hər ikisindən də razı olsun! – beyət etdikdə imamlıq onun üçün mücərrəd olaraq (Ömərin) beyətinə görə qüvvəyə minmədi, lakin onun təşəbbüsü səbəbi ilə əllərin bir-birinin ardınca beyət üçün uzadılması ilə (qüvvəyə mindi) və əgər Ömərdən başqa heç kim beyət etməsəydi, xalqın hamısı müxalif olsaydı və ya qalib olanın məğlubdan seçilməyəcəyi şəkildə bərabər hissələrə ayrılsalardı imamlıq (əqdi) qüvvəyə minməzdi. Çünki qüvvəyə minməyə başlamasının şərti qüdrətin əmələ gəlməsi, qəlblərin tərəf tutmağa yönəlməsi və beyət verməkdə batinlərin və zahirlərin bir-birinə uyğunlaşmasıdır. Çünki imamı(n seçilməsini) tələb etməyimizdəki məqsəd şəxsi istəklərdəki ziddiyyətin toqquşduğu bir vəziyyətdə parçalanmış rəyləri bir araya gətirməkdir və ziddiyyətli iradələr, bir-birindən uzaq olan, bir-birini rədd edən nəfsi istəklər yalnız imamın qüdrəti aşkarca üzə çıxdıqda, şiddəti gücləndikdə, qorxusu qəlblərdə oturuşduqda bir rəyə tabe olmaqda ittifaq halına gələ bilər. Bunların hamısı isə qüdrətdən asılıdır və qüdrət yalnız hər bir**

**zamanın etibarlı şəxslərinin əksəriyyətinin müvafiq olması ilə əmələ gəlir.**”[31]

əl-Ğazəli bu sözləri ilə aşkar bir tərzdə bildirir ki, şövkət yalnız ümmətin əksəriyyətinin tabe olması ilə hasil olur və ümmətin əksəriyyəti isə hər bir zamanın mötəbər şəxslərinin əksəriyyətinin razılığına tabe olur. Əgər ümmətin əksəriyyətinin tabe olduğu sözü keçən bir nəfər varsa o zaman onun beyət etməsi ilə də imam, yəni xəlifə seçilə bilər. Ona görə də əl-Ğazəli bu kitabını yazanda hakimiyyətdə olan abbasi xəlifəsi Əhməd əl-Mustəzhir Billəh'in şövkətini, qüdrətini vəsf edərək deyir:

“فاذا بَان أن هَذَا مَأخَذ الْإمَامَة فَلَيْس يتمارى فِي أَن الْجهَة الشَّرِيفَة الَّتِى ننصرها قد صرف الله وُجُوه كَافَّة الْخلق اليها وجبل قُلُوبهم على حبها وَلذَلِك قَامَت الشَّوْكَة لَهُ فِي اقطار الارض”

“**İmamlığın əsasının bu olduğu aydın olarsa o zaman heç kim mübahisə etməz ki, Allah insanların hamısının üzünü bizim dəstək verdiyimiz şərəfli cihətə tərəf çevirib və onların qəlblərini onu sevmək üzərinə formalaşdırıb. Buna görə də yer üzünün (fərqli) ölkələrində onun üçün şövkət/qüdrət əmələ gəlib...**”[32]

əl-Ğazəli bu kitabında təqrir etdiyi rəyi başqa kitablarında da təsdiqləmişdir. Misal üçün məşhur “İhyə Ulumid-Din” kitabında deyir:

“الأصل التاسع أن شرائط الإمامة بعد الإسلام والتكليف خمسة الذكورة والورع والعلم والكفاية ونسبة قريش لقوله صلى الله عليه وسلم الأئمة من قريش وإذا اجتمع عدد من الموصوفين بهذه الصفات فالإمام من انعقدت له البيعة من أكثر الخلق والمخالف للأكثر باغ يجب رده إلى الانقياد إلى الحق”

“**Doqquzuncu əsl; imamlığın şərtləri islam və mükəlləf olmaqdan sonra beşdir: kişi olması, vəra, elm, bacarıq və Qureyşə nisbət, çünki peyğəmbər – salləllahu aleyhi va səlləm – buyurur: “İmamlar qureyşdəndir.” Əgər birdən çox kəs bu sifətləri özündə toplayarsa imam insanların çoxluğundan beyət alan kəsdir və əksəriyyətə müxalif olan bağidir, onu haqqa boyun əyməyə geri döndərmək vacibdir.**”[33]

Burada imamın əksəriyyət tərəfindən beyət toplamış kəs olduğunu söyləyir. Yəni “Fədaihul-Bətiniyyə” kitabında müdafiə etdiyi rəyi burada da təsdiqləmişdir.

---

[31]Eyni mənbə: səh: 176-177;
[32]Eyni mənbə: səh: 177-178;
[33] “İhyə Ulumid-Din”, 1/115;

Diqqət edilməsi önəmli olan tərəf budur ki, zahirdə nə əl-Ğazəli, nə də əl-Cuveyni əşari mütəkəllimlərdən seçilmirlər, onlar da bir nəfərin beyətinin kifayət edəcəyini söyləyirlər, lakin bu bir nəfərin həll və əqd əhlindən elə biri olmasını şərt görürlər ki, onun beyəti ilə kütlələr imama tabe olmuş olsun. Maraqlı məqam budur ki, əl-Cuveyni əşarilərin ikinci imamı sayılan Əbu Bəkr əl-Bəqilləni'nin seçdiyi rəyin məzhəblər arasından ən doğru rəy olduğunu qəbul edir. Buna əsasən möhtəmələn deyə bilərik ki, əl-Cuveyni əşari imamlarının sözünü bütün hallar üçün keçərli saymamış, lakin özünün izah etdiyi şərtlər daxilinə almışdır. Başqa sözlə deməli olsaq mütəkəllimlər bir nəfərin beyətini kifayət görməklə heç də həll və əqd əhlindən hər bir nəfərin beyətini qəsd etmirlər, lakin beyətinin imam üçün böyük bir dəstək ifadə edəcəyi kəsləri qəsd edirlər. Ən azından əl-Cuveyni və əl-Ğazəli bu rəyi aşkar sözlərlə ifadə edirlər və heç bir yerdə onların bu məsləklə digər əşarilərdən fərqləndiklərini etiraf edərkən görmürük. Lakin bu sözlərimiz bir ehtimalı ifadə edir. Zahirən mütəkəllimlərin mütləq olaraq bir nəfərin beyəti ilə kifayətləndiyi görünür. Əgər bu rəyin arxasındakı batinin də zahirlə eyni olduğunu söyləsək deməliyik ki, əl-Cuveyni'nin və əl-Ğazəli'nin bu barədəki məsləki mütəkəllimlərin məsləkindən fərqlənir, necə ki, Əbul-Fəth əş-Şəhristani də onlardan fərqlənir. Bu baxımdan onlar şafi'i fəqihlərin dediyinə yaxındırlar. Bu barədə qarşıda inşallah söz açacağıq.

## İbn Teymiyyə’nin rəyi

Qeyd edək ki, İbn Teymiyyə’nin rəyi bu mövzu ilə maraqlananlar üçün xüsusilə önəmlidir. Ona görə də bu alimin mövzu barədəki ən önəmli sözlərini bir araya gətirməyə çalışacağıq. Bu barədə daha öncə zikr etdiyimiz kimi onun “Minhəcus-Sunnə” kitabında dediklərinə nəzər salacağıq. Şeyxul-İslam o kitabında rafizilərin iddiasını rədd edərkən deyir:

“إِنَّهُمْ يَقُولُونَ: إِنَّ الْإِمَامَ بَعْدَ رَسُولِ اللَّهِ - صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ - أَبُو بَكْرٍ، بِمُبَايَعَةِ عُمَرَ، بِرِضَا أَرْبَعَةٍ .

فَيُقَالُ لَهُ: لَيْسَ هَذَا قَوْلَ أَئِمَّةِ أَهْلِ السُّنَّةِ، وَإِنْ كَانَ بَعْضُ أَهْلِ الْكَلَامِ يَقُولُونَ: إِنَّ الْإِمَامَةَ تَنْعَقِدُ بِبَيْعَةِ أَرْبَعَةٍ، كَمَا قَالَ بَعْضُهُمْ: تَنْعَقِدُ بِبَيْعَةِ اثْنَيْنِ، وَقَالَ بَعْضُهُمْ: تَنْعَقِدُ بِبَيْعَةِ وَاحِدٍ، فَلَيْسَتْ هَذِهِ أَقْوَالَ أَئِمَّةِ السُّنَّةِ.

بَلِ الْإِمَامَةُ عِنْدَهُمْ تَثْبُتُ بِمُوَافَقَةِ أَهْلِ الشَّوْكَةِ عَلَيْهَا، وَلَا يَصِيرُ الرَّجُلُ إِمَامًا حَتَّى يُوَافِقَهُ أَهْلُ الشَّوْكَةِ عَلَيْهَا الَّذِينَ يَحْصُلُ بِطَاعَتِهِمْ لَهُ مَقْصُودُ الْإِمَامَةِ، فَإِنَّ الْمَقْصُودَ مِنَ الْإِمَامَةِ إِنَّمَا يَحْصُلُ بِالْقُدْرَةِ وَالسُّلْطَانِ، فَإِذَا بُويِعَ بَيْعَةً حَصَلَتْ بِهَا الْقُدْرَةُ وَالسُّلْطَانُ صَارَ إِمَامًا.”

**“Onlar deyirlər ki, “Allahın elçisindən – salləllahu aleyhi va sələm – sonra imam Öməri̇n beyəti və dörd nəfərin razılığı ilə Əbu Bəkr oldu.” Bunu deyənə deyilər: Bu, sünnət əhlinin imamlarının görüşü deyildir, hətta kəlam əhlindən bəziləri imamlıq əqdinin dörd nəfərin beyəti ilə bağlandığını, eləcə də bəzilərinin iki nəfərin beyəti ilə bağlandığını və bəzilərinin isə bir nəfərin beyəti ilə bağlandığını demiş olsalar da bu görüşlər sünnət imamlarının görüşləri deyildir. Əksinə onlara görə imamlıq şövkət əhlinin onun üzərində razılaşması ilə sabit olur və bir kəs şövkət əhlinin razılığı olmayana qədər imam olmaz və onlar o kəslərdirlər ki, onlara itaət etməklə imamlığın məqsədi ortaya çıxır, belə ki, imamlıqdakı məqsəd yalnız və yalnız qüdrət**

> **və hökmranlıq ilə hasil olur; ona görə də qüdrət və hökmranlığı qazandıracaq bir beyət ilə beyət olunarsa imam olar.**”[34]

Diqqət etmək lazımdır ki, Şeyxul-İslam terminologiyasında “həll və əqd əhli” yerinə şövkət əhli terminini işlədir. Şövkət sözü isə elə bizim azərbaycan dilində də anlaşıldığı kimi qüdrət, əzəmət, güc mənalarını ifadə edir. Şövkət silah və hərbi gücdə olduğu kimi kütlələrin itaəti ilə də hasil olur və yalnız silaha xas deyildir. Ona görə də İbn Teymiyyə şövkət əhlini vəsf edərkən buyurur: “**onlara itaət etməklə imamlığın məqsədi ortaya çıxır.**” Buradan anlayırıq ki, şövkət əhli o kəslərdir ki, ümməti təşkil edən müsəlman kütlələr onların sözlərini dinləyirlər və onlara itaət edirlər.

Qeyd etməyimiz lazımdır ki, İbn Teymiyyə’nin nəzərində “həll və əqd əhli” sözünün bir ümumi, bir də xüsusi mənası vardır. “Şövkət əhli” dedikdə İbn Teymiyyə bununla “həll və əqd əhlindən” xüsusi bir qrupu nəzərdər tutur və onlar o kəslərdir ki, onların razılığı ilə kütlələri idarə etmək üçün tələb olunan güc və dəstək hasil olur. Bir də ümumi olaraq “həll və əqd əhli” qavramı vardır ki, burada həmin “həll və əqd əhli” imamlıq məqamına kimin layiq olduğunu müəyyən etmək üçün lazım olan biliklərə sahib olan şəxslərdir. İbn Teymiyyə’nin nəzərində dövlətin əsasını təşkil edən şövkətin hasil olması ilə, dövlət başçısının legitimliyini, yəni şər’iliyini, qanuniliyini təmin edən seçimin baş verməsi arasında fərq vardır. Ona görə tam şər’i bir xəlifənin olması üçün hər iki prosesin baş verməsi lazımdır, lakin əgər seçim prosesi olmadan sadəcə şövkətin hasil olması ilə bir kimsə hakimiyyətə gələrsə bu da İbn Teymiyyə’yə görə haram bir yol olsa da yenə imamlığın qüvvəyə minməsinin yollarından biridir. Bu barədə İbn Teymiyyə’nin məzhəbini təhrir etmək üçün açdığımız bu fəslin sonunda lazım olan nəqlləri zikr edəcəyik.

Hələlik İbn Teymiyyə’nin dövlətin əsasını, fəqərəsini təşkil edən güc və şövkətin qurulması haqqında dediyi önəmli sözlərə nəzər salırıq. İbn Teymiyyə bir başqa yerdə buyurur:

> “فَالْإِمَامَةُ مُلْكٌ وَسُلْطَانٌ، وَالْمُلْكُ لَا يَصِيرُ مُلْكًا بِمُوَافَقَةِ وَاحِدٍ وَلَا اثْنَيْنِ وَلَا أَرْبَعَةٍ، إِلَّا أَنْ تَكُونَ مُوَافَقَةُ هَؤُلَاءِ تَقْتَضِي مُوَافَقَةَ غَيْرِهِمْ بِحَيْثُ يَصِيرُ مُلْكًا بِذَلِكَ. وَهَكَذَا كُلُّ أَمْرٍ يَفْتَقِرُ إِلَى الْمُعَاوَنَةِ عَلَيْهِ لَا يَحْصُلُ إِلَّا بِحُصُولِ مَنْ يُمْكِنُهُمُ التَّعَاوُنُ عَلَيْهِ؛ وَلِهَذَا لَمَّا بُويِعَ عَلِيٌّ - رَضِيَ اللَّهُ عَنْهُ - وَصَارَ مَعَهُ شَوْكَةٌ صَارَ إِمَامًا.”

> “**Beləliklə də imamlıq mülk və hökmranlıqdır və mülk bir nəfərin, nə də iki nəfərin, nə də ki dörd nəfərin razılığı ilə mülk olmur, lakin yalnız bunların razılığının digərlərinin də razı olmasını – o şəkildə ki, bununla mülk əmələ gəlir - tələb etməsi**

[34]“Minhəcus-Sunnətin-Nəbəviyyə”, 1/526-527;

**halı istisnadır. Bax bu şəkildə bütün işlər dəstəklənməyə ehtiyac duyur; yalnız üzərində qarşılıqlı yardımlaşmaqları mümkün olan kəsin olması ilə hasil olur. Ona görə də Əliyə – radiyallahu anhu – beyət edildikdə və onunla birlikdə şövkət əmələ gəldikdə (bununla) imam oldu.**”[35]

Burada “mülk” sözü ilə qəsd olunan bizim dilimizdə anlaşılan məna deyildir, lakin “səltənət”, “hakimiyyət” mənası qəsd olunur. Burada da İbn Teymiyyə önəmli bir nöqtəyə toxunur və qeyd edir ki, bu hakimiyyət və hökmranlıq bir neçə nəfərin beyəti ilə hasil olmur. Daha sonra bir halı müstəsna görür; bu isə bir neçə nəfərin sözünə digərlərinin də tabe olması halıdır. Buradan da anlamış oluruq ki, şövkət bir neçə nəfərin əlində cəm ola bilər, lakin əksər halda həll və əqd əhlinin sayı çox olur, xüsusilə də bu, bizim zamanımızda belədir. Bir də diqqət edək ki, İbn Teymiyyə təsdiqləyir ki, Əli bin Əbi Talibi – Allah ondan razı olsun! – şövkət əhli seçmişdir. Qarşıda bununla bağlı ayrıca bir fəsildə araşdırmaya yer verəcəyik. Əlinin xilafəti ilə bağlı ortaya atılmış şübhənin cavabında İbn Teymiyyə’nin bu sözlərini xatırla. Daha sonra İbn Teymiyyə eyni kitabda və eyni məzmunda buyurur:

”فَكَوْنُ الرَّجُلِ أَمِيرًا وَقَاضِيًا وَوَالِيًا وَغَيْرَ ذَلِكَ مِنَ الْأُمُورِ الَّتِي مَبْنَاهَا عَلَى الْقُدْرَةِ وَالسُّلْطَانِ، مَتَى حَصَلَ مَا يَحْصُلُ بِهِ مِنَ الْقُدْرَةِ وَالسُّلْطَانِ حَصَلَتْ وَإِلَّا فَلَا؛ إِذَ الْمَقْصُودُ بِهَا عَمَلُ أَعْمَالٍ لَا تَحْصُلُ إِلَّا بِقُدْرَةٍ، فَمَتَى حَصَلَتِ الْقُدْرَةُ الَّتِي بِهَا يُمْكِنُ تِلْكَ الْأَعْمَالُ كَانَتْ حَاصِلَةً وَإِلَّا فَلَا.

وَهَذَا مِثْلُ كَوْنِ الرَّجُلِ رَاعِيًا لِلْمَاشِيَةِ، مَتَى سُلِّمَتْ إِلَيْهِ بِحَيْثُ يَقْدِرُ أَنْ يَرْعَاهَا، كَانَ رَاعِيًا لَهَا وَإِلَّا فَلَا، فَلَا عَمَلَ إِلَّا بِقُدْرَةٍ عَلَيْهِ، فَمَنْ لَمْ يَحْصُلْ لَهُ الْقُدْرَةُ عَلَى الْعَمَلِ لَمْ يَكُنْ عَامِلًا.

وَالْقُدْرَةُ عَلَى سِيَاسَةِ النَّاسِ إِمَّا بِطَاعَتِهِمْ لَهُ، وَإِمَّا بِقَهْرِهِ لَهُمْ، فَمَتَى صَارَ قَادِرًا عَلَى سِيَاسَتِهِمْ بِطَاعَتِهِمْ أَوْ بِقَهْرِهِ، فَهُوَ ذُو سُلْطَانٍ مُطَاعٍ، إِذَا أَمَرَ بِطَاعَةِ اللَّهِ.”

“**Beləliklə də bir kimsənin əmir və qazi və vali və başqa vəzifədə olması qüdrət və hökmranlıq üzərində qurulan işlərdəndir; qüdrət və hökmranlığın əldə edilməsi üçün tələb olunan şərtlər hasil olarsa hasil olar, əks təqdirdə bir şey əmələ gəlməz; çünki (bu vəzifələrin hamısında) məqsəd yalnız qüdrət ilə həyata keçə bilən işləri görməkdir, beləliklə də bu işləri mümkün edəcək qüdrət hasil olduğu zaman (bu vəzifələr də) ortaya çıxar, əks təqdirdə bir şey əmələ gəlməz. Bu isə bir kişinin sürüyə çoban olması kimidir, əgər ona təslim olunarsa, belə ki, onlara çobanlıq etməyə qadir olarsa sürüyə çoban olar, yoxsa olmaz. Bir iş yalnız ona qadir olmaqla mümkündür və hər kim üçün bir işi görməkdə**

[35]Eyni mənbə: 1/527;

**tələb olunan qüdrət hasil olmazsa o işi görən olmaz.İnsanları siyasətlə idarə etməyə qadir olmaq isə ya insanların könüllü şəkildə itaət etmələri ilə, ya da onları qəhr etməsi olur. Nə zaman ki, itaət etmələri yolu ilə və ya onun qəhr etməsi yolu ilə onları siyasi olaraq idarə etməyə qadir olarsa o zaman o, Allaha itaət olan işləri əmr etdikdə itaət olunan hökm sahibi olar.**”[36]

Bu sözlər də İbn Teymiyyə’nin məzhəbini aşkar şəkildə bizə sərgiləyir. İbn Teymiyyə burada realistik bir yanaşma göstərir. Ona görə bütün hakimiyyət pillələri qüdrətə dayanır. Xüsusilə də qeyd edir ki, əgər imamın və ya qazinin hökmü rəiyyə arasında keçərli deyilsə o əslində imam deyildir, çünki imamlığın məqsədi hasil olmayıb. Bu sözlərdən aydın olur ki, əgər Yer kürəsinin harasındasa bir müsəlman özünü xəlifə elan etsə, həmin kiçik ərazidə özünə müsəlmanların bir hissəsini tabe elətdirə bilsə, lakin ümmətin böyük əksəriyyəti üzərində hökmranlığı çatmazsa belə biri xəlifə sayılmaz, çünki İbn Teymiyyə’yə görə imamlığın məqsədlərini həyata keçirmədən imam olmaq mümkün deyildir. Kitabımızda qarşıda xəlifəliyin məqsədləri haqqında söz açacağıq və orada verəcəyimiz izahı burada İbn Teymiyyə’nin sözləri ilə müqayisə et! Bir də nəzərində saxla ki, burada İbn Teymiyyə - rahiməhullah – səltənətin, hakimiyyətin, imamlığın qurulmasının şər’i və ya qeyri şər’i yolundan danışmır, lakin istənilən şəkildə qurulmasından asılı olmayaraq dövlətin üzərində duracağı dəstəyinin, gücünün olmasının zəruri olduğunu izah edir və bunsuz heç bir dövlətin qurulmasının imkansız olduğunu vurğulayır. Bu baxımdan İbn Teymiyyə’nin dediyi daha əvvəl əl-Cuveyni’nin və tələbəsi əl-Ğazəli’nin dedikləri ilə eynidir. Müsəlman ictima alimi və tarixçi İbn Xaldun bu alimlərin şövkət və güc adlandırdıqlarına “asabiyyə” adını vermişdir və qərb orientalistlər isə bunu öz dillərində “solidarlıq” kimi tərcümə ediblər. Yəni qurulacaq dövlətin təbəə və rəiyyət arasında solidarlıq qazanması onun davamiyyəti üçün zəruridir.

Həm də Şeyxul-İslama görə qüdrət və şövkət əhlindən bəzi kəslərin beyət etməsi kifayət etmir. Bununla bağlı olaraq buyurur:

“وَالثَّانِي: أَنَّهُ مَتَى صَارَ إِمَامًا، فَذَلِكَ بِمُبَايَعَةِ أَهْلِ الْقُدْرَةِ لَهُ. وَكَذَلِكَ عُمَرُ لَمَّا عَهِدَ إِلَيْهِ أَبُو بَكْرٍ، إِنَّمَا صَارَ إِمَامًا لَمَّا بَايَعُوهُ وَأَطَاعُوهُ، وَلَوْ قُدِّرَ أَنَّهُمْ لَمْ يُنَفِّذُوا عَهْدَ أَبِي بَكْرٍ وَلَمْ يُبَايِعُوهُ لَمْ يَصِرْ إِمَامًا، سَوَاءٌ كَانَ ذَلِكَ جَائِزًا أَوْ غَيْرَ جَائِزٍ. فَالْحِلُّ وَالْحُرْمَةُ مُتَعَلِّقٌ بِالْأَفْعَالِ، وَأَمَّا نَفْسُ الْوِلَايَةِ وَالسُّلْطَانِ فَهُوَ عِبَارَةٌ عَنِ الْقُدْرَةِ الْحَاصِلَةِ، ثُمَّ قَدْ تَحْصُلُ عَلَى وَجْهٍ يُحِبُّهُ اللَّهُ وَرَسُولُهُ، كَسُلْطَانِ الْخُلَفَاءِ الرَّاشِدِينَ، وَقَدْ تَحْصُلُ عَلَى وَجْهٍ فِيهِ مَعْصِيَةٌ، كَسُلْطَانِ الظَّالِمِينَ.

وَلَوْ قُدِّرَ أَنَّ عُمَرَ وَطَائِفَةً مَعَهُ بَايَعُوهُ، وَامْتَنَعَ سَائِرُ الصَّحَابَةِ عَنِ الْبَيْعَةِ، لَمْ يَصِرْ إِمَامًا بِذَلِكَ، وَإِنَّمَا صَارَ إِمَامًا بِمُبَايَعَةِ جُمْهُورِ الصَّحَابَةِ، الَّذِينَ هُمْ أَهْلُ الْقُدْرَةِ

[36]Eyni mənbə, 1/528-529;

وَالشَّوْكَة. وَلهَذَا لَمْ يَضُرَّ تَخَلُّفُ سَعْد بْنِ عُبَادَةَ؛ لأَنَّ ذَلكَ [لَا] يَقْدَحُ فِي مَقْصُود الْوِلَايَة، فَإِنَّ الْمَقْصُودَ حُصُولُ الْقُدْرَة وَالسُّلْطَانَ اللَّذَيْنِ بِهِمَا تَحْصُلُ مَصَالِحُ الْإِمَامَة، وَذَلكَ قَدْ حَصَلَ بِمُوَافَقَة الْجُمْهُور عَلَى ذَلكَ. فَمَنْ قَالَ إِنَّهُ يَصِيرُ إِمَامًا بِمُوَافَقَة وَاحد أَو اثْنَيْنِ أَوْ أَرْبَعَة، وَلَيْسُوا هُمْ ذَوِي الْقُدْرَة وَالشَّوْكَة، فَقَدْ غَلطَ؛ كَمَا أَنَّ مَنْ ظَنَّ أَنَّ تَخَلُّفَ الْوَاحد أَو الاثْنَيْنِ وَالْعَشَرَة يَضُرُّهُ، فَقَدْ غَلطَ.
وَأَبُو بَكْرٍ بَايَعَهُ الْمُهَاجِرُونَ وَالْأَنْصَارُ، الَّذينَ هُمْ بِطَانَةُ رَسُول اللَّه - صَلَّى اللَّهُ عَلَيْه وَسَلَّمَ -، وَالَّذينَ بِهِمْ صَارَ لِلْإِسْلَامِ قُوَّةٌ وَعِزَّةٌ، وَبِهِمْ قَهَرَ الْمُشْرِكُونَ، وَبِهِمْ فُتحَتْ جَزِيرَةُ الْعَرَبِ، فَجُمْهُورُ الَّذينَ بَايَعُوا رَسُولَ اللَّه - صَلَّى اللَّهُ عَلَيْه وَسَلَّمَ - هُمُ الَّذينَ بَايَعُوا أَبَا بَكْرٍ."

**"İkinci isə onun nə zaman imam olması ilə bağlıdır, bu isə qüdrət əhlinin ona beyət etməsi ilə oldu. Eləcə də Əbu Bəkr Öməri vəliəhd təyin etdikdə o yalnız ona beyət etdiklərində və itaət etdiklərində imam oldu. Əgər fərz olunsa ki, onlar Əbu Bəkrin əhdini həyata keçirməsəydilər və ona beyət etməsəydilər bununla imam olmazdı, bunun icazəli olması ilə icazəli olmaması eynidir. Belə ki, halallıq və haramlıq fellərin özləri ilə bağlıdır, amma vilayət və hakimiyyətin özünə gəldikdə isə bu, hasil olmuş qüdrətin ifadəsidir. Bu bəzən raşid xəlifələrdə olduğu kimi Allahın və elçisinin sevdiyi yol ilə baş verir, bəzən də zalım sultanlarda olduğu kimi günah olan yol ilə baş verir.**

**Əgər Ömər və onunla birlikdə bir qrupun Əbu Bəkrə beyət etdiyi, yerdə qalan digər səhabələrin isə beyətdən imtina etdiyi fərz olunarsa (Əbu Bəkr) bununla imam olmaz. O sadəcə qüdrət və şövkət əhli olan səhabələrin əksəriyyətinin beyəti ilə imam oldu. Buna görə də Sad bin Ubədə'nin beyət etməməsi bir zərər vermədi, çünki bu, vilayətin məqsədinə zərər vermir, belə ki, (vilayətdəki/imamlıqdakı) məqsəd qüdrət və hökmranlığın hasil olmasıdır ki, imamlıq vəzifəsinin məsləhətləri bu ikisinin vasitəsi ilə ortaya çıxır; bu isə əksəriyyətin bunun üzərində razılaşması ilə əldə edildi. Kim qüdrət və şövkət əhli olmayan bir nəfər və ya iki nəfər və ya dörd nəfərin razılaşması ilə imam olacağını deyir xəta edir, necə ki, bir və ya iki və ya on nəfərin beyətdən imtina etməsinin ona zərər verəcəyini güman edirsə xəta edir. Əbu Bəkrə mühacirlər və ənsar beyət etdi, o kəslər ki, onlar Allahın elçisinin – salləllahu aleyhi va səlləm – silahdaşları idilər, o kəslər ki, İslam onlarla qüvvət və izzət əldə etdi və onlarla müşrikləri qəhr etdi və onlarla Ərəb yarımadası fəth edildi,**

**beləliklə də Əbu Bəkrə beyət edənlər Allahın elçisinə - salləllahu aleyhi va səlləm – beyət edənlərin əksəriyyətidir.**”[37]

Beləliklə də İbn Teymiyyə bu sözləri ilə əksəriyyətin itaətinin və beyətinin önəmini çatdırır. Ona görə Əbu Bəkr özündən sonra Öməri vəliəhd təyin etdikdə itaət edib Ömərə beyət etmək şərən vacib olsa da insanlar asilik edib itaətdən boyun qaçırsaydılar, həll və əqd əhli ona beyət etməsəydi o zaman – İbn Teymiyyə’nin nəzərində - Ömərin xəlifəliyi səhih olmayacaqdı. Eləcə də Ömər və onunla bir qrup səhabənin beyət etməsinin Əbu Bəkrin xilafətinin səhih olması üçün kifayət etmədiyini vurğulayır, halbuki Ömər şübhəsiz ki, şövkət əhlindən idi. Ona görə də Şeyxul-İslam İbn Teymiyyə Əbu Bəkrin xilafətinin əksəriyyətin beyəti ilə səhih olduğunu qeyd edir.

Burada yadda saxlanılması önəmli olan digər bir məna imamlıq şərtlərini ödəməyən birinin güc və qüvvət ilə hakimiyyəti ələ keçirməsinin İbn Teymiyyə’yə məşru olmamasıdır. Mövzunu tam anlamaq üçün bu cür yerlərə diqqət etmək lazımdır. Fikir verirsizsə İbn Teymiyyə təkrar-təkrar qeyd edir ki, şövkət və qüdrət haqqında dedikləri həm haram yolla hasil olan hakimiyyətə aiddir, həm də halal yolla hasil olana aiddir. Bu sənə onu çatdırır ki, İbn Teymiyyə şövkət və qüdrət ilə seçilən imamın, xəlifənin vəzifəyə layiq olduğunu təyin etməkdən danışmır və hakimiyyətin qurulmasının legitim, şəri yollarından danışmır, sadəcə və sadəcə qurulan dövlətin istiqrar tapması üçün, vəzifələrini yerinə yetirməsi üçün şövkətə və gücə sahib olmasının zəruriyyətindən danışır. Bu barədə “Təğallub Şəri Yoldurmu?” adlı bölmədə məlumat verəcəyik. İbn Teymiyyə yenə eyni məna üzərində apardığı müzakirəyə davam edərək deyir:

“فَيُقَالُ أَيْضًا: عُثْمَانُ لَمْ يَصِرْ إِمَامًا بِاخْتِيَارِ بَعْضِهِمْ، بَلْ بِمُبَايَعَةِ النَّاسِ لَهُ، وَجَمِيعُ الْمُسْلِمِينَ بَايَعُوا عُثْمَانَ [بْنَ عَفَّانَ] ، وَلَمْ يَتَخَلَّفْ عَنْ بَيْعَتِهِ أَحَدٌ. قَالَ الْإِمَامُ أَحْمَدُ فِي رِوَايَةِ حَمْدَانَ بْنِ عَلِيٍّ : " مَا كَانَ فِي الْقَوْمِ أَوْكَدُ بَيْعَةً مِنْ عُثْمَانَ كَانَتْ بِإِجْمَاعِهِمْ " فَلَمَّا بَايَعَهُ ذَوُو الشَّوْكَةِ وَالْقُدْرَةِ صَارَ إِمَامًا، وَإِلَّا فَلَوْ قُدِّرَ أَنَّ عَبْدَ الرَّحْمَنِ بَايَعَهُ، وَلَمْ يُبَايِعْهُ عَلِيٌّ وَلَا غَيْرُهُ مِنَ الصَّحَابَةِ أَهْلِ الشَّوْكَةِ لَمْ يَصِرْ إِمَامًا.”

**“Həmçinin deyilir: Osman bəzilərinin seçimi ilə imam olmadı, əksinə insanların beyəti ilə oldu və müsəlmanların hamısı Osman bin Affana beyət etdilər və ona beyət etməkdən heç kim imtina etmədi. Həmdən bin Əli’nin rəvayətində İmam Əhməd deyir: “Onlarda Osmanın beyətindən daha təkidlisi olmamışdır; onların icması ilə (imam) oldu.” Şövkət və qüdrət sahibləri beyət etdiklərində (Osman) imam oldu, yoxsa Abdurrahmən’in beyət**

[37]Eyni mənbə; 1/530-531

**etdiyi, şövkət əhli səhabələrdən Əli və qeyrilərinin beyət etmədiyi fərz olunsa imam olmazdı.**”[38]

Osman bəzilərinin seçimi ilə imam olmadı dedikdə qəsdi budur ki, Osman mücərrəd olaraq Ömərin təyin etdiyi şuranın seçimi ilə xəlifə olmadı, lakin digər müsəlmanların bu şuraya tabe olması ilə xəlifə oldu. Yenə bununla bağlı buyurur:

“وَلَا رَيْبَ أَنَّ الْإِجْمَاعَ الْمُعْتَبَرَ فِي الْإِمَامَةِ لَا يَضُرُّ فِيهِ تَخَلُّفُ الْوَاحِدِ وَالِاثْنَيْنِ وَالطَّائِفَةِ الْقَلِيلَةِ فَإِنَّهُ لَوِ اعْتُبِرَ ذَلِكَ لَمْ يَكَدْ يَنْعَقِدُ إِجْمَاعٌ عَلَى إِمَامَةٍ؛ فَإِنَّ الْإِمَامَةَ أَمْرٌ مُعَيَّنٌ فَقَدْ يَتَخَلَّفُ الرَّجُلُ لِهَوًى لَا يُعْلَمُ”

“**Şübhəsiz ki, bir və iki və az sayda qrupun (beyətdən) imtina etməsi imamlıqda nəzərə alınan icmaya zərər vermir, belə ki, əgər bu nəzərə alınsaydı az qala imamlıq üzərində heç zaman icma bağlanmazdı, çünki imamlıq təyin olunan bir vəzifədir və ola bilər ki, kimsə öz şəxsi marağına görə (beyət etməkdən) imtina etsin və bilinməsin.**”[39]

Diqqət etmək lazımdır ki, İbn Teymiyyə bəzi kəslərin beyətdən imtina etməsinin zərər vurmayacağını izah edərkən onları “azlıq” olaraq vəsf edir, əgər İbn Teymiyyə’yə görə müxalifətdəki sayın etibarı yoxdursa o zaman “azlıq” sözü ilə kifayətlənməsinin mənası olmazdı. Əks təqdirdə deyə bilərdik ki, hətta əksəriyyət müxalif olsa belə İbn Teymiyyə’yə görə bu, imamlığın səhihliyinə zərər vurmaz. Lakin məqalənin sahibi də gözəl bilir ki, əksəriyyətin müxalifəti İbn Teymiyyənin məzhəbinə əsasən iddia olunan imamlığı keçərsiz edir. İbn Teymiyyə - rahmətullahi aleyhi – buyurur:

“أَمَّا الْإِجْمَاعُ عَلَى الْإِمَامَةِ، فَإِنْ أُرِيدَ بِهِ الْإِجْمَاعُ الَّذِي يَنْعَقِدُ بِهِ الْإِمَامَةُ، فَهَذَا يُعْتَبَرُ فِيهِ مُوَافَقَةُ أَهْلِ الشَّوْكَةِ بِحَيْثُ يَكُونُ مُتَمَكِّنًا بِهِمْ مِنْ تَنْفِيذِ مَقَاصِدِ الْإِمَامَةِ حَتَّى إِذَا كَانَ رُءُوسُ الشَّوْكَةِ عَدَدًا قَلِيلًا، وَمَنْ سِوَاهُمْ مُوَافِقٌ لَهُمْ حَصَلَتِ الْإِمَامَةُ بِمُبَايَعَتِهِمْ لَهُ. هَذَا هُوَ الصَّوَابُ الَّذِي عَلَيْهِ أَهْلُ السُّنَّةِ وَهُوَ مَذْهَبُ الْأَئِمَّةِ كَأَحْمَدَ وَغَيْرِهِ. وَأَمَّا أَهْلُ الْكَلَامِ فَقَدَّرَهَا كُلٌّ مِنْهُمْ بِعَدَدٍ، وَهِيَ تَقْدِيرَاتٌ بَاطِلَةٌ.”

“**Amma imamlıq üzərində icmaya gəldikdə isə əgər bununla imamlığın onunla qüvvəyə mindiyi icma qəsd olunursa bunda şövkət əhlinin razılığı etibara alınır, belə ki, (imam) onların vasitəsi ilə imamlığın məqsədlərini həyata keçirməyə imkan qazanır, hətta şövkətin rəhbərləri sayca az olsalar və onlardan başqaları onlarla razılaşsalar onların imama beyət etmələri ilə imamlıq hasil olacaq. Sünnət əhlinin üzərində olduğu doğru**

[38]Eyni mənbə: 1/532-533;
[39]1/535;

> **görüş də elə budur və bu, Əhməd kimi və ondan başqaları kimi imamların məzhəbidir. Kəlam əhlinə gəldikdə isə onlardan hər biri bunu bir say ilə ölçüblər və bunların hamısı batil ölçülərdir.**"[40]

İmamlığın məqsədlərinin icra edilməsi bütün ümmət üçün nəzərdə tutulur, yoxsa bir iki şəhərdə imamlığın məqsədləri iddia edilənə görə icra olunursa, lakin müsəlmanların digər ərazilərində bu imamlığın əsər əlaməti yoxdursa o zaman İbn Teymiyyə'nin ətəyindən yapışaraq bu xəlifəliyi necə səhih saymaq olar?! İbn Teymiyyə şübhəsiz ki, imamlığın məqsədlərinin həyata keçməsi dedikdə bunun ən azından ümmətin əksər ərazilərində baş verməsini nəzərdə tutur. Əks təqdirdə bir kənddə olsa belə imamlıq vəzifələrini yerinə yetirən kəs bütün ümmətə xəlifə olduğunu iddia edə bilər, bu isə əql sahiblərinin icması ilə batildir. İbn Teymiyyə şübhəsiz ki, həll və əqd əhlinin razılığını şərt görür və bu, onun sözlərindən aşkar bir şəkildə anlaşılır. Ona görə də burada bu nöqtə üzərində durmağımız lazımdır. İbn Teymiyyə həll və əqd əhlinin cumhurunun razılığını şərt görürmü? Əbul-Məhasin qardaşımız bununla bağlı iddiasında bu sözləri deyir:

> **"Şeyxul-İslam İbn Teymiyyə -rahiməhullah- seçiləcək imam üçün şövkətin hasil olması şərtindən savayı iddia olunduğu kimi digər hər hansı bir şərt irəli sürməmişdir. Onun məsələni bütün ümmət tərəfindən seçilən həll və əqd əhlinin cumhuru ilə məhdud etməsi yaxud bunu şərt qoyması da həmçinin rast gəlinməmişdir."**

İddiasına görə İbn Teymiyyə'nin cumhuru şərt gördüyü hər hansı bir sözünə rast gəlinməmişdir. Bunun davamında bəzi nəqlləri gətirir və sonra daha əvvəl dediyi sözünü rədd edərək deyir:

> **"Qeyd edildiyi kimi Şeyxul-İslam İbn Teymiyyə bütün ümmət tərəfindən seçilmiş həll və əqd əhlindən olan cumhurun beyətini şərt qoymur. Ən uzağı deyilə bilər ki, İbn Teymiyyə bəzi hallarda şövkət sahibləri olan həll və əqd əhlinin və onların qərarı nəticəsində əksər insanların yekdilliyini şərt qoyur."**

İndi oxucu nə anlamalıdır?! İbn Teymiyyə həll və əqd əhlinin qərarı nəticəsində "əksər insanların yekdilliyini" şərt görür ya yox?! Əslində İbn Teymiyyənin sözləri o qədər aydın, o qədər aşkardır ki, məqalənin sahibi o sözləri dəstəklədiyi camaatın xeyrinə təhrif etməyə cəhd etsə də, o sözlərin üstünü malalamağa çalışsa da heç cür onların tələb etdiyi nəticədən qurtula bilməmişdir. Bəli, həqiqət budur ki, İbn Teymiyyə'nin məzhəbinə əsasən bu gün iddia olunan xəlifəlik batildir, heç bir əsası yoxdur və səhih deyildir. Şeyxul-İslam İbn

[40] 8/356;

Teymiyyə'yə görə imamlıq vəzifələrini və məqsədlərini həyata keçirmək üçün gərəkli olan nüfuz sahibi şəxslərin əksəriyyətinin razı olması şərtdir və bunu biz onun növbəti sözlərindən anlayırıq:

"لَوْ فَرَضَ خلَافَ هَؤُلَاءِ الَّذينَ ذَكَرَهُمْ وَبِقَدْرِهِمْ مرَّتَيْنِ لَمْ يَقْدَحْ ذَلِكَ فِي ثُبُوت الْخلَافَة، فَإِنَّهُ لَا يُشْتَرَطُ فِي الْخلَافَة إِلَّا اتِّفَاقُ أَهْلِ الشَّوْكَةِ وَالْجُمْهُورِ الَّذِينَ يُقَامُ بِهِمُ الْأَمْرُ بِحَيْثُ يُمْكِنُ أَنْ يُقَامَ بِهِمْ مَقَاصِدُ الْإِمَامَةِ."

"**Hətta əgər adlarını çəkdiklərinin və onların iki qatının müxalif olduqları fərz olunarsa bu, xilafətin sübutuna zərər verməz, çünki xilafətdə şövkət əhlinin ittifaqından və bu işi ayaqda tutan kəslərin – elə ki, onların vasitəsilə imamlığın məqsədlərinin bərqərar olması mümkün olsun - cumhurundan başqa bir şey şərt deyildir.**"[41]

Burada da aydın şəkildə ittifaqın və ya cumhurun şərt olduğunu deyir. Məgər bu sözləri təhrif edərək "cumhurun" şərt olmadığını demək olarmı? Bu sonuncu sözləri İmam əz-Zəhəbi "əl-Muntəqa" kitabında bu cür ixtisar etmişdir:

"وَأَيْضًا فَلَا يشْتَرط فِي صحَة الْخلَافَة إِلَّا إتفاق أهل الشَّوْكَة وَالْجُمْهُور قَالَ صلى الله عَلَيْهِ وَسلم عَلَيْكُم بِالْجَمَاعَة فَإِن يَد الله على الْجَمَاعَة وَقَالَ عَلَيْكُم بِالسَّوَادِ الْأَعْظَم وَمن شَذَّ شَذَّ فِي النَّار"

"**Həmçinin xəlifəliyin səhihliyi üçün şövkət əhlinin və cumhurun ittifaqından başqa bir şey şərt deyildir. Peyğəmbər – salləllahu aleyhi va səlləm –demişdir: "Sizə camaatı tövsiyə edirəm, çünki Allahın himayəsi camaatın üzərindədir." (Həmçinin) deyib: "Sizə "savadu azama" tabe olmağı əmr edirəm, kim ayrı düşərsə cəhənnəmdə də ayrı qalar.**"[42]

əz-Zəhəbi bizə İbn Teymiyyə'nin sözünün məğzini qısa şəkildə çatdırmışdır. Əlbəttə ki, tələbəsi şeyxinin nəyi qəsd etdiyini bizdən daha yaxşı bilir. Daha öncə hənbəli alimlərinin "icma" dedikdə qəsdlərini şərh edərkən İbn Teymiyyə'nin sözlərini zikr etmişdik. Burada həmin nöqtə ilə bağlı digər izaha yer vermək istəyirik. İbn Teymiyyə'nin nəzərində imamlıqla bağlı iki ayrı yerdə "icma" nəzərdə tutula bilər. Bir yerdə imam üçün dəstəyin, gücün və qüvvənin hasil olması üçün tələb olunan "icma", digər yerdə isə imamlıq vəzifəsi üçün hansı namizədin daha haqlı, daha üstün olması barəsində həll və əqd əhlinin "icması" qəsd oluna bilər. Bu barədə İbn Teymiyyə deyir:

---

[41] 8/336
[42] "əl-Muntəqa min Minhəcil-İtidəl", səh: 547;

“قَالَ الرَّافِضِيُّ : " وَأَيْضًا الْإِجْمَاعُ إِمَّا أَنْ يُعْتَبَرَ فِيهِ قَوْلُ كُلِّ الْأُمَّةِ، وَمَعْلُومٌ أَنَّهُ لَمْ يَحْصُلْ، بَلْ وَلَا إِجْمَاعُ أَهْلِ الْمَدِينَةِ أَوْ بَعْضِهِمْ، وَقَدْ أَجْمَعَ أَكْثَرُ النَّاسِ عَلَى قَتْلِ عُثْمَانَ ".

وَالْجَوَابُ: أَنْ يُقَالَ أَمَّا الْإِجْمَاعُ عَلَى الْإِمَامَةِ، فَإِنْ أُرِيدَ بِهِ الْإِجْمَاعُ الَّذِي يَنْعَقِدُ بِهِ الْإِمَامَةُ، فَهَذَا يُعْتَبَرُ فِيهِ مُوَافَقَةُ أَهْلِ الشَّوْكَةِ بِحَيْثُ يَكُونُ مُتَمَكِّنًا بِهِمْ مِنْ تَنْفِيذِ مَقَاصِدِ الْإِمَامَةِ حَتَّى إِذَا كَانَ رُءُوسُ الشَّوْكَةِ عَدَدًا قَلِيلًا، وَمَنْ سِوَاهُمْ مُوَافِقٌ لَهُمْ حَصَلَتِ الْإِمَامَةُ بِمُبَايَعَتِهِمْ لَهُ. هَذَا هُوَ الصَّوَابُ الَّذِي عَلَيْهِ أَهْلُ السُّنَّةِ وَهُوَ مَذْهَبُ الْأَئِمَّةِ كَأَحْمَدَ وَغَيْرِهِ. وَأَمَّا أَهْلُ الْكَلَامِ فَقَدَّرَهَا كُلٌّ مِنْهُمْ بِعَدَدٍ، وَهِيَ تَقْدِيرَاتٌ بَاطِلَةٌ. وَإِنْ أُرِيدَ بِهِ الْإِجْمَاعُ عَلَى الِاسْتِحْقَاقِ وَالْأَوْلَوِيَّةِ، فَهَذَا يُعْتَبَرُ فِيهِ إِمَّا الْجَمِيعُ وَإِمَّا الْجُمْهُورُ وَهَذِهِ الثَّلَاثَةُ حَاصِلَةٌ فِي خِلَافَةِ أَبِي بَكْرٍ.”

**“Rafizi dedi: “Həmçinin icmada ya bütün ümmətin sözü nəzərə alınmalıdır və məlumdur ki, belə bir şey baş verməyib, hətta heç mədinə əhlinin və ya bir hissəsinin icması baş verməyib. İnsanların əksəriyyəti hətta Osmanı qətl etmək üzərində icma ediblər.**

**Bunun cavabı belə deməkdir; imamlıq üzərində icmaya gəldikdə isə əgər bununla imamlığın onunla qüvvəyə mindiyi icma qəsd olursa bunda şövkət əhlinin müvafiq olması etibara alınır; belə ki, onların vasitəsi ilə (imam) imamlığın məqsədlərini icra etmək imkanını əldə etsin. Hətta güc/qüdrət (əhli)nin böyükləri/başçıları sayca az olsalar və onlardan savayı kəslər onlara müvafiq olsalar, onların ona beyət etməsi ilə imamlıq hasil olur. Əhlüs-sünnətin üzərində olduğu doğru görüş də elə budur və bu, Əhməd və ondan başqa imamların məzhəbidir. Kəlam əhlinin görüşünə gəldikdə isə, onlardan hər biri bunu say ilə ölçüblər və bunlar batil ölçülərdir. Yox, əgər bununla (imamlıq vəzifəsinə) haqqının olması və daha üstün olmaq üzərində icma qəsd olunursa bunda etibara alınan ya hamıdır, ya da cumhurdur. Bunların üçü də Əbu Bəkr’in xilafətində hasil idi.”**[43]

Diqqət etmək lazımdır ki, birinci “icma” məfhumunun şərhində güc və qüdrət sahibi olan liderlərin saylarının azlığına işarə etməklə kifayətlənmədi, lakin digər həll və əqd əhlinin də onlarla müvafiq olmasını qeyd etdi. Şövkət və qüdrətin hasil olması üçün onun əhlinin müvafiq olmasını şərt görür, şövkət əhlinin müvafiq olduğunu demək üçün isə ən azından onların əksəriyyəti müvafiq olmalıdır. Bütün bu deyilənlər həm də əqlən belədir. Əgər imamlığın vəzifə və

[43] “Minhəcus-Sunnə”, 8/356;

məqsədlərinin həyata keçməsi üçün gərəkli olan dəstəyi almaq üçün nüfuz və güc sahibi şəxslərin əksəriyyəti beyətlə razılaşmazsa, beyətə müxalif olarsa o zaman görəsən İbn Teymiyyə'nin sözünü etdiyi imamlıq məqsədləri və vəzifələri necə hasil olacaq?! Əbul-Məhasin qardaşımız bu həqiqətdən qurtula bilmədiyi üçün sözünün sonunda sözünün əvvəlində inkar etmək istədiyini təsdiqləmiş olur.

Bir də burada başqa faydaya diqqət yetir. Şeyxul-İslam İbn Teymiyyə güc strukturları tərəfindən dəstək almağı imamlıq məqamı üçün haqlı və layiqli görməklə eyni bərabərdə saymadı. Çünki kimsə həll və əqd əhlinin beyətini qazanmadan, güc orqanlarının, gücü əlində tutan kəslərin dəstəyini qazanarsa və onların köməyi ilə hakimiyyətə gələrsə bu, "təğallub" yolu ilə hakimiyyətə gəlmək olacaq və belə bir hakim "mutəğallib" olacaq. Həll və əqdi əhli onu seçmədən bunu etdiyi üçün asi olur, lakin bir "mutəğallib" kimi fitnəsindən qurtulmaq üçün imamlığı təsdiq olunur. Amma seçim yolu ilə imamlıq vəzifəsinə keçməyə gəldikdə isə burada Şeyxul-İslam İbn Teymiyyə ən azından həll və əqd əhlinin əksəriyyətinin müvafiq olmasını şərt görür. Əbul-Məhasin qardaşımız və onun misalında hər iddianı təsdiqləməyə tələsən qardaşlarımız bu cür fərqlərdən qafil qalıblar və nəticədə qəbul etdikləri mövqe yuxarıda göstərildiyi kimi ziddiyyətli olur.

Aydın oldu ki, seçim məqamında Şeyxul-İslam ən azından əksəriyyətin müvafiq olmasını şərt görür. Əziz oxucular, bu, hansısa demokratın sözü deyildir, bu, Şeyxul-İslam İbn Teymiyyə'nin sözləridir. Günümüzdə həddini aşanların "əksəriyyət" demokratların məzhəbidir deməsinə aldanma!

Bizim bu dediyimizi mövzu haqqında kitab yazmış və araşdırma etmiş elm əhli də bu şəkildə anlamışdır. Doktor Salah əs-Savi "əl-Vaciz fi Fiqhil-Xiləfə" kitabında, Muhəmməd Rafət Osman "Riyəsətud-Dəvlə fil-Fiqhil-İsləmi" kitabında, Fuad ən-Nədi "Turuq İxtiyər əl-Xalifə" kitabında və Abdurrahmən bin Ömər əd-Dəmici "əl-İmənətul-Uzmə" kitabında bu görüşü İbn Teymiyyə'yə bu şəkildə nisbət edirlər.

## Mütəkəllim alimlərin rəyi

Yuxarıda Şeyxul-İslam İbn Teymiyyə'nin rəyini təhrir edərkən onun bəzi görüşləri əhlus-sünnət'dən kənar gördüyünü, onları kəlam əhlinin görüşü kimi vəsf etdiyini gördük. Qeyd edək ki, mütəkəllimlər bu məsələdə tək bir rəydə deyillər. Onlardan bəzilərinə görə həll və əqd əhlindən ən az qırx nəfər beyət etməlidir. Digər görüşə görə ən azından beş nəfərin beyət etməsi şərtdir və əl-Məvardi bunu Basra əhlindən olan mütəkəllimlər və fəqihlərin əksəriyyətinə nisbət etmişdir. Bu görüş həm də mötəzilədən Əbu Əli əl-Cibəi və əl-Qadi Abdulcəbbar'a nisbət edilib. Daha bir görüş budur ki, beyət edənlərin sayı ən azından dörd olmalıdır. Bir başqa görüşə görə iki nəfərin üçüncü kəsə beyət etməsi ilə imamlıq qüvvəyə minir və əl-Məvardi bu rəyi kufəlilərə nisbət edir, Abdulqahir əl-Bağdadi isə bunu Süleyman bin Cərir əz-Zeydi'yə və bir qrup mötəzililərə nisbət edir. Lakin əşarilərin və zeydilərin əksəriyyətinin rəyi budur ki, həll və əqd əhlindən tək bir nəfərin beyəti kifayət edir. Təfsir alimi Əbu Abdilləh əl-Qurtubi də bu rəydə olub. Biz bu görüşlərdən axırıncı görüş üzərində duracağıq, çünki digər sayları şərt görənlərin görüşləri ümumiyyətlə heç bir etibar qazanmayıb, amma bir nəfərin beyətini kifayət görmək görüşünü qəbul etmiş böyük fəqihlərimiz və alimlərimiz olub. Kəlam əhlindən bu rəydə olanlar isə mütləq şəkildə bir nəfərin beyəti ilə kifayətlənməyi qəsd etmirlər, bəzi şərtləri də qeyd edirlər. Biz burada o şərtlərdən bəzilərinə nəzər salacağıq.

Qeyd etdikləri ilk şərt həmin bir nəfərin müctəhid olmasıdır. Şafi'i alimi Süleyman bin Muhəmməd bin Ömər əl-Buceyrami görüşləri zikr etdikdən sonra deyir:

“وَهُوَ اشْتِرَاطُ وُجُودِ الْعَدَدِ فَمَنْ اكْتَفَى بِوَاحِدٍ اشْتَرَطَ فِيهِ أَنْ يَكُونَ مُجْتَهِدًا”

**“... və bu, sayın olmasını şərt görmə görüşüdür. Beləliklə də kim bir nəfərlə kifayətlənirsə onun müctəhid olmasını şərt görür.”**[44]

Bu sözlərdən çıxardığımız nəticə budur ki, bir nəfərin beyətini kifayət hesab edənlər həmin nəfərin müctəhid olmasını şərt görüblər. Əşari mütəkəllim alim Əbu Mənsur Abdulqahir əl-Bəğdədi bununla bağlı Əbul-Həsən əl-Əşari'nin rəyini təqdim edərkən deyir:

[44]“Haşiyətul-Buceyrami alə Şərhil-Mənhəc”, 4/204;

“فقال أبو الحسن الأشعري أن الإمامة تنعقد لمن يصلح لها بعقد رجل واحد من أهل الاجتهاد والورع إذا عقدها لمن يصلح لها فإذا فعل ذلك وجب على الباقين طاعته وإن عقدها مجتهد فاسق أو عقدها العالم الوَرِعُ لمن لا يصلح لها لم ينعقد تلك الإمامة كما أن النكاح ينعقد بولي واحد عدل ولا ينعقد بالفاسق عند هؤلاء.”

**“Əbul-Həsən əl-Əşari deyir ki, ictihad və vəra əhlindən olan bir nəfərin (imamlıq) əqdi(ni) - əgər ona yarayan biri üçün (əqdi) bağlayarsa – bağlaması ilə imamlıq o vəzifəyə yarayan biri üçün qüvvəyə minir. Əgər bunu edərsə digərlərinə ona itaət etmək vacib olur. Əgər bunu fasiq bir müctəhid bağlayarsa və ya vəra sahibi alim bunu bu vəzifəyə yaramayan biri üçün bağlayarsa o imamlıq qüvvəyə minməz, necəki nikah adil bir vəli ilə qüvvəyə minir və onlara görə fasiq ilə qüvvəyə minməz.”**[45]

Burdan da anlaşılır ki, Əbul-Həsən əl-Əşari həmin bir nəfərin beyətini məqbul sayarkən bunun üçün şərtlər qoyur. Birinci şərt beyət edən həll və əqd əhlinin ictihad əhli olması, ikinci şərt isə imamlıq əqdini vəzifəyə yarayan biri üçün bağlamasıdır. Ona görə əgər fasiq biri ictihad əhli olsa da onun beyəti kifayət etmir, həmçinin imamlıq məqamına yaramayan birinə vəra, təqva və ictihad əhli biri beyət edərsə bu da keçərli deyildir.

Hənəfi məturidi üləmasından Qadi əs-Sadr Əbu Yusr Muhəmməd ibn Abdilkərim əl-Bəzdəvi (hicri 421-493) isə əl-Əşari’nin rəyini bu şəkildə bizə nəql edir:

“وحُكي عن الأشعري أنه قال إذا عقد واحد من العلماء من أهل الرأي والتدبير وهو مشهور لواحد هو أفضل الناس عقد الخلافة يصير خليفة كما عقد أبو بكر لعمر رضي الله عنهما.”

**“əl-Əşari’dən onun belə dediyi nəql olunur ki, əgər rəy və tədbir əhli sayılan alimlərdən məşhur olan bir nəfər xilafət əqdini insanların ən fəzilətlisi üçün bağlayarsa bununla xəlifə olar, necə ki, Əbu Bəkr bunu Ömər – Allah hər ikisindən də razı olsun! – üçün bağlamışdır.”**[46]

əl-Bəzdəvi’nin sözləri isə beyət edənin sadəcə müctəhid alim olmasını yox, həm də onun ümmət yanında məşhur olmasını da nəzərə alır. Əşari mütəkəllim alimlərindən bir başqası Əbul-Həsən Əli bin Abdirrahmən əl-Yəfrani ət-Tanci (vəfatı hicri 734) “əl-Məbəhisul-Aqliyyə fi Şərhi Məanil-Aqidətil-Burhəniyyə” kitabında deyir:

---

[45]“Usulud-Din”, əl-Bağdadi, səh: 280-281

[46]“Usulud-Din”, əl-Bəzdəvi, səh: 194;

“الإمامة تنعقد لمن يصلح لها بعقد رجل واحد من أهل الحل والعقد إذا كان عالما بالكتاب والسنة موصوفا بالعدالة والورع فإذا عقدها من هذا وصفه وجب على الناس طاعته وإلا فلا تنعقد له.”

**“İmamlıq həll və əqd əhlindən bir nəfərin - əgər o, kitab və sünnəti bilən bir alimdirsə, ədalət və vəra ilə vəsf olunursa - əqdi bağlaması ilə (məqama) yararlı olan biri üçün bağlanır/qüvvəyə minir, beləliklə də bu cür vəsf olunan biri imamlıq əqdini bağlayarsa insanlara ona itaət etmək vacib olur, əks təqdirdə isə (imamlıq) onun üçün keçərli olmaz.”**[47]

Beləliklə də mütəkəllimlərin nəzərində imam məqamı üçün beyət edəcək şəxslər siravi kəslər yox, ümmətin içində tanınmış, ictihadı ilə seçilən və Kitab və sünnəti bilən alim olmalıdır, üstəlik adillik, təvqa və vəra kimi xüsusiyyətlər ilə vəsf olunmalıdır. Yalnız bu cür sifətlərə sahib biri tək başına imamlığa layiq olan bir nəfərə beyət edərsə o zaman mütəkəllimlərə görə imamlıq əqdi bağlanmış olur, qüvvəyə minir və itaət vacib olur, əks təqdirdə isə keçərli deyildir. Alləmə Əbu Muhəmməd İbn Həzm əl-Əndəlusi əz-Zahiri deyir:

“ذهبت طوائف من الْخَوَارِج وَطَوَائِف من الْمُعْتَزلَة وَطَوَائِف من المرجئة مِنْهُم مُحَمَّد بن الطّيب الباقلاني وَمن اتبعهُ وَجَمِيع الرافضة من الشِّيعَة إِلَى أَنه لَا يجوز إِمَامَة من يُوجد فِي النَّاس أفضل مِنْهُ”

**“Xaricilərdən bəzi qruplar, mötəzililərdən bəzi qruplar və mürciələrdən bəzi qruplar – Muhəmməd bin ət-Tayyib əl-Bəqilləni və ona tabe olanlar da bunlardandır – və şiələrdən ibarət rafizilərin hamısı bu görüşdədirlər ki, insanların arasında ondan fəzilətli birisi olan kəsin imamlığı caiz deyildir.”**[48]

İbn Həzmin bu nəqlini əşari alimləri də təsdiqləyirlər. Hətta bunun Əbul-Həsən əl-Əşari’nin məzhəbi olduğunu da qeyd edirlər və əl-Bəzdəvi’dən gətirdiyimiz nəql bu görüşün ona nisbətini təsdiqləyir. Bu görüşün tələbi budur ki, əgər imamlıq məqamına layiq olan biri varsa, yəni bütün şərtləri ödəyən biri varsa, lakin bu məqama layiq olan başqa biri ondan daha fəzilətlidirsə o zaman birinci kəsə edilən beyət keçərli deyildir və onun imamlığı səhih deyildir. Qeyd edək ki, mütəaxxir əşarilər bu görüşün qeyri-real olması səbəbi ilə onu tərk ediblər, amma etiraf edirlər ki, mütəqaddim əşarilər bu rəydə olublar.

Məqalə yazaraq bəzi mütəkəllimlərdən nəql gətirmək yolu ilə bir nəfərin belə beyəti ilə imamlığın səhih olacağı təsəvvürünü formalaşdırmaq oxucuları

---

[47]“Risalətən fil-İmamətil-Uzmə”, səh: 38
[48] “əl-Fəsl minəl-Miləli van-Nihəl”, 4/126;

aldatmaqdır. Bu ya məsələni yaxşı araşdırmamaqdan, ordan burdan tapılan məlumatlarla tələsik bir nəticəyə gəlməkdən qaynaqlanır, yaxud da təəssübkeşliyin məhsuludur. Həqiqət budur ki, bir nəfərin beyəti ilə kifayətlənən mütəkəllimlər digər tərəfdən daha ağır şərtlər qoyublar; beyət edənin müctəhid olmasını, beyət edilən kəsin ümmətin ən əfzəli olmasını şərt görüblər.

Bu barədə yazdıqdan sonra onu da əlavə edək ki, bəzi mütəkəllim və fəqih alimlər bu görüş üçün irəli sürülmüş dəlilləri tənqid ediblər və bu rəylə bağlı etiraz bildiriblər. Maliki fəqihlərindən Əbu Abdilləh Muhəmməd bin Xalifə əl-Ubbi öz şeyxi maliki fəqihi, məşhur üsulçu alim Muhəmməd İbn Arafə əl-Varğami'nin (hicri 716-803) bu barədə sözlərini nəql edərək deyir:

> "وكان الشيخ يضعف هذا الاحتجاج ويقول إنه ليس بشيء لأن عقدها لعمر وعثمان إنما كان بإجماع الصحابة على ذلك" قال: "وإنما يحتج بعقدها لواحد بمسألة الإجماع إذا لم يكن في العصر إلا مجتهد واحد فإنه يتقرر ويكون قوله إجماعا وكذلك إذا لم يبق من أهل الحل والعقد إلا واحد وعقدها لواحد فإنها تنعقد."

> "**Şeyx (yəni İbn Arafə) bunu dəlil kimi istifadə etməyi zəif sayardı və bunun bir şey olmadığını deyərdi, çünki imamlığın Ömər və Osman üçün bağlanması səhabələrin bunun üzərində icma etmələri ilə baş vermişdi. Dedi: "Bir nəfərin əqdi bağlaması leyhinə, əsrdə tək bir müctəhidin olması halında icma məsələsini dəlil göstərmək olar, çünki (bu halda) sabit olur və onun rəyi icma sayılmış olur, həmçinin həll və əqd əhlindən tək bir nəfərin qalması və imamlığı bir nəfər üçün bağlaması da bunun kimidir, belə ki, bu halda (imamlıq) keçərlidir/qüvvəyə minir.**"[49]

Bir sözlə İbn Arəfə burada etiraz edərək deyir ki, həll və əqd əhlinin çox olduğu halda onlardan birinin beyət etməsi ilə imamlıq qüvvəyə minməz. Lakin əgər bir nəfərdən başqa ümmətdə müctəhid olmazsa o zaman onun rəyi icma sayıldığı üçün onun beyəti də icma qüvvəsində olur. Bu halda İbn Arəfə'yə görə belə birinin beyət etməsi ilə imamlıq əqdi qüvvəyə minər. Raşidi xəlifələrin xəlifəlik vəzifəsinə seçilmələrinin yalnız bir nəfərin beyəti ilə baş verdiyini deyərək bunu öz məzhəbləri üçün dəlil gətirən mütəkəllimlərin bu cür istidlal etmələrini doğru hesab etmir, çünki onlardan heç biri bir nəfərin beyəti ilə imam olmamışdır; Ömərin və Osmanın xəlifə seçilməsinin səhabələrin icması ilə baş verdiyinə diqqət çəkir. Alləmə üsulçu Əbu Muhəmməd Abdulqadir bin Əli əl-Fəsi (hicri 1007-1091) "Risələtun fil-Xiləfətil-Uzmə" adı ilə çap olunmuş kitabında mütəkəllimlərin rəyinə qarşı İbn Arafə'nin bu etirazını zikr etmiş və ona etiraz etməmişdir.

[49]"İkməlu İkməlil-Muslim", 5/164

## Mütəkəllimlər ilə şafi'ilərin rəyi üzərinə

Burada əlavə edərək deməliyik ki, bu məsələdə mütəkəllim alimlər ilə şafi'i fəqihlərinin bir-birinə təsiri olmuşdur. Ona görə də şafi'i fəqihlərindən bəziləri bu mövzunu müzakirə edərkən həm məzhəbin fəqihlərinin rəyini, həm də ümumən mütəkəllimlərin rəyini qeyd edirlər, çünki məsələ ilə bağlı danışmış əl-Cuveyni, əl-Ğazzəli, əş-Şəhristani, əl-Adud əl-İyci kimi mütəkəllimlər şafi'i olublar. Şafi'ilərin ən tanınmış fəqihlərindən sayılan, İbn Teymiyyə'nin də təriflədiyi böyük alim İbnur-Rif'a adı ilə tanınan Əbul-Abbas Nəcmuddin Əhməd bin Muhəmməd əl-Ənsari (hicri 645-710) bu barədə şah əsəri "Kifəyətun-Nəbih"də geniş bir müzakirə açmışdır. Fayda üçün onun sözlərini burada zikr etmək istəyirik. İbnur-Rif'a sözlərinə belə başlayır:

"وما المراد بالجماعة التي تنعقد بهم الإمامة؟ اختلف فيهفقيل: هم جمهور أهل الحل والعقد من كل بلد، ليكون الرضا به عاما. فقال الماوردي: وهذا مذهب مدفوع ببيعة أبي بكر - رضي الله عنه- على الخلافة[باختيار] من حضرها، ولم ينتظر في التصرف من غاب عنها."

"**İmamlığın onların beyəti ilə qüvvəyə mindiyi camaat ilə qəsd olunan kimlərdir? Bu barədə ixtilaf edilib və deyilib: onlar hər bir ölkədən həll və əqd əhlinin cumhurudur ki, bununla (imam üzərində) razılıq ümumi olsun. əl-Məvardi dedi: "Bu, rədd edilmiş bir məzhəbdir, çünki Əbu Bəkrə – radiyallahu anhu – xilafət barəsində orada iştirak edənlərin seçimi ilə beyət edildi və (xəlifə olaraq) təsərruf etmək üçün orada iştirak etməyənlərin cavabını gözləmədi.**"

Beləliklə də burada hər bir müsəlman ölkəsinin, bölgəsinin həll və əqd əhlinin əksəriyyətini şərt görən görüş rədd edilir. Bundan sonra İbnur-Rif'a sözünə davam edərək deyir:

"وقيل: هم [أهل الحل والعقد من العلماء والرؤساء ووجوه الناس، ولا يشترط اتفاق] أهل الحل والعقد في سائر البلاد والأصقاع، بل إذا وصل الخبر إلى اهل البلاد البعيدة فعليهم الموافقة والمتابعة، قال القاضي الحسين وهذا كما قلنا في الإجماع في الأحكام المجتهدات: ((لا تنعقد إلا باجتماع أهل الحل والعقد [عليه]، يعني: معظمهم إذ لم يتصور اجتماعهم، لتفاحش ما بينهم من التباعد، وهذا أصح عند البغوي والرافعي، وقال تفريعا عليه: إنه لا يتعين فيه عدد فلوتعلق الحل والعقد بواحد مطاع كفت بيعته لانعقاد الإمامة، وهذا سنذكره عن الإمام."

"**Deyilib ki, onlar alimlərdən, rəhbərlərdən və insanların liderlərindən ibarət həll və əqd əhlidir və digər şəhər və**

**bölgələrdəki həll və əqd əhlinin ittifaq etməsi şərt deyildir, lakin uzaqda yaşayan ölkələrin əhalisinə xəbər çatarsa onlara razı olmaq və tabe olmaq vacib olur. əl-Qadi əl-Hüseyn deyir və bu, dediyimiz kimi ictihadi hökmlər ilə bağlı icma haqqındadır: "(İcma) yalnız həll və əqd əhlinin onun üzərində birləşməsi ilə bağlanır." Bununla onların əksəriyyətini qəsd edir, belə ki, aralarındakı uzaqlığın böyük olması səbəbi ilə onların bir araya gəlməkləri təsəvvür edilməzdir. Bu rəy əl-Bəğavi və ər-Rafi'inin nəzərində ən səhih rəydir. Burdan daha bir məsələ çıxararaq deyir ki, bunda hansısa say vacib deyildir, həll və əqd itaət olunan bir nəfərdən asılı olarsa imamlığın qüvvəyə minməsi üçün onun beyəti kifayət edir. Bunu biz İmamdan zikr edəcəyik.**"

Şafi'i alimləri İmam dedikdə qəsd etdikləri İmamul-Harameyn əl-Cuveyni'dir. Başa düşmək olur ki, İbnur-Rif'a şafi'i məzhəbinin görüşünün əl-Cuveyni'nin izahı ilə uyğun olduğunu qeyd edir. Sözünün davamında İbnur-Rif'a digər görüşləri də qeyd edir və sonunda mütəkəllimlərin görüşünü zikr edərək deyir:

"وقيل [: إنها] تنعقد بواحد، لأن العباس قال لعليّ: امدد يدك أبايعك، فيقول الناس: عم رسول الله - بايع ابن عمه، فلا يختلف عليك اثنان. وهذا ما حكاه العمراني في ((الزوائد)) عن القاضي في كتاب الجنايات..."

**"Deyilib ki, imamlıq bir nəfər(in beyəti) ilə də bağlanır, çünki Abbas Əli'yə demişdir: Əlini uzat ki, sənə beyət edim və insanlar desinlər ki, Allahın elçisinin əmisi öz əmisi oğluna beyət etdi və sənin barəndə iki nəfər belə ixtilaf etməsin. Bunu əl-İmrani "əz-Zəvaid" kitabında əl-Qadi'dən "əl-Cinəyət" kitabından hekayət etmişdir...**"

Diqqət etməliyik ki, İbnur-Rif'a da burada mütəkəllimlərin görüşü ilə şafi'ilərin görüşü arasında fərq qoymuşdur və mütəkəllimlərin görüşlərini zəif saydığı rəylər arasında qeyd etmişdir. Daha əvvəl şafi'ilərin rəyini zikr etdikdə əl-Cuveyni'nin sözlərini zikr edəcəyini söyləmişdi və davamında həmin sözlərə yer verir:

"وقال الإمام إن الأئمة [كما] اختلفوا في عدد العاقد اضطربوا في اشتراط حضور الشهود، فرأى بعضهم: أن الإمامة تنعقد سرا بعقد من هو من أهل الحل والعقد، وزيف القاضي هذا المذهب، وتناهى مبالغا في الرد على معتقده، وسلك مسلك القطع فيما زعم، وقال: إن عمر لو استخلى بالبيعة لأبي بكر لما استقرت الإمامة، وأن على هذا قد اختلف الصائرون إليه، فاكتفى بعضهم بحضور شاهدين كعقد النكاح، وقال القاضي: لا يكتفى بهما بل يشترط حضور قوم يحصل بحضورهم الإشاعة والنشر والإذاعة.

وحكى العمراني عن القاضي انه قال: إذا اعتبرنا شاهدين، فعندي أنه يشترط عدالتهما ظاهرا وباطنا، بخلاف النكاح، لأن في اعتبار العدالة الباطنة في النكاحمشقة لأنه يعقده آحاد الناس فلو كلفناهم ذلك شق عليهم."

> **”İmam dedi: İmamlar əqdi bağlayanların sayında ixtilaf etdikləri kimi şahidlərin iştirak etməsinin şərt olmasında da qarışıq fikirlər bildiriblər. Bəzilərinin rəyi bu olub ki, imamlıq həll və əqd əhlindən olan bir nəfərin beyəti ilə gizlində də bağlana bilər. əl-Qadi bu məzhəbin kökdən batil olduğunu demiş və bu məzhəbə etiqad edənləri son dərəcə şiddətlə rədd etmişdir və iddia etdiyinə görə tutduğu mövqeyi qətiyyətə dayanır. Dedi: ”Ömər əgər Əbu Bəkrə xəlvətdə beyət etsəydi imamlıq istiqrar tapmazdı” və buna görə bu rəydə olanlar ixtilaf ediblər; bəziləri nikah əqdində olduğu kimi iki şahidin iştirakı ilə kifayətləniblər. əl-Qadi isə deyir: ”Bu ikisi ilə kifayətlənmək olmaz, lakin elə bir camaatın iştirak etməsi şərtdir ki, onların iştirakı ilə xəbər tam yayılsın, elan edilsin.”**
> **əl-İmrani əl-Qadi’dən onun belə dediyini hekayət edir: “Əgər iki şahidi etibara alsaq o zaman mənə görə onların zahirən və batinən adil olmaqları şərtdir, bu baxımdan nikahdan fərqlənir, çünki nikahda batində adil olmağı etibara almaq məşəqqətdir, çünki nikah əqdini siravi insanlar kəsirlər, əgər onlara bunu vacib etsək onlara çətin olar.”**

Sözünün davamında İbnur-Rif’a mütəkəllimlərdə məşhur olan rəy ilə əl-Cuveyni’nin rəyi arasında fərqə işarə edərək onun sözlərini nəql etmişdir:

> "وقد حكى الإمام قول من قال: إنها تنعقد بواحد -أيضا- وقال: إن القاضي أبا بكر ارتضاه، وهو المنقول عن شيخنا أبي الحسن، وإنه أقرب إلى المذاهب، ووجهه بأن الإجماع ليس شرطا في هذا العقد إجماعا، ثم لم يثبت توقيف في عدد مخصوص، وليس بعض الأعداد اولى من بعض، فلزم المصير إلى الاكتفاء بالواحد، لأن العقود في الشرع يتولاها عاقد واحد، وكلام القاضي يشير إلى أن هذا مقطوع به، ولست اراه بالغا مبلغ القطع، فإن أبا بكر - رضي الله عنه - لما بايعه عمر - رضي الله عنه - لو ثار ثائرون وأبدوا صفحة الخلاف، ولم يرضوا تلك البيعة - لما كنت أجد متعلقا في أن الإمامة كانت تستقل ببيعة واحد، وكذلك لو فرضت بيعة اثنين أو أربعة فصاعدا، وقدرت ثوران مخالفين لما وجدت متمسكا به اكتراث واحتفال في قاعدة الإمامة، ولكن لما بايع عمر تبايعت الأيدي، واصطفت الأكف، واتسعت الطاعة، وانعقدت الجماعة، فالوجه عندي في ذلك: أن يعتبر في البيعة حصول مبلغ من الأتباع والأنصار والأشياع يحصل بهم شوكة ظاهرة وبيعة قاهرة، بحيث لو فرض ثوران خلاف لما غلب على الظن أن يصطلم اتباع الإمام، فإذ ذاك تثبت الإمامة وتستقر، ومما يدل على ذلك اتفاق العلماء قاطبة على أن رجلا من أهل الحل والعقد لو استخلى بمن يصلح للإمامة، وعقد له البيعة، لم تثبتالإمامة إلا ان يكون الواحد مطاعا في قومه كثير الأتباع [بحيث يفيد أتباعه ما ذكرناه. قال: ولأجل هذا لم أر أن يكون العاقد للإمامة] مجتهدا، [ولكني أشترط] ان يكون المبايع ممن يفيد مبايعته مُنّة واقتهارا..."

**“Imam “imamlığın bir nəfərin beyəti ilə qüvvətə minir” deyənlərin rəyini də hekayət etmiş və dedi: əl-Qadi Əbu Bəkr bu rəylə qane olmuşdur və bu, şeyximiz Əbul-Həsəndən nəql edilib və bu, məzhəblərə ən yaxın olandır. Bu rəyin üzərində durduğu əsas isə budur ki, alimlər icma ediblər ki, imamlıq əqdində hər kəsin icma etməsi şərt deyildir, sonra müəyyən bir sayla bağlı dəlil də sabit olmamışdır və saylardan bəzisi digərlərindən üstün deyildir, ona görə də bir nəfərlə kifayətlənmək rəyini götürmək lazımdır və çünki şəriətdə əqdləri həyata keçirən bir nəfər olur. əl-Qadi’nin sözü onu göstərir ki, onun qəbul etdiyi rəy qətidir, lakin mən bu rəyin qətiyyət dərəcəsinə çatdığını düşünmürəm. Belə ki, əgər Ömər – radiyallahu anhu – Əbu Bəkrə - radiyallahu anhu – beyət etdikdə üsyan edənlər üsyan etsəydilər, müxaliflik üzünü göstərsəydilər və bu beyətlə razılaşmasaydılar, o zaman mən bir nəfərin beyəti ilə imamlıqda yetiniləcək rəyi üçün əsaslanacağım bir əsas tapa bilməyəcəkdim. Eyni şəkildə əgər iki nəfərin və ya dördünün və ya daha çoxunun beyət etdiyi fərz edilsəydi və müxaliflərin üsyan etməsi fərz edilsəydi, imamlıq qaydası ilə bağlı əsaslana biləcəyim bir şey tapa bilməzdim ki, onda əhəmiyyət olsun, könül sevindirsin. Lakin Ömər beyət etdikdə arxasınca digər (beyət) əllər(i) də uzandı, ovuclar sıxıldı, itaət genişləndi və camaat boyun əydi.Bu məsələdəən əsas olan mənim nəzərimdə budur; beyətdə tabe olanlardan, dəstəkçilərdən və tərəfdarlardan elə bir məbləğin hasil olması etibara alınmalıdır ki, onlarla (yeni imam üçün) aşkar bir qüdrət, üstün bir hegemonluq ortaya çıxır, o dərəcədə ki, əgər ortada bir müxalifət üsyanı fərz edilərsə (bunun nəticəsində) imama tabe olanların məğlub edilməsi barədə adamda ciddi bir güman olmaz.Bax bu zaman imamlıq sabit olur, istiqrar tapır. Buna dəlalət edən tərəflərdən biri də budur ki, alimlər yekdilliklə ittifaq ediblər ki, həll və əqd əhlindən bir nəfər imamlığa yarayan biri ilə xəlvətə tək qalarsa və ona beyət edərsə onun imamlığı sabit olmaz, lakin istisna hal budur ki, həmin tək nəfəröz qövmündə itaət olunan biridir vəona tabe olanlar çoxdur; o dərəcədə ki, ona tabe olanlar bizim dediyimiz mənaya uyğun gəlsin. Dedi: Bu səbəbdən imamlıq əqdini bağlayanın müctəhid olması rəyində deyiləm, lakin beyət edənin beyət etməsinin qüdrət və güc ifadə edən kəslərdən olmasını şərt görürəm...”**[50]

Beləliklə də İbnur-Rif’a burada əl-Cuveyni’nin sözlərini bir qədər müxtəsər şəkildə zikr etməklə onun görüşünün mütəkəllimlərdəki məşhur görüşdən fərqli, şafi’ilərin isə görüşünə müvafiq olduğunu göstərir. əl-Cuveyni’nin rəyini təhrir etdikdə məlum oldu ki, ona görə etibara alınan həll və əqd əhlindən beyət edənlərin sayı deyildir, lakin beyət nəticəsində ümmətin üzvlərindən əldə edilən dəstək və tabe olan insanların çoxluğu, dolayısıyla da güc və qüdrətdir. Ona görə də bu məqamda mütəkəllim şafi’i alimi Abdulkərim əş-Şəhristani’nin izahı da

[50]“Kifəyətun-Nəbih fi Şərhit-Tənbih”, 18/9-12

yerinə düşür və onun sözləri daha öncə zikr olundu, lakin bir daha təkrarlamaqda zərər yoxdur. Əbul-Fəth Abdulkərim əş-Şəhristəni deyir:

“ولو عقد واحد ولم يسمع من الباقين نكير كفى ذلك”

> “**Əgər (həll və əqd əhlindən) bir nəfər (imamlıq əqdini) bağlayarsa və digərlərindən bunu inkar etdikləri eşidilməzsə bu, kifayət edər.**”[51]

Bu da əl-Cuveyni’nin sözlərinə yaxındır, çünki tələb olunan dəstək şübhəsiz ki, həll və əqd əhlinin müxalifət göstərməsi ilə yox, onların müvafiq olması ilə əldə edilir. Diqqət etmək lazımdır ki, əl-Cuveyni etiraf edir ki, mütəkəllimlərin bir nəfərin beyəti rəyi üçün dayandıqları yeganə dəlil Ömərin Əbu Bəkrə və Abdurrahmən bin Avf’ın Osmana beyətidir. əl-Cuveyni etiraf edir ki, əgər bu tarixi hadisələrdə üsyan edənlərin üsyan etməsi fərz olunarsa o zaman imamlıq sabit olmayacaqdı, ona görə də əl-Cuveyni bu dəlilin özlüyündə kifayət etmədiyinə işarə edir. Burada önəmli olanın bir nəfərin beyəti ilə digər həll və əqd əhlinin də ona tabe olmasıdır. Yuxarıda qeyd etdik ki, İbn Arafə mütəkəllimlərin bu məsələdəki dəlillərinin doğru olmadığını söyləyib. O zaman qarşımızda belə bir mənzərə canlanır:

Əbul-Həsən əl-Əşari və ona tabe olmuş Əbu Bəkr əl-Bəqilləni kimi mütəkəllimlər bir nəfərin beyətinin kifayət edəcəyini dediklərində həmin bir nəfərin adil müctəhid olmağını şərt görürlər. Mütəkəllimlərin içərisində zahirən bu görüşə müvafiq olan, batinən isə təfsilatında daha fərqli bir nəticəyə gələnlər olub və onların başında Əbul-Məali əl-Cuveyni və Əbu Həmid əl-Ğazəli kimi alimlər durur. Bu mütəkəllimlərin görüşünü digərlərindən fərqləndirən budur ki, bunlara görə beyəti yetərli olan bir nəfər həll və əqd əhlindən elə biri olmalıdır ki, onun beyətinə ümmətin böyük bir hissəsi, əl-Ğazəli’nin təbiri ilə desək ümmətin əksəriyyəti tabe olsun, çünki hər iki alimə görə imamlıqda etibara alınan imam olaraq seçiləcək kəsə tabe olan güc və qüdrətdir, onu dəstəkləyəcək, ona tabe olacaq insanların çoxluğu və onların sağlayacağı hegemonluqdur. Bu rəy mahiyyət etibarı ilə Şeyxul-İslam İbn Teymiyyə’nin dediyindən çox fərqlənmir, aradakı fərq budur ki, Şeyxul-İslam İbn Teymiyyə’yə görə reallıqda belə bir dəstək bir nəfərin beyəti ilə hasil olmur, lakin həll və əqd əhlinin əksəriyyətinin beyəti ilə hasil olur.

Mütəkəllimlərdən əl-Əşari’nin rəyinə gəldikdə isə bir daha təkrar edirik ki, əsaslandıqları dəlillər Ömərin Əbu Bəkrə beyət etməsi, Abdurrahmən bin Aufun Osmana beyət etməsi kimi dəlillərdir və alimlər bu dəlillərin onların görüşünü dəstəkləmədiyini deyirlər, necə ki, İbn Arəfə’dən bu barədə varid olmuş nəqli təqdim etdik. Mötəzililərdən və qeyrilərindən “iki nəfərin beyəti”, “üç” və ya “dörd” və ya “beş” və ya “qırx nəfərin beyəti” şəklindəki görüşlərə gəldikdə isə bunları fəqihlər, üsulçular, hədis alimləri və mütəkəllimlər inkar edirlər. Ona görə də bu yazımızda biz o rəylər üçün yer ayırmadıq.

[51]“Nihəyətul-Əqdəm”, səh: 494

## Müasir alimlərin rəyi

Malikilərin, hənbəlilərin, Şeyxul-İslam İbn Teymiyyə'nin rəyi müasir alimlərimizin əksəriyyəti tərəfindən də qəbul edilmiş rəydir. Bu barədə öz təhqiqatlarında bu rəyə üstünlük verirlər. Misal üçün Misirin böyük alimlərindən Şeyx Muhəmməd bin Afifi əl-Bəcuri (1289/1872 – 1345/1927) "İtməmul-Vafə fi Siratil-Xuləfə" kitabında deyir:

"ولا يلزم إجماع ذوي الحل والعقد على المنتخب بل المعتبر الأغلبية وهي ما زاد على نصف المجتمعين"

**"Həll və əqd sahiblərinin seçilən kəs üzərində icma etmələri vacib deyildir , lakin etibara alınan çoxunluqdur və bu, iştirak edənlərin yarısından çox olan hissədir..."**[52]

Həmçinin hindistanlı hənəfi mühəddisi və fəqihi Alləmə Muhəmməd Ənvərşah əl-Kəşmiri (1292/1875 – 1352/1933) deyir:

"ثم اعلم أن الحديثَ يَدُلُّ على أن العِبْرَةَ بمعظم جماعة المسلمين، فلو بايعه رجلٌ واحدٌ، أو اثنان، أو ثلاثة، فإنه لا يكونَ إمامًا ما لم يُبَايِعْهُ معظمُهُمْ، أو أهلُ الحَلِّ والعقدِ. والمنقولُ عن الأشعريِّ خلافه، ولم أَرَهُ إلاَّ في الفتوحات."

**"Sonra bil ki, hədis dəlalət edir ki, etibara alınan müsəlman camaatının əksəriyyətidir, əgər ona bir nəfər və ya iki və ya üç nəfər beyət edərsə bununla imam olmaz, ta ki, onların əksəriyyəti və ya həll və əqd əhli beyət etməyənə qədər. əl-Əşari'dən nəql olunan isə bunun əksidir və bunu mən "əl-Futuhət" kitabından başqasında görmədim."**[53]

Eləcə də Şeyx Mustafa Sabri, Şeyx Abdulhəyy əl-Kəttəni, Şeyx Muhəmməd Raşid Rida, Şeyx Muhəmməd əl-Xidir Huseyn, Şeyx Muhəmməd Əbu Zəhra, Şeyx Muhəmməd əl-Əmin əş-Şənqiti, Şeyx Tahir İbn Aşur və başqaları bu rəydə olublar. Həmçinin hənbəli mədrəsəsinin yetirmələri sayılan Şeyx İbn Useymin, Şeyx İbn Baz kimi alimlər də bu rəydə olublar və Səudiyyə Ərəbistandakı alimlərin çoxu bu görüşdədirlər və İbn Teymiyyə'nin məzhəbini izləyirlər. Onun

[52] "İtməmul-Vafə", səh: 9
[53] "Feydul-Bəri alə Sahih əl-Buxari", 4/455;

məzhəbi isə daha öncə təhrir olundu. Həmçinin əşari və maturidi məktəbini müasir zamanımızda təmsil edən alimlərin əksəriyyəti də bu fikirdədirlər. Mövzu haqqında araşdırma etmiş mütəxəssis doktorlar da bu rəyə üstünlük verirlər.

# Xülasə

Biz daha əvvəlki səhifələrdə təqdim etdiyimiz görüşləri yekun olaraq bu gün iddia edilən xilafətin təsisinə tətbiq edək. İddia olunan bu xilafətin elan edilmə şəklini, əsaslarını bu rəylər işığında dəyərləndirməyimiz işin təbii nəticəsidir. Çünki əks təqdirdə bu rəyləri təhrir etməyin bir faydası olmazdı.

İlk öncə qeyd edək ki, malikilərə və hənbəlilərə görə bu şəkildə xilafətin elan edilməsi batildir, çünki hər iki məzhəbə görə ümmətin əksəriyyətini təmsil edən həll və əqd əhlinin cumhuru beyət etməmişdir. Bu iki məzhəbin üzərində durmağa ehtiyac yoxdur, düşünürəm ki, oxucular üçün də bu aydın bir məsələdir.

İkinci yerdə biz hənəfilərin rəyi üzərində durmağımız lazımdır. Burda sual çıxır ortaya. Xilafəti elan edənlər, yəni xəlifəyə beyət edənlər İbn Nuceym əl-Hənəfi'nin dediyi kimi ümmətin "**ən şərəfliləri və statusu ən yüksək olanlarıdır**"?! Yoxsa ümmət tərəfindən tanınmayan, yalnız məhdud və məxsus dairələrdə tanınan, kimlikləri ümmətə gizli qalan və ümmətin tabe olmadığı, izləmədiyi kəslərdir?! Şübhəsiz ki, insaf sahibi bir kəs onların ümmət içində tananmayan, məchul olan kəslər olduğunu təsdiqləyəcək, çünki hələ bu günə qədər də məzum xəlifəyə beyət edənlərin kimlər olduğu bilinmir. Üstəlik hənəfi fəqihlərinin beyət edənlərin ümmətin ən şərəfliləri, məqamları ən ali olmaqlarını etibara almaqlarının səbəbi vardır. Səbəb isə budur ki, ümmət yalnız bu cür kəslərin beyətinə tabe olur, yoxsa məchul və tanınmayan kəslərin beyətinə tabe olmaz.

Mövcud halı şafi'i fəqihlərinin rəyi ilə dəyərləndirmək üçün bəzi məqamlara yaxından baxmağımız lazımdır. Şafi'ilər beyət edənlərin "**alimlərdən, başçılardan və insanların böyüklərindən ibarət həll və əqd əhli**"[54] olmasını şərt görürlər, necə ki, bu ibarə, bu ifadə onların fiqh kitablarında təkrar-təkrar keçir. Beyət edənlərin bu şəkildə ümmətin alimləri, başçıları və rəhbərləri olmasını şərt görməklərinin səbəbi isə budur ki, "**<u>çünki bu iş onların rəyi və ittifaqı ilə düzəlir və digər insanlar onlara tabe olur</u>.**"[55] Şafi'ilər həll və əqd

[54] Bax: "Minhəcut-Talibin", səh: 292; "Minhəcut-Tulləb", səh: 157; "Tuhfətul-Muhtəc", 9/76; "əl-İqna fi Həlli Əlfəzi Əbi Şucə", 2/550; "Muğnil-Muhtəc", 5/422; "Ğayətul-Bəyən bi Şərhi Zubədi İbn Raslən", səh: 297; "Nihəyətul-Muhtəc", 7/410; "əs-Sirac əl-Vahhəc", səh: 518; "Kifəyətun-Nəbih", 18/10; "ən-Nəcmul-Vahhəc", 9/65; "əl-Aziz Şərh əl-Vaciz", 11/73;

[55] Bax: eyni mənbələr

əhlinin hamısının və ya əksəriyyətinin razılaşmasını, beyət etməsini şərt görməsələr də iştirak etmələri asanlıqla mümkün olan həll və əqd əhlinin razılığını şərt görürlər. Onların bir araya gəlməsindəki asanlığı isə əl-Heytəmi'nin, ər-Ramli'nin söylədikləri kimi "**örfən bir çətinlik olmamaq**" şəklində şərh edirlər. Ona görə də əl-Bəğavi deyir: "**Ən səhih olan budur ki, fasiq olmayan, adil olan alimlərdən və liderlərdən ibarət olan və bir-birinə yaxın ölkələrdən olan həl və əqd əhlinin beyət etməsi şərtdir...**" Beləliklə də yaxın ölkələrdən olan həll və əqd əhlinin beyət etməsini şərt görməkdə problem yoxdur, lakin uzaq ölkələrdə yaşayan həll və əqd əhlinin beyət etməsi şərt deyildir. Nə üçün? Çünki o dövrlər qatır və at dövrləri idi. O dövrlərdə kommunikasiya çox ləng və qeyri-əmin idi. Ona görə də yaxın ölkələrdən olan həll və əqd əhli o dövrdəki vaxt anlayışına görə tələb olunan müddət çərçivəsində beyət prosesində iştirak edə bilirdilər, lakin uzaq ölkələrdəki həll və əqd əhlini gözləmək beyətin gecikməsi, ümmətin başsız qalması səbəbi ilə fəsada, hərc-mərcliyə səbəb olacağı üçün onların beyət etməsi şərt sayılmamışdır. Ona görə də İbn Həzm deyir:

"وَلَا حرج وَلَا تعجيز أَكثر من تعرف إِجْمَاع فضلاء من فِي المولتان والمنصورة إِلَى بِلَاد مهرَة إِلَى عدن إِلَى أقاصي المصامدة بل طنجة إِلَى الأشبونة إِلَى جزائر الْبَحْر إِلَى سواحل الشَّام إِلَى أرمينية وجبل القبج إِلَى أسبنجاب وفرغانة وأسروشنه إِلَى أقاصي خُرَاسَان إِلَى الْجُورجَان إِلَى كابل المولتان فَمَا بَين ذَلِك من المدن والقرى وَلَا بُد من ضيَاع أُمُور الْمُسلمين قبل أَن يجمع جُزْء من مائَة جُزْء من فضلاء أهل هَذِه الْبِلَاد فَبَطل هَذَا القَوْل الْفَاسِد"

"**Multan və Mənsura'dan başlayaraq Mihra'ya qədər, Adənə qədər, məsmudilərin yaşadığı ən uzaq yerlərə qədər, hətta Tancə'yə qədər, əl-Əşubunə'yə qədər, okeandakı adalara qədər, Şamın sahillərinə qədər, Ərminiyə və Qabc dağlarına qədər, Əsbancab'a, Fərğanə'yə və Əsruşənəh'ə qədər, Xorasanın ən axırlarına qədər, Curcana qədər, Multanın Kabulu'na qədərki ərazilərdə və bunların arasındakı şəhərlərdə, kəndlərdə yaşayan fəzilət əhlinin icmasını öyrənməkdən daha çox sıxıntı və acizləşdirici hal yoxdur. Bu ölkələrin fəzilət sahiblərinin yüzdə biri bir arada toplanmadan öncə müsəlmanların işlərinin zay olması qaçınılmazdır, ona görə də bu fasid görüş batil olur.**"[56]

[56] "əl-Fəsl fil-Miləl val-Əhva van-Nihəl", 4/129; Multan və Mənsura indiki Pakistanın dörd vilayətindən biri olan Sind vilayətində yerləşən şəhərlərin adıdır. Mihra isə Mərv bölgəsində yerləşən tarixi bir şəhərdir. Adən şəhəri Yəmən torpaqlarında yerləşir. Məsmudilər isə Məğribdə, yəni Mərakeş tərəflərdə olan qəbilələrin yaşadığı yerlərə verilmiş addır. Tancə isə Cəbəllütariq boğazına yaxın yerdə yerləşən bir şəhərdir. əl-Əşubunə isə indiki Portuqaliyanın paytaxtı Lissabon şəhəridir. Okeandakı adalar ilə haranı qəsd etdiyini bilmirəm, lakin ola bilsin ki, Aralıq dənizindəki adaları və ya Madaqaskarın şimalındakı adaları qəsd edir. Şamın sahilləri isə Aralıq

İbn Həzmin əsaslandığı bu etiraz o dövrün reallığından, o dövrün şərtlərindən ortaya çıxan bir etiraz idi və bu, təkcə İbn Həzm'in öz yanaşmasını əks etdirmir, əksinə mütəkəllimlər və şafi'i fəqihləri də bu səbəbdən həll və əqd əhlinin icmasını şərt görənlərin görüşünü rədd ediblər. Əbu Həmid əl-Ğazzəli deyir:

"وباطل أن تعْتَبر إجماع جَميع أهل الْحل وَالْعقد فِي جَميع أقطار الأرض لَأن ذَلك مِمَّا يمْتَنع اَوْ يتَعَذَّر تعذرا يفْتَقر فيه الى انْتِظَار مُدَّة عساها تزيد على عمر الامام فَتبقى الأمور فِي مُدَّة الِانْتِظَار مُهْمَلَةَ"

**"Yer üzünün bütün ölkələrində həll və əqd əhlinin hamısının icmasını etibara almaq da batildir, çünki bu, imkansızdır və ya az qala imamın ömründən uzun olacaq bir müddətdə gözləməyə ehtiyac duyacaq qədər çətindir, o gözləmə müddətində isə işlər ehmal edilmiş olacaq.**"[57]

Həm İbn Həzmi, həm də əl-Ğazzəli'ni öz zamanlarına görə anlamaqda çətinlik çəkmirik, çünki o dövr haqqında qiyabi bir təsəvvürə sahibik. Amma bizim zamanımız təyyarə, qatar kimi sürətli kommunikasiya vasitələrinin hər kəsə açıq olduğu bir zamandır. Başqa sözlə desək bizim örfümüz o dövrün örfündən köklü surətdə fərqlənir. Ona görə də şafi'i fəqihlərinin "**örfən bir çətinlik olmadan**" sözünü o dövrün at, dəvə ilə məhdudlaşan örfünə deyil, bu günün örfünə aid etmək lazımdır. İnternet, telekommunikasiya dövründə ümmətdə bu gün həll və əqd əhli sayıla biləcək hər bir kəsin beyətini almaq - əlbəttə ki, əgər beyət edəcəkləri şəxsin imamlığa layiq olduğunu düşünürlərsə - asanlıqla mümkündür.

O dövrün şərtlərinə görə əgər bir nəfərin imamlığının səhih olması üçün bütün həll və əqd əhlinin beyət etməsini şərt görsəydik və ya əksəriyyətini şərt görsəydik onda xəbərin ümmətin fərqli yerlərində yaşayan həll və əqd əhlinə çatması uzun müddət götürəcəkdi, ondan sonra həmin kəslərin həqiqətən beyət edib etməməsindən əmin olmaq lazım olacaqdı, sadəcə kağızla xəbər göndərmək mötəbər sayılmayacaq və özlərinin şəxsən iştirak edib beyət etməkləri tələb olunacaqdı, bunun üçün həmin kəslərin imamın mövcud olduğu şəhərə gəlməkləri aylar və illər sürə bilirdi. Nəticədə bütün bu proses bir neçə ilə çəkə biləcək qədər uzun bir prosesə çevriləcəkdi. Ona görə də alimlər bu baxımdan bütün həll və əqd əhlinin beyət etməsini şərt görməyiblər.

Bizim zamanımızda isə bu heç bir problem təşkil etmir, bizim zamanımızda problem tamamilə başqadır. Ona görə də fəqihlərin sözlərini mücərrəd hərflər

---

dənizinin sahilləridir. Ərminiyyə ermənilərin yaşadığı bölgələr və Qabc dağları isə Qafqaz dağlarıdır. Əsbancab şəhərinin hara olduğunu təyin edə bilmədim, kitabın başqa çapında bunun yerinə Əsmər sözü keçir. Lakin Fərqanə və Əsruşənəh isə Mavəranəhr tərəfdə, yəni indiki Özbəkistan ərazisində yerləşir. Curcən İranın şimalında yerləşir, kitabın başqa çapında isə Cəvzəcan sözü keçir, bu isə Əfqanıstan ərazisinə düşür.

[57] "Fədaihul-Bətiniyyə", səh: 175;

olaraq nəql etmək və onların arxasındakı mənaları və şərtləri anlamamaq absurd nəticələrə gətirib çıxarır. Biz bunu bəzi kəslərin yazdıqları yazılarda görə bilirik. Məgər İbn Həzmin öz zamanı üçün gətirdiyi arqument bu gün keçərlidirmi? Əlbəttə ki, keçərli deyildir. Bu nöqtəni diqqətdən qaçırmamaq lazımdır və şafi'i fəqihlərinin, hənəfilərin və mütəkəllimlərin sözlərinə bu izahı əlavə etməyimiz zəruridir.

Üstəlik alimlərimizin bu sözləri bir imamdan sonra digər imamın seçilməsi halına aiddir, yəni bir əvvəlki imamın dövründə qorunulan nizam, asayiş və ümumi məsləhətlərin həmin imamın ölümü və ya əzl edilməsi ilə zay olmasın deyə yeni imamın seçilməsini gecikdirmək icazəli görülməmişdir. Bu da digər önəmli bir nöqtədir ki, nəzərdən qaçırılmamalıdır. Çünki bizim zamanımız illərdən və əsrlərdən bəri xəlifənin olmadığı bir zamandır, ümmətin halı onsuz da qəbul edilməz bir surətdədir və imam seçimini gecikdirmək bu halı daha da pis eləmir. Ona görə də bizim zamanımız ilk əsrlərdən fərqlənir. Bunun ən gözəl nümunəsi İbn Abbas'ın rəvayət etdiyi hədisdədir. İbn Abbas deyir:

"كُنْتُ أُقْرِئُ رِجَالًا مِنَ الْمُهَاجِرِينَ، مِنْهُمْ عَبْدُ الرَّحْمَنِ بْنُ عَوْفٍ، فَبَيْنَمَا أَنَا فِي مَنْزِلِهِ بِمِنًى، وَهُوَ عِنْدَ عُمَرَ بْنِ الخَطَّابِ، فِي آخِرِ حَجَّةٍ حَجَّهَا، إِذْ رَجَعَ إِلَيَّ عَبْدُ الرَّحْمَنِ فَقَالَ: لَوْ رَأَيْتَ رَجُلًا أَتَى أَمِيرَ الْمُؤْمِنِينَ اليَوْمَ، فَقَالَ: يَا أَمِيرَ الْمُؤْمِنِينَ، هَلْ لَكَ فِي فُلَانٍ؟ يَقُولُ: لَوْ قَدْ مَاتَ عُمَرُ لَقَدْ بَايَعْتُ فُلَانًا، فَوَاللَّهِ مَا كَانَتْ بَيْعَةُ أَبِي بَكْرٍ إِلَّا فَلْتَةً فَتَمَّتْ، فَغَضِبَ عُمَرُ، ثُمَّ قَالَ: إِنِّي إِنْ شَاءَ اللَّهُ لَقَائِمٌ العَشِيَّةَ فِي النَّاسِ، فَمُحَذِّرُهُمْ هَؤُلَاءِ الَّذِينَ يُرِيدُونَ أَنْ يَغْصِبُوهُمْ أُمُورَهُمْ."

**"Mühacirlərdən bir neçə nəfərə oxutdururdum və onlardan biri də Abdurrahmən bin Auf idi. Mən onun Minada qaldığı yerdə ikən o, Ömər bin əl-Xattab'ın onun etdiyi axırıncı həcdə yanında idi. Bir də Abdurrahmən mənə geri gəldi və dedi: "Bir görsəydin bir nəfər bu gün möminlərin əmirinin yanına gəldi və dedi: "Ey möminlərin əmiri, sənin bu sözləri deyən adam haqqında fikrin nədir? Ömər ölsəydi fılankəsə beyət etmişdim, çünki Allaha and olsun ki, Əbu Bəkrin beyəti tələsik (fəltətən) olmaqdan başqa bir şey deyildi, amma baş verdi." Ömər qəzəbləndi və sonra dedi: "Mən Allah dilərsə bu axşam insanların yanında danışacam, onların bu işlərini əllərindən qəsb etmək istəyən o kəslər haqqında onları xəbərdar edəcəm."**

Daha sonra Abdurrahmən bin Auf bununla bağla Ömərə nəsihət edir və bu təhzirini Məkkədə yox, Mədinədə etməyini məsləhət görür. Ömər Mədinəyə qayıtdıqdan sonra cümə günü peyğəmbərin – salləllahu aleyhi va səlləm - minbərində verdiyi xütbədə söylədiyi sözlər arasında bu sözlər də var idi:

"ثُمَّ إِنَّهُ بَلَغَنِي أَنَّ قَائِلًا مِنْكُمْ يَقُولُ: وَاللَّهِ لَوْ قَدْ مَاتَ عُمَرُ بَايَعْتُ فُلَانًا، فَلاَ يَغْتَرَّنَّ امْرُؤٌ أَنْ يَقُولَ: إِنَّمَا كَانَتْ بَيْعَةُ أَبِي بَكْرٍ فَلْتَةً وَتَمَّتْ، أَلاَ وَإِنَّهَا قَدْ كَانَتْ كَذَلِكَ، وَلَكِنَّ اللَّهَ وَقَى شَرَّهَا، وَلَيْسَ مِنْكُمْ مَنْ تُقْطَعُ الأَعْنَاقُ إِلَيْهِ مِثْلُ أَبِي بَكْرٍ، مَنْ بَايَعَ رَجُلًا عَنْ غَيْرِ مَشُورَةٍ مِنَ المُسْلِمِينَ فَلاَ يُبَايَعُ هُوَ وَلاَ الَّذِي بَايَعَهُ، تَغِرَّةً أَنْ يُقْتَلاَ"

"**Sonra mənə xəbər çatıb ki, sizdən biriniz deyir: "Allaha and olsun ki, Ömər ölsəydi fılankəsə beyət edərdim. Heç kim aldanaraq düşünməsin ki, Əbu Bəkrin beyəti tələsik (fəltətən) oldu və həyata keçdi. Diqqət edin! Bu elə də oldu, lakin Allah şərrindən qorudu. Sizin aranızda Əbu Bəkr kimi xeyir işdə yarışacaq biri yoxdur. Hər kim müsəlmanlar ilə məşvərət etmədən bir kəsə beyət edərsə nə ona, nə onun beyət etdiyinə beyət edilməsin ki, öldürülmə qorxusu olmasın.**"[58]

Bu sözlərin şərhində məşhur hənbəli alimi İbnul-Cəvzi – rahmətullahi aleyhi - deyir:

"وَقَوله: كَانَت بيعَة أبي بكر فلتة. الفلتة: مَا وَقع عَاجلا من غير تمكث. وَرُبمَا توهم سامع هَذَا الْكَلَام أَن عمر كالنادم على بيعَة أبي بكر، وَلَيْسَ كَذَلِك، وَإِنَّمَا استعجل عمر بالبيعة مَخَافَة الْفِتْنَة، وَلَو وَقع توقف لم تؤمن"

"**Onun "Əbu Bəkrin beyəti fəltə idi" sözünə gəldikdə "fəltə" gözləmədən aciz olaraq baş verənə deyilir. Ola bilsin ki, bu sözləri eşidən kəs Ömərin Əbu Bəkrə beyət etməsindən peşman olduğunu səhv olaraq güman edə bilər, lakin belə deyildir. Ömər sadəcə olaraq fitnənin çıxmasından qorxuduğu üçün beyətdə tələsik davranmışdı, əgər gözləmə olsaydı fitnədən əminlik olmazdı.**"[59]

İbnul-Cəvzi'nin də bu sözləri təsdiq edir ki, alimlərin kitablarında beyət üçün zikr etdikləri hallar gecikdirildiyi təqdirdə məsləhətin əldən qaçırıla biləcəyi hallardır. Ömərin bu hədisdə söylədiyi sözlər də buna dəlalət edir. Əgər belə bir tələsiklik olmasaydı o zaman nə Əbu Bəkr'in, nə də Ömərin Saqifə hadisəsində etdikləri üçün Əli, Abbas, əz-Zubeyr kimi həll və əqd əhli qarşısında bir üzrləri olmayacaqdı, çünki Əli'nin və Abbasın ən əsas etirazı bu olub. Belə ki, "Sahih Muslim"də gələn rəvayətdə Əli bin Əbi Talib bununla bağlı Əbu Bəkrə etirazında deyir:

---

[58] "Sahih Muslim", 6830
[59] "Kəşful-Muşkil", 1/67

“إِنَّا قَدْ عَرَفْنَا يَا أَبَا بَكْرٍ فَضِيلَتَكَ، وَمَا أَعْطَاكَ اللهُ، وَلَمْ نَنْفَسْ عَلَيْكَ خَيْرًا سَاقَهُ اللهُ إِلَيْكَ، وَلَكِنَّكَ اسْتَبْدَدْتَ عَلَيْنَا بِالْأَمْرِ، وَكُنَّا نَحْنُ نَرَى لَنَا حَقًّا لِقَرَابَتِنَا مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ،”

**“Ey Əbu Bəkr, biz sənin fəzilətini və Allahın sənə nə verdiyini bilirik. Allahın sənə gətirdiyi xeyri inkar etmədik. Lakin sən bu işdə tək başına davrandın və Allahın elçisinə - salləllahu aleyhi va səlləm – qohumluğumuz çatdığı üçün bizim də bir haqqımızın olduğunu düşünürdük.”**[60]

Aydındır ki, Əli bin Əbi Talib – radiyallahu anhum əcməin – Əbu Bəkrin, Ömərin onlarla məşvərət etmədən xəlifə seçməklərinə etiraz edir və şurada onun da haqqının olduğunu bu sözləri ilə təsdiqləyir. Başqa sözlə desək Əli burada Əbu Bəkrin və Ömərin etdiyini təsvib etmir. Bu hədisi şərh edən alimlərimizin bu nöqtədə Əlinin sözünü rədd edərkən görmədim, lakin bütün alimlər Əbu Bəkrin üzrünün olduğunu qeyd edirlər. Qeyd edirlər ki, Əbu Bəkri, Öməri bu cür addım atmağa vadar edən çıxacaq fitnə, müsəlmanların sırasının parçalanması qorxusu idi. Ömər bin əl-Xattab’ın da yuxarıda bu işin məşvərətlə edilməsini vacib görməsi onu göstərir ki, səhabələrin bu məsələdəki rəyi bu olmuşdur.

Ona görə də həll və əqd əhli ilə məşvərət edilmədən ümmətin üzərinə gətirilən istənilən kəs dəstək qazanmayacaq, çünki bu işin əslini şura təşkil edir. Burada iki yol ola bilər; ya müsəlmanlarla, onların böyükləri ilə məşvərət edərək, onların dəstəyini qazanaraq onların üzərində imam olmaq, ya da güc və zorakılığa əl ataraq bu məqama gəlməyə çalışmaq. Əgər birinci yol tərk ediləcəksə və ikinci yola əl atılacaqsa, o zaman bunu “nəbəvi xilafət” adlandırmaq iftiradan başqa bir şey deyildir, çünki nəbəvi xilafət bu cür olmayıb.

Məşvərət imamətin qurulmasında şərt olduğu kimi davamında da şərtdir. Xəlifə olacaq insana bu məqama gəlmək üçün ümmətin böyükləri olan alimlərlə, liderlər ilə məşvərət etmək vacib olduğu kimi xəlifə olduqdan sonra da onlarla məşvərət etməsi vacibdir. Buna görə də məşhur müfəssir Əbu Muhəmməd İbn Atiyyə əl-Əndəlusi (vəfatı hicri 542) təfsirində deyir:

“والشورى من قواعد الشريعة وعزائم الأحكام، ومن لا يستشير أهل العلم والدين فعزله واجب، هذا ما لا خلاف فيه”

**“Şura şəriətin əsaslarındandır, hökmlərin ən önəmlilərindəndir və kim elm və din əhli ilə istişarə etmirsə onun əzl edilməsi vacibdir. Bu, haqqında ixtilaf olmayan bir şeydir.”**[61]

---

[60] “Sahih Muslim”, 1759;
[61] “əl-Muharrar əl-Vaciz”, 1/534

İbn Atiyyə bu sözündə alimlər arasında icma olduğunu deyir. Onun bu sözlərini həmçinin əl-Qurtubi, Əbu Həyyən əl-Əndəlusi, əs-Sə’aləbi, əş-Şəvkəni və başqaları zikr edirlər və bu nöqtədə İbn Atiyyə’yə etiraz etmirlər. Lakin İbn Arafə bu məsələdə etiraz edib, məşvərə’nin vacibliyi məsələsində yox, lakin buna görə əzlin vacib olmasında onunla razılaşmayıb. ət-Tahir İbn Aşur isə təfsirində İbn Arafə’nin etirazını əsassız hesab edir. İstənilən halda İbn Atiyyə’nin bu məsələdə icma iddia etməsi ilə razı deyilik, lakin bir hakimin şurasız davranması istibdəd sahibi, diktatut olmasını tələb edir, bu isə ən azından fisqdir. Həmçinin İbn Atiyyə’nin burada dediyinin mübahisəli olan hissəsi imam üçün imamlıq sabit olduqdan sonra vəzifəsindən əzl olunması ilə bağlıdır, lakin şəkk yoxdur ki, ilk başdan alimlərlə məşvərət etməyən birinə, əksinə onların sözlərinə qulaq verməyib, sözlərini rədd edən birinə imamlıq vəzifəsi həvalə edilməz.

Buraya qədər bizim həll və əqd əhli tərəfindən edilən seçimlə bağlı mövzunu yekunlaşdırmaq üçün yazdıqlarımız idi. Gəlin görək Əbul-Məhasin qardaşın verdiyi yekun söz nədir. O, sözünü yuvarlaqlaşdıraraq deyir:

> “**Bununla da bəlli olur ki, hər ölkədən həll və əqd əhlinin cumhurunu şərt qoymaq və onun əsasında həmin şərtə uyğun seçilməyən imamın leqitimliyini şübhə altına qoymaq yaxud onun batil olduğunu iddia etmək özü nə Quran, nə də Sünnəyə dayanmayan batil və əsassız sözdür və artıq onun əsassız olduğunu bir çox fəqihlər qeyd etmişlər.**”

Bu, çox qəribə bir nəticədir. Məqalə sahibi bütöv məzhəblərin qəbul etdiyi görüşlərə “batil” hökmü verəcək cürəti haradan tapır? Bu gün özünün məzhəb fiqhinə göstərdiyi maraqla burada yazdığı sözlər heç bir-birinə uyğun gəlmir. Bizim təqdim etdiyimizdən bəlli oldu ki, hənbəlilərin və malikilərin, eləcə də bəzi şafi’ilərin və hənəfilərin görüşünə görə seçim yolu ilə xilafət qurulduqda həll və əqd əhlinin əksəriyyətinin beyəti, başqa cür desək razılığı şərtdir. Bu qədər böyük alimlərin sözlərinə batil demək bizim bu qardaşımıza yaraşmır. Onun səviyyəsində olan biri sadəcə olaraq “mənim nəfsimə bu rəy xoş gəlir” deyə bilər, lakin iki məzhəbin tutduğu rəyin nə Qurandan, nə də Sünnədən bir dəlili olmayan batil rəy, əsassız söz olduğunu demək bu müsəlman qardaşın başına görə bir iş deyildir.

## Həll və əqd əhli

Biz həll və əqd əhlinin beyətinin şərt olduğunu alimlərin sözləri ilə izah etdik. Bu sözlərdən sonra bir kimsənin çıxaraq “həll və əqd əhlinin beyəti şərt deyildir” deməsi cahil insanları aldatmaqdan başqa bir şey sayılmamalıdır. Amma burada önəmli olan həll və əqd əhlini müəyyən edən vəsfləri öyrənməkdir. Ümmət tərəfindən tanınmayan, tabe olunmayan kəslər əqd və həll əqdi sayıla bilərlərmi? Əbul-Məhasin qardaşımızın və əl-Bağdadi’ni xəlifə sayan digər kəslərin nəzərində həll və əqd əhli tanınmayan, geniş kütlələr tərəfindən tabe olunmayan kəslər də ola bilərlər. Əbul-Məhasin qardaşımız yazır:

> “**Daha sonra həmin şəxs xəlifə seçməyin şərti olan həll və əqd əhli haqda söhbət açır və bir sıra iddialar irəli sürür. Həmin şəxs bəzi müasirlərin kitablarından yığcam misallar gətirir daha sonra həll və əqd əhlinin ümmətin öncül adamları olduğunu deyir:**
>
> **“Yuxarıda qeyd olunan qövllərdən məlumdur olur ki, alimlər əhlul-həll val əqdin ümmət tərəfindən lider olaraq qəbul olunan, söz sahibi və müəyyən təsirə malik şəxslərdən ibarət olduğunu demişdir.” Sözləri burada bitir.**
>
> **Deyirəm: Həmin şəxsin gətirdiyi nəqllərə nəzər salan görə bilər ki, onun misal olaraq gətirdiyi sözlərdə “bütün ümmətin öncül şəxsləri” deyə səslənən bir söz yoxdur. Onun Tarifi və Muhammədd Abduh kimi müasirlərdən gətirdiyi nəqllərdə əmirlər, hakimlər, alimlər, ordu başçıları, habelə aid olduqları toplum üzərində siyasi və ictimai hakimiyyətə sahib olan şəxslər qeyd edilir.**
>
> **Elə isə ümmət tərəfindən lider kimi qəbul olunan, yaxud ümmət tərəfindən alim kimi qəbul edilən kimi gurultulu sözlər heç də günümüzün vaqeəsinə uyğun deyil və bütün ümmətin qəbul edəcəyi belə bir şəxs mövcud deyil. Əslində İslam şəriətində belə bir şərt də yoxdur.**”

Bu sözlər üzərində bəzi mülahizələrimizi qeyd etməliyik. İlk öncə heç kim “bütün ümmətin qəbul etdiyi” liderləri qəsd etmir və ilk məqalənin sahibinin sözlərini

oxuyan da oradan elə bir məna çıxarmır. Lakin qəsd olunan liderlər ümmətin ayrı-ayrı bölgələrində, müxtəlif təbəqələrində söz sahibi olan liderlərdir. Bunlar o kəslərdir ki, onların bir araya gəlib bir məsələdə qərar verməsinə davamçılarının, izləyicilərinin və dəstəkçilərinin çoxluğu səbəbi ilə ümmətin əksəriyyəti boyun əyir. Bütün bu deyilənlər fəqihlərimizin sözlərində keçir, lakin ola bilsin ki, insaf gözü ilə baxmayanlar o sözləri görə bilmirlər. Biz o sözləri ayrılıqda seçərək oxucular üçün təqdim edirik. Əslində o nəqllər daha öncə keçdi. İbn Həcər əl-Heytəmi deyir:

“(وَالْأَصَحُّ) أَنَّ الْمُعْتَبَرَ، هُوَ (بَيْعَةُ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ مِنْ الْعُلَمَاءِ وَالرُّؤَسَاءِ وَوُجُوهِ النَّاسِ الَّذِينَ يَتَيَسَّرُ اجْتِمَاعُهُمْ) حَالَةَ الْبَيْعَةِ بِأَنْ لَمْ يَكُنْ فِيهِ كُلْفَةٌ عُرْفًا فِيمَا يَظْهَرُ؛ لِأَنَّ الْأَمْرَ يَنْتَظِمُ بِهِمْ وَيَتَّبِعُهُمْ سَائِرُ النَّاسِ”

“**[Ən səhih olan] budur ki, etibara alınan, beyət halında örfən bir külfət/çətinlik olmamaq surəti ilə [toplaşmaqları asan olan alimlər, liderlər və insanların böyüklərindən ibarət həll və əqd əhlinin beyətidir], <u>çünki iş onların vasitəsi ilə düzəlir və digər insanlar da onlara tabe olur</u>.**”

İbn Həcər’in hökmü əsaslandırmasına diqqət edək. “İnsanlar onlara tabe olur” deyir. Beləliklə də heç kəs şübhə edə bilməz ki, şafi’i fəqihlər burada “alimlər, başçılar və insanların böyükləri” dedikdə heç də hər alimi, hər başçını qəsd etmirlər, lakin insanların tabe olduqları alimləri və başçıları qəsd edirlər. Bu sözləri təkcə İbn Həcər deyil, həmçinin Əbul-Qasim ər-Rafi’i, Zəkəriyya əl-Ənsari, əl-Xatib əş-Şirbini, Şəmsuddin ər-Ramli, Süleyman bin Mənsur əl-Uceyli, Süleyman bin Muhəmməd əl-Buceyrami və başqaları bu şəkildə qeyd edirlər.

Bu barədə Əbu Həmid əl-Ğazəli’nin də sözləri çox aydın sözlərdir. O, bu barədə deyir:

“وَالَّذِي نختاره انه يَكْتَفِي بشخص وَاحِد يعْقد الْبيعَة للامام مهما كَانَ ذَلِك الْوَاحِد مُطَاعًا ذَا شَوْكَة لَا تطال وَمهما كَانَ مَال الى جَانب مَال بِسَبَبِه الجماهير وَلم يُخَالفهُ الا من لَا يكرث بمخالفته فالشخص الْوَاحِد الْمَتْبُوع المطاع الْمَوْصُوف بِهَذِهِ الصّفة اذا بَايع كفى اذ فِي مُوَافَقَته الجماهير فان لم يحصل هَذَا الْغَرَض الا لشخصين اَوْ ثَلَاثَة فلابد من اتِّفَاقهم وَلَيْسَ الْمَقْصُود اعيان الْمُبَايعين وانما الْغَرَض قيام شَوْكَة الإمام بالأتباع والأشياع”

“**Bizim rəyimiz budur ki, nə qədər ki, itaət olunur, əzilməz qüdrətə sahibdir və nə qədər ki, bir tərəfə meyl etdikdə (insanların) böyük əksəriyyəti (onun meyl etdiyi tərəfə) meyl edir və müxalif olmaqlarına əhəmiyyət verilməyən kəslərdən başqa heç kim ona müxalif olmur, belə bir nəfərin beyət əqdini**

**imam üçün bağlaması kifayət edir. Beləliklə də tabe olunan, itaət olunan və bu özəlliklə vəsf olunmuş bir şəxs əgər beyət edərsə kifayət edər, çünki onun (imama) müvafiq olması (insanların) böyük əksəriyyətinin müvafiq olması anlamına gəlir. Əgər bu qəsd olunan hal yalnız iki nəfər və ya üç nəfər üçün hasil olubsa o zaman onların ittifaq halında olmaqları labüddür. Məqsəd beyət edənlərin özləri deyildir, burada yeganə məqsəd tabe olanlar(ın) və tərəfdarlar(ın çoxluğu) ilə imamın qüdrətinin əmələ gəlməsidir**”

Heç şübhə ola bilməz ki, burada əl-Ğazəli ümmətin əksəriyyətinin tabe olduğu, boyun əydiyi bir rəhbəri, bir alimi qəsd edir. Lakin qeyd edir ki, əgər ümmətin əksəriyyətinin tabe olduğu belə biri yoxdursa, lakin iki nəfərə tabe olan hissəsi ümmətin əksəri olarsa və ya üç nəfər olarsa o zaman onlardan heç birinin ayrılıqda beyəti kifayət etməyəcək, gərək mütləq ittifaq etsinlər. Burada bizə önəmli olan budur ki, əl-Ğazəli təbii ki, bizim nəzərimizdə tutduğumuz həll və əqd əhlini qəsd edir. Həmçinin əl-Ğazəli’nin sözündən başa düşürük ki, həll və əqd əhlinin bütün ümmət tərəfindən tabe olunması şərt deyildir, əksinə başa düşürük ki, həll və əqd əhlinə daxil edə biləcəyimiz ayrı-ayrı fərdləri ümmətin fərqli hissələri dəstəkləyə bilərlər, tabe ola bilərlər. Ola bilər ki, müəyyən bir alim Şimali Afrikadakı müsəlmanların tanıdıqları, sevdikləri və saydıqları bir alimdir. Yaxud da alim olmasa da islamçı bir ictimai xadimdir, sözü keçən, özü sayılıb sevilən biridir. Əgər bütün Şimali Afrikada belə biri yoxdursa o zaman Şimali Afrikadakı ayrı-ayrı ölkələrdə belə bir neçə nəfər varsa onların hamısının və ya bir hissəsinin ittifaqı ilə tələb olunan əksəriyyət hasil olursa, o zaman onlar axtardığımız həqiqi həll və əqd əhlidirlər. Hənəfi alimi Fəxruddin Qadi Xan deyir:

“وَيُعْتَبَرُ فِي الْمُبَايَعَةِ أَشْرَافُهُمْ وَأَعْيَانُهُمْ”

“**...beyətdə etibara alınanlar onların ən şərəfliləri və statusu ən yüksək olanlarıdır.**”

Burada “statusu ən yüksək olanlar” olaraq tərcümə etdiyimiz “ayan” sözü ilə qəsd olunan bir camaatın ən şərəfliləri, ən fəzilətliləridir. Hərfi mənada “gözlər” deməkdir. Ərəb dili alimi Əbul-Fəth Nəsiruddin əl-Mutarrazi (538-610) “əl-Muğrib fi Tərtib əl-Murib” kitabında deyir:

“وَأَعْيَانُ الْقَوْمِ أَشْرَافُهُمْ إِمَّا لِأَنَّهُ لَا يُنْظَرُ إِلَّا إِلَيْهِمْ أَوْ لِأَنَّهُ كَأَنَّهُمْ عُيُونُهُمْ الْمُبْصِرَةُ”

“**Qövmün “ayanı” onların ən şərəfliləridir; ya onlardan başqalarına baxılmadığı üçün və yaxud da onların sanki həmin qövmün görən gözləri olduqları üçün belə adlanıblar.**“[62]

[62] “əl-Muğrib fi Tərtibil-Murib”, 1/335;

Beləliklə də həll və əqd əhli olmağa layiq olan kəslər hənəfi alimlərinə görə bu məsabədə ola biləcək kəslərdir, bir qövmün ən şərəfliləri, ən böyükləridir. Əbul-Məhasin qardaşımızın nə üçün bu həqiqətə etiraz etdiyini anlamaq olar, çünki həqiqətdə əl-Bağdadi'yə beyət edənlər müsəlmanlar arasında məchul olan, tanınmayan kəslərdir. Onlar heç bir ölçü ilə həll və əqd əhli olmağa layiq deyillər. Ancaq biz bu "dövlətin" şəri heyətinin yaydığı bəyanları oxuduqda ağlımızda belə bir təsəvvür oyanır ki, İraqın həll və əqd əhlinin əksəriyyəti həm əvvəlki əmir Əbu Ömər əl-Bağdadi'yə, həm də hazırkı əmir Əbu Bəkrə beyət etmişdilər. Hardadır həmin həll və əqd əhli?!

## Əlinin xilafəti

Əbul-Məhasin qardaşımız bir tərəfdə həll və əqd əhlinin statusunu bacardığı qədər kiçiltməyə çalışdı. Daha sonra bir başqa tərəfdə həll və əqd əhlinin əksəriyyətinin beyətini şərt görən rəyi zəif, hətta batil çıxarmaqdan ötrü bəzi iddialar irəli sürdü. Bu iddialardan biri də budur ki, əgər cumhur şərt olsaydı o zaman Əli bin Əbi Talib'in – radiyallahu anhu – xəlifəliyi səhih olmazdı. Gəlin qardaşımızın demək istədiyini öz sözləri ilə oxuyaq:

> "**Üstəlik fəqihlər qeyd etmişlər ki, həll və əqd əhlinin cumhuru ilə məşvərət şərt olsaydı Əli İbn Əbu Talibin beyəti səhih olmazdı. Artıq böyük səhabələr onun beyətindən kənar qalmışlar. Bu da Əli ibn Əbu Talibin səhabələrin cumhuru tərəfindən seçilmədiyini göstərir.**"

Daha sonra Şeyxul-İslam İbn Teymiyyə'dən bəzi nəqllər zikr edir və davamında buyurur:

> "**Bu da onu göstərir ki, ona həll və əqd əhlinin cumhuru deyil bir qismi beyət etmişlər. Buna əsasən də həll və əqd əhlinin cumhurunun beyətini şərt qoymaq və onun imamlığın səhihlik şərti olduğunu iddia etmək batildir və əsassızdır.**"

Beləliklə də məqalə sahibi öz mövqeyini dəstəkləmək üçün iddia edir ki, Əli bin Əbi Talib'ə həll və əqd əhlinin cumhuru beyət etməmişdi. Bu iddiasını hətta ümumilikdə fəqihlərə nisbət edir. Həmçinin bu iddiasını dəstəkləmək üçün qarşıya qoyduğu ən güclü sitat İbn Teymiyyə'nin bu sözləridir:

"وَأَمَّا عَلِيٌّ فَمِنْ حِينِ تَوَلَّى تَخَلَّفَ عَنْ بَيْعَتِهِ قَرِيبٌ مِنْ نِصْفِ الْمُسْلِمِينَ مِنَ السَّابِقِينَ الْأَوَّلِينَ مِنَ الْمُهَاجِرِينَ وَالْأَنْصَارِ وَغَيْرِهِمْ، مِمَّنْ قَعَدَ عَنْهُ فَلَمْ يُقَاتِلْ مَعَهُ، وَلَا قَاتَلَهُ مِثْلُ أُسَامَةَ بْنِ زَيْدٍ وَابْنِ عُمَرَ وَمُحَمَّدِ بْنِ مَسْلَمَةَ وَمِنْهُمْ مَنْ قَاتَلَهُ. ثُمَّ كَثِيرٌ مِنَ الَّذِينَ بَايَعُوهُ رَجَعُوا عَنْهُ مِنْهُمْ مَنْ كَفَّرَهُ وَاسْتَحَلَّ دَمَهُ، وَمِنْهُمْ مَنْ ذَهَبَ إِلَى مُعَاوِيَةَ كَعَقِيلٍ أَخِيهِ وَأَمْثَالِهِ."

> "**Əliyə gəldikdə isə vəzifəyə keçdiyi andan Usəmə bin Zeyd, İbn Ömər, Muhəmməd bin Məsləmə kimi mühacir və ənsarların ilk iman gətirənlərindən və qeyrilərindən, ona qoşulmayan, onunla birlikdə vuruşmayanlardan və ona qarşı da vuruşmayanlardan müsəlmanların yarısına yaxın bir miqdarı ona beyət etməkdən geridə qalmışdılar. Onların arasında ona qarşı vuruşanlar da var**

**idi. Üstəlik ona beyət edənlərdən bir çoxu bu beyətindən döndü, onlardan kimisi onu təkfir etdi və qanını halal gördü, qardaşı Aqil və əmsalı kimi Müaviyəyə qoşulanlar da oldu.**”[63]

İlk öncə qeyd edək ki, belə bir iddianı ümumilikdə fəqihlərə nisbət etmək saxtakarlıqdır, çünki əksinə fəqihlər, mütəkəllimlər və hədis əhli yekdil şəkildə qeyd edirlər ki, Əli bin Əbi Talibə həll və əqd əhlinin böyük əksəriyyəti beyət etmişdi. Hətta bəziləri həll və əqd əhlinin hamısının beyət etdiyini söyləyir. Qarşıda onlardan bəzi nəqllər zikr olunacaq. İbn Teymiyyə’dən gətirilən sitata gəldikdə isə burada heç bir yerdə İbn Teymiyyə əksəriyyətin beyət etmədiyini demir. Əksinə “müsəlmanların yarısına yaxın bir miqdarı” sözü onu göstərir ki, yarısından çoxu beyət etmişdi, bu isə əksəriyyətdir. Çox şiddətli təəssüf hiss ilə deməliyəm ki, bu şəkildə nəqlləri yersiz yerə gətirmək elm tələbəsinə yaraşmır. İbn Teymiyyə’nin sözündə qardaşımız üçün heç bir dəlil yoxdur. Üstəlik İbn Teymiyyə’nin bu iddiası doğru deyildir, xətalıdır, çünki Əli bin Əbi Talibə həll və əqd əhlinin ən azından böyük əksəriyyəti beyət etmişdilər. Hətta itaətsizlik göstərərək Osmanın qatillərini tələb etmək məqsədi ilə ordu başına keçmiş Talha və əz-Zubeyr kimi səhabələr belə ona beyət etmişdilər və beyətlərindən dönməmişdilər və məqsədləri heç bir zaman Əliyə qarşı vuruşmaq olmamışdı.
Qeyd etdiyimiz kimi alimlərimizdən bir çoxu Əli’nin həll və əqd əhlinin icması ilə imam olduğunu deyirlər. Bu icmanı həm həqiqi icma kimi, həm də hökmi icma kimi də başa düşmək olar, çünki bəzi kəslərin şazz qalması icmanı pozmaz. Hənbəli alimlərindən İmam İbnuz-Zəğuni – rahiməhullah – deyir:

“فأما خلافة علي بن أبي طالب – رضي الله عنه – فإنها كانت بالإجماع وذلك أن أهل الحل والعقد عقدوها لعلي بعد قتل عثمان وكانت الخلافة في أهلها ومستحقها وكان أعلم الناس في زمان خلافته.”

“**Əli bin Əbi Talib’in – radiyallahu anhu - xilafətinə gəldikdə isə o da icma ilə idi, belə ki, həll və əqd əhli Osmanın qətlindən sonra (xilafət) əqdini Əli üçün bağladılar və xilafət ona əhl olan, ona layiq olan birində idi və xəlifəliyi zamanı insanların ən elmlisi idi.**”[64]

əl-Mutəvalli adı ilə tanınan böyük şafi’i alimi, mütəkəllim Əbu Said Abdurrahmən ən-Neysəburi (vəfatı 478) deyir:

“ثم إن الخلافة بعده لعلي بإجماع القوم عليه وعقدهم الخلافة له.”

“**Sonra ondan sonra xilafət qövmün (yəni həll və əqd əhlinin) onun üzərində icma etməsi ilə və xilafət əqdini onun üçün bağlamaq ilə Əliyə keçdi.**”[65]

[63]“Minhəcus-Sunnətin-Nəbəviyyə”, 8/316
[64]“İydah Usulid-Din”, səh: 628;
[65] “əl-Ğunyə fi Usulid-Din”, səh: 187

Bunu həmçinin Fəxruddin ər-Razi "Məalimu Usulid-Din" kitabında və digər əşari mütəkəllim alimlər öz kitablarında, həmçinin hənbəlilər və hədis əhli bu şəkildə təsdiq edirlər. İbn Teymiyyə'nin zikr etdiyi kimi bəzi səhabələrin onun yanında Müaviyəyə qarşı vuruşmamasına gəldikdə isə alimlərin əksəriyyəti bunu heç də ona beyət etməməkləri anlamında qəbul etmirlər. əl-Qadi Əbu Bəkr İbnul-Arabi deyir:

"أما بيعته فلم يتخلف عنها، وأما نصرته فتخلف عنها قوم، منهم من ذكرتم؛ لأنها كانت مسألة اجتهاد، فاجتهد كل واحد وأعمل نظره وأصاب قدره"

"**Ona (yəni Əliyə) beyətə gəldikdə isə heç kim ona beyət etməkdən geri qalmadı, amma ona dəstək olmağa gəldikdə isə bir qrup dəstək olmadı, onların arasında sizin adlarını zikr etdikləriniz də var idi, çünki bir ictihad məsələsi idi və onlardan hər biri ictihad etdi, öz düşüncəsini işlətdi və miqdarında doğruya isabət etdi.**"[66]

Bu sözlərindən anlamış oluruq ki, beyətə gəldikdə ilk əvvəldə hamı Əliyə beyət etmişdi, daha dəqiq desək beyət edənlər beyət etmişdilər və digər həll və əqd əhli buna etiraz etməmişdilər, razı idilər. Lakin daha sonrakı hadisələr əsnasında müxalifət edənlər oldu. Ancaq məlumdur ki, imamlıq əqdi bağlandıqdan sonra bəzi kəslərin müxalif olması ilə bu əqd pozulmur. Bu, İbnul-Arabi və əksər alimlərin rəyidir.
Etiraf edirik ki, digər rəydə olan böyük alimlərimiz vardır, onlar təsdiq edirlər ki, səhabələrdən Əliyə beyət etməkdən imtina etmiş kəslər olub və onların arasında bəzilərinin adlarını sayırlar. Amma bundan öncə Əlinin imamlığı həll və əqd əhlinin əksəriyyəti ilə sabit olduğu üçün bəzi səhabələrin müxalif olması və ya beyətdən imtina etməkləri heç bir zərər verməz. Tarixçi alimimiz İmam əz-Zəhəbi deyir:

"وَبِالْجُمْلَة خلَافَة عَليّ حق وَهُوَ إِمَام رَاشد وَإِن تَأَخّر عَن بيعَته طَائِفَة كَبِيرَة فَإِنَّمَا الإعتبار بجَمهور أهل الْحل وَالْعقَد"

"**Cümlətən Əlinin xəlifəliyi haqdır və o, ədalətli imamdır. Ona beyət etməyə böyük bir qrup geciksə də etibar həll və əqd əhlinin cumhuru ilədir.**"[67]

Gördüyümüz kimi əz-Zəhəbi bu sözləri "əl-Muntəqa" kitabında deyir və bu kitab Şeyxul-İslam'ın "əl-Minhəc" kitabının xülasəsi sayılır. Deyə bilərik ki, əz-Zəhəbi belə əksəriyyətin beyət etdiyini təsdiqləyir. İbn Həcər əl-Heytəmi deyir:

"علِم ممَّا مر أَن الْحقيق بالخلافة بعد الْأَئِمَّة الثَّلَاثَة هُوَ الإِمَام المرتضِي وَالْوَلِيّ الْمُجْتَبَى عَليّ بن أبي طَالب بِاتِّفَاق أهل الْحل وَالْعقد عَلَيْهِ كطلحة وَالزّبير وَأبي

[66]"əl-Avasim minəl-Qavasim", səh: 150
[67]"əl-Muntəqa", səh: 401

مُوسَى وَابْنِ عَبّاس وَخُزَيْمَة بن ثَابت وَأبي الْهَيْثَم بن التيهَان وَمُحَمّد بن مسلمة وعمار بن يَاسر

وَفِي شرح الْمَقَاصد عَن بعض الْمُتَكَلِّمين أن الْإِجْمَاع انْعَقَد على ذَلِك وَوجه انْعقَاده فِي زمن الشورى على أَنَّهَا لَهُ أَو لعُثْمَان وَهَذَا إِجْمَاع على أَنه لَوْلَا عُثْمَان لكَانَتْ لعَلي فحِين خرج عُثْمَان بقتْله من الْبَيْت علم أَنَّهَا بقيت لعَلي إِجْمَاعًا وَمن ثمَّ قَالَ إِمَام الْحَرمَيْنِ وَلَا اكتراث من قَالَ لَا إِجْمَاع على إِمَامَة عَليّ فَإِن الْإِمَامَة لم تجحد لَهُ وَإِنَّمَا هَاجَتْ الْفِتْنَة لأمور أُخْرَى"

**"Daha əvvəl zikr olunanlardan bilindi ki, Talha, əz-Zubeyr, Əbu Musa, İbn Abbas, Xuzeymə bin Səbit, Əbul-Heysəm bin ət-Təyhən, Muhəmməd bin Məsləmə, Ammar bin Yəsir kimilərdən olan həll və əqd əhlinin onun üzərində ittifaq etməsi ilə üç imamdan sonra xilafətə layiq olan murtəza imam, seçilmiş vəli Əli bin Əbi Talib idi.**
**"Şərh əl-Məqasid" kitabında bəzi mütəkəllimlərdən (belə dedikləri nəql olunur) ki, bunun üzərində icma bağlanmışdır və icmanın bağlanmasının əsası isə budur ki, şura zamanında imamlıq ya onun, ya da Osmanın idi. Bu isə icmadır ki, əgər Osman olmasaydı imamlıq Əlinin olacaqdı. Osman isə öldürülərək evindən çıxarıldıqda bilindi ki, imamlıq icma ilə Əliyə qalıb. Ona görə də İməmul-Harameyn demişdir: Əlinin imamlığı üzərində icmanın olmadığını deyənin sözünə əhəmiyyət verilməz, çünki onun imamlığı heç kim tərəfindən inkar olunmamışdı, fitnə isə sadəcə başqa səbəblərə görə çıxmışdı."**[68]

Bu sözlərdən anlayırıq ki, əl-Qadi İbn əl-Arabi'nin dedikləri həm də əl-Cuveyni tərəfindən də bölüşülür. Xüsusilə də alimlərin əksəriyyətinə görə beyətdə icmanın hasil olması üçün hər bir kəsin gələrək imama şəxsən beyət etməsi tələb olunmur. Tələb olunan beyətini rədd etməsi, imamlığına etiraz etməsidir. Bizə gələn xəbərlər də onu göstərir ki, nə Aişə, Talha və əz-Zubeyr, nə də Müaviyə, Amr bin əl-As, əl-Muğira bin Şubə kimi səhabələr Əli bin Əbi Talib'in imam olmasına etiraz etmirdilər, lakin onunla aralarındakı ixtilaf başqa səbəblərə dayanırdı. İmam Əbul-Avn əs-Səffərini deyir:

"قَالَ بَعْضُ مُحَقِّقِي عُلَمَائِنَا: قَد اتَّفَقَ عَلَى بَيْعَة عَلِيٍّ - رَضِيَ اللَّهُ عَنْهُ - عَامَّةُ مَنْ حَضَرَ الْمَدِينَةَ مِنَ الْبَدْرِيِّينَ وَالْأَنْصَارِ كَاجتِمَاعِ أَهْلِ السَّقِيفَة عَلَى بَيْعَة أَبِي بَكْرٍ - رَضِيَ اللَّهُ عَنْهُ -. قَالَ الْحَسَنُ الْبَصْرِيّ - رَضِيَ اللَّهُ عَنْهُ -:وَاللَّه مَا كَانَتْ بَيْعَةُ عَلِيٍّ - رَضِيَ اللَّهُ عَنْهُ - إِلَّا كَبَيْعَة أَبِي بَكْرٍ وَعُمَرَ - رَضِيَ اللَّهُ عَنْهُمْ -. وَقَالَ أَبُو عَبْد اللَّه بْنُ بَطَّةَ منْ عُلَمَائنَا: كَانَتْ بَيْعَةُ عَلِيٍّ - رَضِيَ اللَّهُ عَنْهُ - (بَيْعَةَ) اجْتمَاعٍ وَرَحْمَةٍ لَمْ يَدْعُ إِلَى نَفْسه، وَلَمْ يُجْبِرْهُمْ عَلَى بَيْعَته بِسَيْفه، وَلَمْ يَغْلبْهُمْ بِعَشيرَته"

[68]"əs-Savaiq əl-Muhriqa alə Əhlir-Rafdi vad-Daləl vaz-Zəndəqa", 1/349;

> “**Alimlərimizdən bəzi mühəqqiqlər deyiblər: Əliyə – radiyallahu anhu – beyət etmək üzərində Mədinə şəhərinə gəlmiş bədrilər, ənsarlar olmaqla hər kəs ittifaq etmişdi, necə ki, əs-Səqifə əhli Əbu Bəkrə - radiyallahu anhu – beyət etməkdə icma etmişdi. əl-Həsən əl-Basri – radiyallahu anhu – deyib: “Allaha and olsun ki, Əlinin – radiyallahu anhu – beyəti Əbu Bəkr və Ömərin – radiyallahu anhum – beyətindən başqa cür olmamışdı.” Alimlərimizdən Əbu Abdilləh bin Bətta deyir: “Əlinin – radiyallahu anhu – beyəti icma və rəhmət idi, öz nəfsinə çağırmırdı və onları qılıncı ilə beyətə məcbur etməmişdi və nə də əşirəti ilə onlara təzyiq göstərməmişdi.**”[69]

Əlbəttə ki, kimsə icmanın olması ilə razılaşmaya bilər və razılaşmayan alimlərimiz olub. Lakin heç kim əksər səhabələrin Əliyə - Allah ondan razı olsun! – beyət etdiyini inkar edə bilməz. Əbu Abdilləh İbn Sad (vəfatı hicri 230) “ət-Tabəqat” kitabında deyir:

> “ لَمَّا قُتِلَ عُثْمَانُ، رَحِمَهُ اللَّهُ، يَوْمَ الْجُمُعَةِ لِثَمَانِي عَشْرَةَ لَيْلَةً مَضَتْ مِنْ ذِي الْحِجَّةِ سَنَةَ خَمْسٍ وَثَلَاثِينَ، وَبُويِعَ لِعَلِيِّ بْنِ أَبِي طَالِبٍ، رَحِمَهُ اللَّهُ، بِالْمَدِينَةِ الْغَدَ مِنْ يَوْمِ قَتْلِ عُثْمَانَ بِالْخِلَافَةِ بَايَعَهُ طَلْحَةُ، وَالزُّبَيْرُ، وَسَعْدُ بْنُ أَبِي وَقَّاصٍ، وَسَعِيدُ بْنُ زَيْدِ بْنِ عَمْرِو بْنِ نُفَيْلٍ، وَعَمَّارُ بْنُ يَاسِرٍ، وَأُسَامَةُ بْنُ زَيْدٍ، وَسَهْلُ بْنُ حُنَيْفٍ، وَأَبُو أَيُّوبَ الْأَنْصَارِيُّ، وَمُحَمَّدُ بْنُ مَسْلَمَةَ، وَزَيْدُ بْنُ ثَابِتٍ، وَخُزَيْمَةُ بْنُ ثَابِتٍ، وَجَمِيعُ مَنْ كَانَ بِالْمَدِينَةِ مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ صلّى الله عليه وسلم، وَغَيْرِهِمْ،”

> “**Osman – Allah ona rəhmət etsin! – 35-ci ildə zul-hiccə ayının 18-ci gecəsi cümə günü öldürüldükdə Osmanın qətl edildiyi günün sabahsı Mədinədə Əli bin Əbi Talibə - Allah ona rəhmət etsin! – xəlifə olaraq beyət edildi; ona Talha, əz-Zubeyr, Sad bin Əbi Vaqqas, Said bin Zeyd bin Amr bin Nufeyl, Ammar bin Yəsir, Usəmə bin Zeyd, Səhl bin Huneyf, Əbu Əyyub əl-Ənsari, Muhəmməd bin Məsləmə, Zeyd bin Səbit, Xuzeymə bin Səbit və Mədinədə olan Allahın elçisinin – salləllahu aleyhi va sələm – səhabələrinin və digərlərinin hamısı beyət etdi.**”[70]

İbn Sad bir tarixçi alim kimi rəvayətlərə əsaslanaraq bunu qeyd edir. Ümumiyyətlə raşidi xəlifələrin hamısında beyət ən azından həll və əqd əhlinin böyük əksəriyyətindən sadir olub və bunda şəkk yoxdur. Bu isə həll və əqd əhlinin cumhurunun beyətini- əgər onların beyətini qısa bir müddət içində almaq mümkündürsə - şərt görənlərin məzhəbini dəstəkləyir.

Aydın olur ki, Əbul-Məhasin qardaşımızın bu misalda öz xətalı məzhəbini dəstəkləyəcək heç bir dəlil yoxdur. Əksinə onun özünə qarşı dəlil vardır.

[69]“Ləvamiul-Ənvaril-Bəhiyyə”, 2/345
[70] “ət-Tabəqat əl-Kubra”, 3/31

## Təğallub şər'i bir yoldurmu?

Toxunmaq istədiyimiz ikinci iddia imamətin təbiəti ilə, mahiyyəti ilə bağlıdır. Çünki məqalə sahibi bununla bağlı bəzi ziddiyyətli sözlər yazıb. Əbul-Məhasin qardaş məqaləsində buyurur:

> "**Həll və əqd əhli ilə məşvərət və onların beyəti Əhli Sünnənin icması ilə xilafətin qurulması yaxud elanı üçün şərt deyil. Çünki xilafəti elan etməyin vaciblik mənatı (səbəbi, illəti) yalnız qüdrətdir. Həll və əqd əhlinin məşvərəti və beyəti xilafətin elanı deyil yalnız xəlifənin seçilməsi üçün şərtdir və onun yollarından biridir. Çünki İbn Teymiyyənin qeyd etdiyi kimi xilafət Allaha yaxınlaşdıran bir ibadətdir. Bu üzdən xilafət elanının səhihlik şərti kimi həll və əqd əhlinin razılığı hesaba alınmır. Bunu etməyə güc və qüdrət olacağı zaman o qurulur. Həll və əqd əhlinin baxışı isə yalnız xəlifənin seçimi və ona beyət etməsi və tövsiyələri ilə məhdudlaşır. Buna görə də onların beyəti məsələsi xilafət qurmağın səhihliyi ilə bağlı deyil. Çünki xilafət, həll və əqd əhlinin çıxartdıqları qərar ilə deyil şəriət və icma ilə sabit olur. Həll və əqd əhlinin yaxud onlardan bəzisinin görüşləri və qərarları isə sırf olaraq xəlifənin seçimi ilə əlaqəlidir.**"

Burada çox böyük bir təxbit vardır. Bu qardaşımız məsələləri tamamilə qarışdırmışdır. Sözünün əvvəlində qeyd etdiyinə görə xilafətin qurulmasında həll və əqd əhli ilə məşvərət və onların beyəti şərt deyildir və bunu əhlüs-sünnət'in icması kimi oxucularına təqdim etmişdir.
İlk iddia budur ki, həll və əqd əhli ilə məşvərət və onların beyəti xilafətin qurulması, yaxud elanı üçün şərt deyildir. Daha sonra bu cümləsini daha təfsilatlı şəkildə qeyd edərək deyir ki, həll və əqd əhlinin məşvərəti və beyəti xilafətin elanı deyil, yalnız xəlifənin seçilməsi üçün şərtdir və onun yollarından biridir. Ümid edirəm ki, oxucularımız burada istifadə edilən cümlələri anlayırlar. Lakin biz daha da aydın başa düşülməsi üçün bu cümlələrin həqiqətinə varaq. Bizim Əbul-Məhasin qardaşımız demək istəyir ki, həll və əqd əhlinin məşvərəti və beyəti xilafətin qurulması üçün şərt deyildir, yalnız xəlifənin seçilməsi üçün şərtdir. O zaman onun qəsdini başa düşmək üçün özümüzə belə bir sual verə bilərik: hansı halda xəlifə seçilmədən xilafət qurula bilər? Məlumdur ki, fiqh kitablarında qeyd edildiyinə əsasən xəlifət üç yolla qurula bilər. Birinci yol səhabələrin qurduqları kimi həll və əqd əhlinin beyəti ilə qurulur, ikinci yol Əbu Bəkrin Öməri özündən sonra vəliəhd olaraq təyin etməsi ilə olur, buna əhd yolu ilə xəlifə təyini deyilir. Lakin əslində bu, yeni bir xilafət qurmaq deyildir, artıq qurulmuş bir xilafətin davamıdır. Bir də üçüncü yol vardır və bu, həll və əqd əhli ilə məşvərət etmədən, onların beyətini almadan güc və qüvvət vasitəsi ilə hakimiyyəti ələ keçirmək yoludur. Buna termin olaraq "təğallub" deyirlər və bu cür hakimiyyətə gələnə "mutəğallib" deyirlər. Beləliklə də həll və əqd əhlinin

beyəti olmadan xilafət qurmağın yeganə yolu “təğallub” yoludur və Əbul-Məhasin sözündə bunu qəsd edir, lakin hansısa səbəbdən bunu aşkar şəkildə ifadə etmir. Beləliklə də Əbul-Məhasin qardaşımız “təğallub” variantını əlində əsas tutaraq həll və əqd əhlinin məşvərətinin, seçiminin xilafəti qurmaq üçün şərt olmadığını oxucularına çatdırmaq istəyir. Ancaq işlətdiyi sözlər bir qədər aldadıcıdır, çünki bunun əvəzinə “həll və əqd əhli ilə məşvərət edərək, onların beyətini alaraq xilafət qurmaq yeganə yol deyildir, güc və qüvvət ilə, qəhr ilə kütlələri tabe etdirərək xilafət qurmaq yolu da vardır” desəydi daha aydın, daha doğru olardı.
Ola bilsin ki, biz Əbul-Məhasin qardaşın qəsdini doğru anlamırıq, ola bilsin ki, qardaşımız burada tamamilə başqa bir şeyi qəsd edir. Bunun üzərində də düşündük. Lakin zikr etdiyimiz “təğallub” yolu qəsd edilmirsə o zaman xəlifə seçilmədən necə xilafət qurmaq mümkün ola bilər ki? Çünki xəlifəsiz xilafət olmur, yəni xilafət qurduqdan sonra xəlifə seçmək ziddiyyətdir, bu hasil olan şeyin təhsil edilməsi deməkdir. Bu, miras aldığın evi, yəni sənin mülkiyyətində olan bir evi almaqdan ötrü üçüncü bir şəxsə pul ödəməyinə bənzəyir, çünki mülkiyyətində olan bir şey artıq sənindir və onu almağa ehtiyac yoxdur. Ona görə də əgər xilafət qurulubsa deməli artıq xəlifə vardır, o zaman onu seçməyə ehtiyac yoxdur. Buna görə də Əbul-Məhasin qardaşımızın nəyi qəsd etdiyini anladığımızdan əminəm.
Üstəlik Əbul-Məhasin’in qəsdini doğru anladığımızda əmin olmağımızın əsas səbəbi budur ki, Əbul-Məhasin qardaşımız bu sözlərini Əbu Xabbəb əl-İraqi adlı məchul birinin məqaləsindən götürüb, belə ki, Əbu Xabbəb adlı məchul bir şeyx “İmam əl-Cuveyni xəlifə əl-Bağdadi’yə beyət edir” adlı bir məqalə yazıb və o məqaləsində bu sözləri deyir:

“أن مشورة أهل الحل والعقد وبيعتهم ليست شرطاً في إعلان الخلافة وقيامها بالإجماع ؛ إذ مناط وجوب إعلان الخلافة هو القدرة فقط كما نقلنا الإجماع على ذلك ، وإنما يشترط مشورة أهل الحل والعقد وبيعتهم في اختيار الخليفة لا الخلافة”

“**Həll və əqd əhlinin məşvərəti və beyəti icma ilə xilafətin elan edilməsi və onun qurulması üçün şərt deyildir, çünki xilafətin elan edilməsinin vacibliyinin mənatı təkcə qüdrətdir, necə ki, bu barədə icma nəql etdik. Həll və əqd əhlinin məşvərəti və onların beyəti xilafətdə deyil, yalnızca xəlifə seçimində şərtdir.**”[71]

Daha sonra Əbul-Məhasin qardaşın gətirdiyi kimi İbn Teymiyyə’nin xilafətin qürbət və ibadət olduğunu dediyini zikr edir. Ona görə də Əbul-Məhasin qardaşın suyunu hansı bulaqdan içdiyini çox gözəl bilirik. Lakin maraqlı tərəf budur ki, Əbu Xabbəb bu məqaləsində “xilafətin elan edilməsinin vacibliyinin mənatının təkcə qüdrət” olması barədə daha əvvəl icma nəql etdiyini deyir, halbuki bu sözlərini məqaləsinin əvvəllərində zikr etməsinə baxmayaraq ondan öncə qüdrətlə bağlı yazdığı bütün nəqllərə baxdıqda belə bir icma ilə rastlaşmırıq.

71 http://justpaste.it/gar5

Rastımıza çıxan nəqllər sadəcə olaraq xilafətin qüdrət ilə vacib olduğunu bildirir. Necə ki, İbn Teymiyyə’dən nəql etdiyi nəqldə deyir:

“وتَحْقِيقُ الْأَمْرِ أَنْ يُقَالَ: انْتِقَالُ الْأَمْرِ عَنْ خِلَافَةِ النُّبُوَّةِ إِلَى الْمُلْكِ: إِمَّا أَنْ يَكُونَ لِعَجْزِ الْعِبَادِ عَنْ خِلَافَةِ النُّبُوَّةِ أَوْ اجْتِهَادٍ سَائِغٍ أَوْ مَعَ الْقُدْرَةِ عَلَى ذَلِكَ عِلْمًا وَعَمَلًا؛ فَإِنْ كَانَ مَعَ الْعَجْزِ عِلْمًا أَوْ عَمَلًا كَانَ ذُو الْمُلْكِ مَعْذُورًا فِي ذَلِكَ. وَإِنْ كَانَتْ خِلَافَةُ النُّبُوَّةِ وَاجِبَةً مَعَ الْقُدْرَةِ؛ كَمَا تَسْقُطُ سَائِرُ الْوَاجِبَاتِ مَعَ الْعَجْزِ”

**“Məsələnin təhqiqi belə deməkdir: vəziyyətin nübuvvət xilafətindən çıxaraq krallığa keçməsi ya müsəlmanların nübuvvət xilafətini qurmaqdan aciz olmaqlarına görədir və ya icazəli ictihada görədir və yaxud da elmlə və əməl ilə buna qadir olmaq ilədir; əgər elm və əməl baxımından aciz olduqlarına görədirsə krallıq sahibi bu işdə üzrlü sayılır - əgər ki, nübuvvət xilafəti qüdrət ilə vacibdir, necə ki, digər vaciblər də acizlikdə vaciblikdən düşür…”**[72]

Burada Şeyxul-İslam İbn Teymiyyə səhabi Müaviyənin nəbəvi xilafəti tərk edərək krallığa keçməsi və bunu təbrir edəcək halları zikr edir. Ümumiyyətlə İbn Teymiyyə’yə görə nübuvvət xilafətinin qurulmasının vacib yoxsa müstəhəb olması məsələsi ixtilaflıdır, vacib olan xilafətin qurulmasıdır və bunda ittifaq vardır, lakin bunun nəbəvi xilafət kimi olmasının vacibliyi və müstəhəbliyi ictihadi bir məsələdir. Bu, İbn Teymiyyə’nin dediyi sözlərdir. Lakin İbn Teymiyyə burada xilafət qurmağın vacibliyinin mənatının qüdrət olduğunu demir, çünki bir hökmün mənatı onun illətidir, qüdrət isə onun şərtidir. Misal üçün zəkatın vacib olmasının illəti zənginliyin hasil olmasıdır, başqa cür desək malın nisab həddinə çatmasıdır, lakin zəkatın vacib olmasının şərtləri mal sahibinin müsəlman olması, hürr olması, malın üzərindən bir ilin keçməsi və həmçinin zəkatı çıxarmağa imkanının olmasıdır, çünki qüdrət bütün ibadətlərdə şərtdir. Eləcə də cümə namazının vacibliyinin illəti vaxtının girməsidir, lakin cüməyə getməyə qadir olmaq onun şərtidir, vacibliyinin mənatı deyildir. Həmçinin qisasın vacib olmasının illəti qətldir, lakin qisasın vacibliyinin şərtləri vardır; buna qadir olmaq onun şərtlərindən biridir. Yəminin kəffarəsinin vacib olmasının illəti yəmin verənin o yəminini pozmasıdır, lakin kəffarənin vacibliyinin şərti ona qadir olmasıdır.

Üstəlik illəti, yəni hökmün mənatını təhqiq etmək müəyyənləşdirmək hər zaman aydın bir məsələ deyildir, çünki illət mənsus ola bilər, yəni şəriət mətnlərində bəlli bir hökmün illəti zikr oluna bilər, lakin çox zaman hökmlərin illəti istinbat ilə çıxarılır. Bu isə məsələnin ictihadi olduğunu ifadə edir. Bəzən illət aşkar ola bilər, bəzən gizli ola bilər, bəzən bir hökmün birdən çox illəti ola bilər. Bütün bunlar üsulul-fiqhdə keçən müzakirələrdir. Ona görə də Əbul-Məhasin qardaşımız məlumatlarını haradan götürdüyünə diqqət etməlidir, xüsusilə də öz təbiri ilə desək “taleyüklü” bir işə girişibsə bunda həddindən ziyadə məsuliyyətli olmalıdır.

Lakin deyə bilərik ki, xilafətin vacibliyinin illəti ümmətin məsləhətlərinin zay olmasıdır və yaxud da vacib məsləhətlərin tamamlanması üçün yaranmış

[72] “Məcmu əl-Fətəva”, 35/25

ehtiyacdır. İlləti hansı şəkildə təbir etməyimizdən asılı olmayaraq bu, həm xilafətin əqlən vacib olduğunu deyənlərə görə, həm də şərən vacib olduğunu deyənlərə görə səhihdir. Burada mənatın təhqiqi ictihadi olduğu üçün nəzərlər fərqlənə bilər.

Qüdrətin burada şərt olduğunu anladıqdan sonra qeyd etməliyik ki, məsələnin bu yerində önəmli olan iki sual vardır: qurulan "xilafət" şəriətin tələb etdiyi vacib olan xilafətdir? Əgər deyilsə o zaman vacib olan xilafəti qurmaq üçün qüdrət varmı? Bu suallara cavab vermədən öncə Əbul-Məhasin qardaşımızın məchul iraqlıdan gətirdiyi iddianın digər hissəsinə nəzər salaq. Əbul-Məhasin qardaşımız deyir:

> "**Çünki İbn Teymiyyənin qeyd etdiyi kimi xilafət Allaha yaxınlaşdıran bir ibadətdir. Bu üzdən xilafət elanının səhihlik şərti kimi həll və əqd əhlinin razılığı hesaba alınmır**"

Burada qardaşımız bu sözü ilə daha əvvəl zikr etdiklərini əsaslandırmağa çalışır. Lakin bunun doğru olub olmamasından asılı olmayaraq xilafətin bir ibadət olmasının onun dedikləri ilə heç bir əlaqəsi yoxdur. İbn Teymiyyə'nin isə xilafətin özünün bir ibadət olduğunu deməyinə gəldikdə isə bununla qəsd olunan istilah olaraq ibadət deyildir, lakin Allahı razı salmaq üçün edilən hər bir şey qürbət və ibadət olduğu kimi xilafəti qurmaq da onun kimi bir ibadətdir, qürbətdir, necə ki, kişinin öz halalı ilə cinsi əlaqədə olması da ibadətdir. Lakin xilafət mahiyyət etibarı ilə ibadətlərə daxil deyildir, əqdlərə daxildir. Nikah bir əqd olduğu kimi xilafət də bir əqddir və ümmət ilə xəlifə arasında bağlanan bir əqddir. Ona görə də əqdlərdə keçərli olan şərtlərə tabe olmasıdır. Nikahda vəlinin razılığı alimlərin əksəriyyətinə görə əqdin səhihliyi üçün şərt olduğu kimi xilafətdə də ümmətin razılığını, daha dəqiq desək ümmətin razılığını təmsil edən həll və əqd əhlinin razılığı və beyəti şərtdir. Bunu anlamaq çox önəmlidir. Ona görə də alimlərimiz vurğulayırlar ki, əgər imamlıq şərtlərini ödəyən yalnız bir nəfər qureyşli varsa o, həll və əqd əhlinin beyəti olmadan imam ola bilməz, necə ki, bu məqama layiq olan bir neçə nəfər olduqda həll və əqd əhli onlardan heç birini məcbur bu vəzifəyə gətirə bilməz. Ona görə də Əbul-Həsən əl-Məvardi deyir:

"وَاخْتَلَفَ أَهْلُ الْعِلْمِ فِي ثُبُوتِ إمَامَتِه وَانْعِقَادِ وِلَايَتِه بِغَيْرِ عَقْدٍ وَلَا اخْتِيَارٍ؛ فَذَهَبَ بَعْضُ فُقَهَاءِ الْعِرَاقِ إلَى ثُبُوتِ وِلَايَتِه وَانْعِقَادِ إمَامَتِه، وَحَمْلِ الْأُمَّةِ عَلَى طَاعَتِه وَإِنْ لَمْ يَعْقِدْهَا أَهْلُ الاخْتِيَارِ؛ لِأَنَّ مَقْصُودَ الاخْتِيَارِ تَمْيِيزُ الْمُوَلَّى وَقَدْ تَمَيَّزَ هَذَا بِصِفَتِه. وَذَهَبَ جُمْهُورُ الْفُقَهَاءِ وَالْمُتَكَلِّمِينَ إلَى أَنَّ إمَامَتَهُ لَا تَنْعَقِدُ إلَّا بِالرِّضَا وَالاخْتِيَارِ، لَكِنْ يَلْزَمُ أَهْلَ الاخْتِيَارِ عَقْدُ الْإِمَامَةِ لَهُ، فَإِنْ اتَّفَقُوا أَثِمُوا؛ لِأَنَّ الْإِمَامَةَ عَقْدٌ لَا يَتِمُّ إلَّا بِعَاقِدٍ وَكَالْقَضَاءِ إذَا لَمْ يَكُنْ مَنْ يَصْلُحُ لَهُ إلَّا وَاحِدٌ لَمْ يَصِرْ قَاضِيًا حَتَّى يُوَلَّاهُ"

**"Heç bir əqd və seçim olmadan (imamlıq şərtlərini ödəyən birinin) imamlığının sabit olması, vilayətinin qüvvəyə minməsi barədə elm əhli ixtilaf edib. İraq fəqihlərindən bəzisi ixtiyar əhli**

> **(onun üçün imamlıq) əqd(ini) bağlamasa belə vilayətinin sabit olması, imamlığının qüvvəyə minməsi və ümmətin ona itaət etməyə məcbur edilməsi(nin caiz olması) görüşündə olub, çünki seçkidə məqsəd vəzifə veriləcək kəsin (başqaları arasından) ayırd edilməsidir və belə biri öz vəsfləri ilə üzə çıxmış olur. Fəqihlərin və mütəkəllimlərin əksəriyyəti isə bu görüşdədir ki, onun imamlığı yalnız razılıq və seçki ilə qüvvəyə minir. Lakin ixtiyar əhlinin imamlıq əqdini onun üçün bağlaması vacibdir, beləliklə də ittifaq edərlərsə tamamlamış olurlar, çünki imamlıq bir əqddir ki, onu bağlayan tərəf olmadan tamamlanmaz. Qazilik kimidir, qazilik məqamına yarayan yalnız bir nəfər olarsa o vəzifəyə təyin olunmayana qədər qazi olmaz.**”[73]

əl-Məvardinin cumhura nisbət etdiyi bu görüş sünnət əhlinin məşhur olan görüşüdür. Əhməd əl-Qalqaşəndi bununla bağlı əl-Məvardi’nin dediklərini məna ilə nəql edir və deyir:

“وَهُوَ مَا عَلَيْهِ جُمْهُور الْفُقَهَاء وَعَلِيهِ اقْتصر الرَّافِعِيّ وَالنَّوَوِيّ والْمُعْتَمد على ترجيحهما”

> “**Bu, fəqihlərin əksəriyyətinin üzərində olduğu görüşdür. ər-Rafi’i və ən-Nəvəvi yalnız bu görüşü qeyd etməklə kifayətləniblər və mötəməd rəy bu ikisinin tərcihinə əsaslanır.**”[74]

Bir sözlə imamlıq əqdi razılıq və ixtiyar əqdidir, tərəflərdən heç birinə məcburi qəbul etdirilə bilməz. Buradan anlayırıq ki, hətta imamlıq şərtlərini ödəyən biri həll və əqd əhlinin razılığı, beyəti olmadan güc və qüvvət yolu ilə ümməti özünə tabe etdirə bilməz. Əsli hökm budur. Eləcədə bunun əksi də doğrudur; əgər bir kimsə imam olmaq üçün tələb olunan bütün şərtləri ödəyərsə və imamlıq məqamına hamıdan daha layiq olarsa heç kim onu bu vəzifəni qəbul etməyə məcbur edə bilməz. əl-Məvardi deyir:

“وَإِنِ امْتَنَعَ مِنَ الْإِمَامَةِ وَلَمْ يُجِبْ إلَيْهَا لَمْ يُجْبَرْ عَلَيْهَا؛ لِأَنَّهَا عَقْدُ مُرَاضَاةٍ وَاخْتِيَارٍ لَا يَدْخُلُهُ إكْرَاهٌ وَلَا إجْبَارٌ”

> “**Əgər imamlıqdan imtina edərsə və buna icabət etməzsə buna məcbur edilməz, çünki bu, razılaşma və ixtiyar əqdidir və buna ikrah və məcburiyyət daxil olmaz.**”[75]

[73]“əl-Əhkəmus-Sultaniyyə”, səh: 9;
[74] “Məəsirul-İnəqa fi Məalimil-Xiləfə”, 1/48;
[75]Eyni mənbə; səh: 8

Bütün bunlar nəyə dəlalət edir? Bütün bunlar ona dəlalət edir ki, imamlıq bir əqddir, müasir dilimizdə desək bir kontraktdır. Əqdlərdəki əsllər isə razılıq üzərində qurulur, ikrah altında edilən əqdlər keçərli deyildir. Ona görə də bir çox böyük imamımız mutəğallib xəlifələrə verilmiş beyətlərin səhih olmamasına hökm vermişdir. Buna əsasən də əhlul-beyt'dən olan "ən-Nəfsuz-Zəkiyyə" ləqəbli imam Muhəmməd bin Abdilləh bin əl-Həsən üsyan etdikdə Mədinə əhli İmam Malik'dən ona qoşulmaq barədə fətva soruşdular, çünki xəlifə Əbu Cafər əl-Mənsur'a beyət etmişdilər. əz-Zəhəbi tarix kitabında deyir:

"...اسْتُفْتِيَ فِي الْخُرُوجِ مَعَ مُحَمَّدٍ وَقِيلَ لَهُ: إِنَّ فِي أَعْنَاقِنَا بَيْعَةٌ لِلْمَنْصُورِ، فَقَالَ: إِنَّمَا بَايَعْتُمْ مُكْرَهِينَ وَلَيْسَ عَلَى مُكْرَهٍ يَمِينٌ، فَأَسْرَعَ النَّاسُ إِلَى مُحَمَّدٍ وَلَزِمَ مَالِكٌ بَيْتَهُ."

> "**...Malikdən Muhəmməd ilə birlikdə üsyan etmək haqqında fətva istədilər və ona dedilər: "Bizim boynumuzda əl-Mənsur'a beyət var." Dedi: "Siz sadəcə məcbur olduğunuz üçün beyət etmişdiz, məcbur edilənin üzərinə yəmin yoxdur." Bunun üzərinə insanlar Muhəmmədə qoşulmağa tələsdilər və Malik evindən kənara çıxmadı.**"[76]

Əbu Cəfər əl-Mənsur isə abbasi xəlifələrindən ikincisi və ən güclüsüdür. Güc və qüdrətə əsasən xəlifə olmuşdur, ona beyət edənlərin bir çoxu qəhrindən qorxaraq, məcburiyyət altında beyət etmişdilər. Əgər mücərrəd qüdrət ilə xilafət vacibliyi yerinə yetirsə o zaman İmam Malik'in verdiyi bu fətvanın batil olduğunu söyləmək vacibdir, çünki xəlifə Mənsur tələb olanı şərtinə uyğun şəkildə yerinə yetirmiş olur. Bu isə təbii ki, belə deyildir. O zaman bizim Əbul-Məhasin qardaşımız hansı vəch ilə məsələdə icmanın olduğunu iddia edirdi? Əksinə alimlərdən gətirdiyimiz nəqllər onu göstərir ki, əsli hökm olaraq həll və əqd əhlinin beyəti şərtdir.

Burada önəmli olan bir başqa nöqtəyə toxunmalıyıq. Anlamaq lazımdır ki, alimlərimizin qeyd etdikləri xilafət qurmaq yollarından üçüncü yol əsl etibarı ilə məşru olmayan bir yoldur, yəni qanuni deyildir. Lakin baş verdiyi təqdirdə həmin mutəğallib hakimin hakimiyyəti zamanı verdiyi qərarları, etdiyi təsərrufları keçərli hesab edirlər və bunu etməklərinin səbəbi zərurətdir. Çünki bir kimsə bu şəkildə güc yolu ilə hakimiyyəti ələ alarsa o zaman üç seçim vardır. Ya ona qarşı vuruşaraq onu hakimiyyətdən endirmək, ya onun hakimiyyətini səhih saymamaq, təsərrüflərini keçərsiz hesab etmək və səbr etmək, yaxud da onun hakimiyyətini səhih saymaq, təsərrüflərini, etdiyi hökmləri keçərli saymaqdır. Birinci seçim daha böyük fəsada, müsəlman qanının axmasına götürür, ikinci seçim isə onun zamanında həyata keçirilmiş hökmlərin səhih olmamasını, yeni hakimin hakimiyyətə gəldiyi təqdirdə həmin təsərrüflərin ləğv edilməsini gərəkdirir, bura toplanan və paylanan zəkatlar, qənimətlər, cizyələr və daha bir çox böyük və ağır məsləhətlər daxildir. Bu seçim də fəsada səbəb olur. Ona görə də fəqihlərimiz bu məqamda ən doğru olanın mutəğallib hakimin

---

[76]"Tərixut-Tabəri", 7/560; "Tərixul-İsləm", 3/781; "Tarix İbn Xaldun", 3/240; "əl-Kəmil fit-Tərix", 5/111;

hakimiyyətini təsdiqləmək və keçərli saymaq olduğunu deyiblər. Bunun misalı budur ki, İmam Əhmədə görə qəsb olunmuş yerdə qılınan namazlar səhih olmadığı halda zalım sultanların qəsb etdikləri yerlərdə keçirdikləri cümə və bayram namazlarının zərurətə görə səhih saymasıdır. Bu misal üzərində düşünən başa düşəcək ki, İmam Əhmədin bu halda belə yerlərdə keçirilən cümə və bayram namazlarını səhih sayması heç də bu işin icazəli olmasına dəlalət etməz. İmam Əhmədə görə hakimin başqasının mülkünü qəsb edərək orada cami tikdirməsi və o camidə cümə və bayram namazlarını keçirməsi haramdır, lakin bunu edərsə cümə və bayram namazları Əhmədə görə səhihdir. İzahımızın hasili budur ki, alimlərin bu yolla qurulmuş xilafəti səhih saymaqları xilafəti bu yolla qurmağın icazəli olmasını gərəkdirməz. İbn Həcər əl-Məkki mutəğallib hakimin halını vəsf edərək deyir:

“لأن المتغلب فَاسق معاقب لَا يسْتَحق أن يبشر وَلَا يُؤمر بِالْإِحْسَانِ فِيمَا تغلب عَلَيْهِ بل إِنَّمَا يسْتَحق الزّجر والمقت والإعلام بقبيح أفعاله وَفَسَاد أَحْوَاله”

“**Çünki mutəğallib fasiqdir, cəzaya layiqdir, güclə ələ keçirdiyində müjdələnməyə, ihsan ilə əmr olunmağa layiq deyildir. Çəkindirilməyə, qınanmağa, etdiklərinin çirkinliyinin və halının pozğunluğunun elan edilməsinə layiqdir.**”[77]

Buradan başa düşürük ki, təğallüb yolu ilə, yəni güc istifadə edərək hakimiyyətə gəlmək haramdır, fisqdir. Lakin bunu edərsə zərurətin tələbi olduğu üçün hakimiyyəti səhih sayılacaq. Ona görə də hənəfi fəqihi əl-Həskəfi’nin “**mutəğallibin səltənəti zərurətə görə səhihdir**” sözlərini şərh edən İbn Adibin deyir:

“أَيْ مَنْ تَوَلَّى بِالْقَهْرِ وَالْغَلَبَةِ بِلَا مُبَايَعَةِ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ وَإِنْ اسْتَوْفَى الشُّرُوطَ الْمَارَّةَ. وَأَفَادَ أَنَّ الْأَصْلَ فِيهَا أَنْ تَكُونَ بِالتَّقْلِيدِ.”

“**Yəni (mutəğallib) həll və əqd əhlinin beyəti olmadan, qəhr və güc ilə - hətta daha əvvəl zikr olunmuş şərtləri ödəmiş olsa belə - hakimiyyəti ələ keçirən kəsdir. Bununla bundakı əslin vəzifəyə seçilmək yolu ilə olduğunu ifadə etmişdir.**”[78]

İbn Abidin bu sözləri ilə təğallub yolu ilə hakimiyyətə gəlməyin zərurətdə edilən bir yol olduğunu, başqa cür desək əslə müxalif yol olduğunu bizə öyrədir. Bu həqiqəti bizə ən gözəl və ən aydın şəkildə misirli Rəşid Rida izah edir:

“وَمعنى هَذَا أن سلطة التغلب كَأَكْل الْميتَة وَلحم الْخِنْزِير عِنْد الضَّرُورَة تنفذ بالقهر وَتَكون أدنى من الفوضى . وَمُقْتَضَاهُ أنه يجب السَّعْي دَائِمًا لإزالتها عِنْد الْإِمْكَان، وَلَا يجوز أن توطن الْأَنْفس على دوامها”

[77] “əs-Savaiq əl-Muhriqa”, 2/627;
[78] “Haşiyətu İbn Abidin”, 1/549;

“**Bunun mənası budur ki, təğallub (güc, qüvvət) hakimiyyəti zərurətdə ölü heyvan və donuz əti yemək kimidir ki, qəhr (güc, üstünlük) ilə həyata keçirilir və (fəsadı) qarışıqlıqdan/xaosdan daha az olur... Bunun tələb etdiyi məna budur ki, imkan olduqda onu daima aradan qaldırmağa səy göstərmək vacibdir və nəfslərin ona davamiyyətinə alışması icazəli deyildir.**”[79]

Məhz buna görə də fəqihlər qadının təğallub və qəhr yolu ilə imamlığa keçməsi halında imamlığının səhih olduğunu deyiblər, halbuki qadının imam seçilməsi hədislə qadağandır. Amma zərurətdə buna icazə veriblər. Yenə İbn Abidin haşiyəsində buyurur:

“(قَوْلُهُ أَوْ امْرَأَةً) اعْلَمْ أَنَّ الْمَرْأَةَ لَا تَكُونُ سُلْطَانًا إلَّا تَغَلُّبًا لِمَا تَقَدَّمَ فِي بَابِ الْإِمَامَةِ مِنْ اشْتِرَاطِ الذُّكُورَةِ فِي الْإِمَامِ، فَكَانَ عَلَى الشَّارِحِ أَنْ يَقُولَ وَلَوْ امْرَأَةً أَيْ وَلَوْ كَانَ ذَلِكَ الْمُتَغَلِّبُ امْرَأَةً”

“**Onun “və ya qadın” sözünə gəldikdə bil ki, imamət babında imamda kişiliyin şərt olması barədə daha əvvəl zikr etdiklərimizə əsasən qadın təğallub yolundan başqa yolla sultan ola bilməz. Şərh edənin (yəni əl-Həskəfi’nin) “qadın olsa belə” deməsi daha doğru olardı, yəni həmin mutəğallib qadın olsa belə.**”[80]

Umeyra ləqəbli şafi’i fəqihi Əhməd əl-Burullusi də haşiyəsində qadının təğallub yolu ilə imam olacağını təsdiqləyir. Lakin məlumdur ki, qadının imam olması peyğəmbərin – aleyhissalətu vassələm – sözü ilə qadağandır. Binaən aleyh bunu qəbul edən alimlərimiz yalnız və yalnız fitnəni dəf etməkdən ötrü qəbul ediblər. Mahmud bin İsmayıl əl-Xayrabəyti (vəfatı hicri 843) deyir:

“وَأما لَو استولى مستعد لَهُ شَوْكَة على خطة الْإِسْلَام، فَلَا تثبت لَهُ الْإِمَامَة عِنْد أهل السّنة وَالْجَمَاعَة عِنْد عدم الشَّرَائِط الْمَذْكُورَة فِيهِ، لَكِن الطَّاعَة وَاجِبَة عَلَيْهِ، دفعا للفتنة.”

“**Amma əgər güc/qüdrət ilə hazırlığı olan biri İslam ərazilərini istila edərsə, imam barəsində zikr olunmuş şərtlər olmadıqda əhlüs-sünnət val-cəmaata görə onun üçün imamlıq sabit olmur, lakin fitnəni dəf etmək üçün ona itaət etmək vacib olur.**”[81]

əl-Xayrabəyti “əd-Durratul-Ğarra” kitabını Misirdə məmlük sultanı çərkəz əslli Məlik Zahir Seyfuddin Çakmak üçün yazmışdır. Burada işlətdiyi “imamlığı sabit olmur” sözü ilə nəzərdə tutduğu imamlığının məşru olmamasıdır. Şafi’i fəqihlərindən əş-Şibramillisi, əl-Abbadi və başqaları haşiyələrində bu mənaya

[79] “əl-Xiləfə”, səh: 45;
[80] “Haşiyətu İbn Abidin”, 2/139;
[81] “əd-Durratul-Ğarra fi Nəsihətis-Sələtin val-Quda val-Umərə”, səh: 137;

gələcək sözlər işlədirlər. Alimlərin sultanı ləqəbini qazanmış böyük üsulçu Alləmə İzzuddin bin Abdissələm (577-660) deyir:

“وَالَّذِي أَرَاهُ فِي ذَلِكَ أَنَّا نُصَحِّحُ تَصَرُّفَهُمْ الْمُوَافِقَ لِلْحَقِّ مَعَ عَدَمِ وِلَايَتِهِمْ لِضَرُورَةِ الرَّعِيَّةِ، كَمَا نُصَحِّحُ تَصَرُّفَاتِ إمَامِ الْبُغَاةِ مَعَ عَدَمِ أَمَانَتِهِ؛ لِأَنَّ مَا ثَبَتَ لِلضَّرُورَةِ تُقَدَّرُ بِقَدْرِهَا، وَالضَّرُورَةُ فِي خُصُوصِ تَصَرُّفَاتِهِ، فَلَا نَحْكُمُ بِصِحَّةِ الْوِلَايَةِ فِيمَا عَدَا ذَلِكَ، بِخِلَافِ الْإِمَامِ الْعَادِلِ فَإِنَّ وِلَايَتَهُ قَائِمَةٌ فِي كُلِّ مَا هُوَ مُفَوَّضٌ إلَى الْأَئِمَّةِ.”

**“Mənim bu barədə rəyim budur ki, biz vilayətləri olmasa da rəiyyənin zəruri ehtiyacları üçün onların haqqa müvafiq olan icraatlarını səhih sayırıq, necə ki, etibarsız olsa da bağilərin imamının icraatlarını səhih sayırıq, çünki zərurətə görə sabit olan bir şey miqdarına görə ölçülür. Burada zərurət isə xüsusilə onun icraatları ilə məhduddur, ona görə də bundan başqa işlərdə onun vilayətinin səhihliyinə hökm etmirik. Adil imam isə bu baxımdan ondan fərqlənir, belə ki, onun vilayəti imamlara həvalə edilmiş bütün işlərdə keçərlidir/səhihdir.”**[82]

Alləmə İbn Abdissələm’in – rahmətullahi aleyhi – sözlərindən başa düşürsən ki, alimlər “mutəğallib’in hakimiyyətinin səhih olduğunu” deyərkən bununla onun haqqa müvafiq olan icraatlarının səhih olduğunu qəsd edirlər. Ona görə də İbn Teymiyyə buyurur:

“وَالْإِمَامُ الْعَدْلُ تَجِبُ طَاعَتُهُ فِيمَا لَمْ يُعْلَمْ أَنَّهُ مَعْصِيَةٌ وَغَيْرُ الْعَدْلِ تَجِبُ طَاعَتُهُ فِيمَا عُلِمَ أَنَّهُ طَاعَةٌ كَالْجِهَادِ.”

**“Adil imama masiyət olduğu bilinməyən hər bir şeydə itaət etmək vacibdir, adil olmayana isə (yalnız Allaha) itaət olduğu bilinən işlərdə itaət etmək vacibdir.”**[83]

Əlqərəz, təğallub yolu ilə hakimiyyətə gəlmək əslə müxalifdir, məşru deyildir. Ona görə də həll və əqd əhlinin razılığı, beyəti imamlığın qurulmasında şərt deyildir demək nikahda vəlinin razılığı şərt deyildir deməklə eynidir. Çünki zərurətdə bir şeyin şərtiyyətinin düşməsi onun əslən şərt olması anlamına gəlməz. Sözümüzün canı budur ki, Əbu Xabbəb burada məsələləri qarışdırıb və qardaşımız Əbul-Məhasin də ona bu təxbitində tabe olub.

---

[82] “Qavaidul-Əhkəm fi Məsalihil-Ənəm”, 1/107;
[83] “Məcmu əl-Fətəva”, 29/196

## Beyət olmadan da imamlıq ola bilərmi?

Bura qədər yazdıqlarımızın davamını daha konkret bir halın üzərində davam edək. O da bizim zamanımızda imamın, yəni xəlifənin olmaması halında bir nəfərin həll və əqd əhlinin beyətini almadan təğallub yolu ilə hakimiyyətə gəlməsi məsələsidir. Əbul-Məhasin qardaşımız və onun kimi düşünənlər iddia olunan xəlifəliyi müdafiə edərkən əsasən buna əsaslanırlar. Məchul Əbu Xabbəb əl-İraqi də əl-Cuveyni'dən gətirdiyi sitatında məhz bu vəziyyətə əsaslanır. Bu səbəblə ilk öncə bu barədə qardaşımızın yazdığı sözləri zikr edək və daha sonra onları analiz edək. Qardaşımız deyir:

> **"Cuveyni imamlıq barədə yazdığı "Ğiyəsul-Uməm" kitabında önəmli bir məqama toxunur. Bu da əgər hər hansı bir dönəmdə imam olmasa bu zaman müsəlman necə davranmalıdır. Cuveyni bu məsələyə izah gətirib buyurur:**
>
> **"Ancaq əgər həmin vəzifəyə (imamlığa) yararlı olmaq üçün bütün sifətləri özündə cəm edən bir şəxs və həmin dönəmdə seçən və imamlıq əqdini bağlayan adam mövcud olsa, bu halda məsələ iki qismə bölünəcək:**
>
> **Birinci: Həll və əqd əhlindən olanın, məsələ ona ərz edildikdən sonra qəsdən seçməkdən və əqdi bağlamaqdan imtina etməsidir. Belə olacağı təqdirdə imamlığa yararlı olan şəxs insanları (özünə beyət etməyə) çağıracaq. İnsanlara isə imkan çərçivəsində eşidib itaət etmək üzərə ona icabət etmək və tabe olmaq vacib olur. Bu halda bir anlıq belə ona müvafiq gəlməkdən yubanmaq icazəli deyil. Sazişi (əqdi) bağlamaqdan imtina edənin varlığı və yoxluğu isə eyni cür qiymətləndiriləcək. İmtina edən şəxsin imtina etməkdə və həmin vəzifəyə haqlı olana müvafiq gəlməyi və ona tabe olmağı tərk etməkdə heç bir üzürü olmayacağı zaman, məsələ onun həmin işin əhlindən xaric olması ilə nəticələnəcək. Çünki həmin şəxs fasiqlik və ədavət üzərə israrla durur. İslamın ərazilərini qorumaqda öz əksini tapan külli məsələylə əlaqəli olan şeyləri təxirə salmaq isə haramlığı bəlli olan şeydir. Bu işdə yubanmaq heç də yüngül iş deyil.**

**İkinci: İxtiyar əhlindən olanın (imamı seçməkdən) imtina etməməsidir.**
**Həmin vəzifəyə yararlı olmaq üçün bütün sifətləri özündə cəm edənə fərz edilən imamlığın sabit olması əqdin bağlanmasına yoxsa əqdi bağlayana ərz etməyə dayanır? Bu da həmin fənn barədə danışanların ixtilaf etdikləri məsələdir. Bəziləri əqdin labüd olduğunu demişlər. Çünki onun bağlanması mümkündür. Habelə o imamlığın təsdiq edilməsi üçün səbəbdir.**
**Mənim bəyəndiyim görüş isə; yeni sazişi ortaya gətirməyə, habelə seçim və qəsdi irəli sürməyə ehtiyacın olmamasıdır. Buna səbəb isə müəyyən bir dönəmdə imamlıq vəzifəsinə yararlı olan bir neçə nəfər olacağı zaman, onlardan birini seçmək labüd olacaq. Çünki onlardan bəzisinin digərlərindən heç bir üstünlüyü yoxdur. İmam seçməyin vacibliyinin açıq-aydın olmasına rəğmən əgər biz seçmək imkanı əldə edə bilməsək, bu cür durum çəkişmə və qarşıdurmaya gətirib çıxaracaq. Seçim, əqd və önə çəkmənin yalnız qarşıdurmaya son qoymaq təsiri vardır. Halbuki seçim, saziş bağlayan şəxs üçün mülkiyyəti yaxud hakimliyi ifadə etmir. Yəni o imamlığı isbat edəcəyi zaman bu işdə şərikə çevrilmir. Ancaq əgər müəyyən dönəmdə imamın sifətlərini özündə cəm edən və bu işə yararlı olan bir şəxs irəli atılarsa, bu zaman əqd bağlayanın və bəyanın vacibliyi lüzumsuz olacaq.**

**Bu məsələdə haqqı izah edən amil odur ki, əgər belə təsəvvür edilsə, bəzilərinin ixtiyar əhli olaraq hesab etdikləri şəxsə ona beyət etməsi, ona tabe olması, onu seçməsi və ona yönəlməsi vacib olacaq. Əgər (ixtiyar əhli sayılan) şəxs bundan imtina etsə imamlıq ondan asılı olmadan davam edəcək. Belə durumda seçimi şərt gətirməyin heç bir mənası yoxdur. Bu zaman saziş bağlayan olaraq qələmə verilən şəxsə seçim qalmır.**

**Həmin vaxt imamın sifətlərini özündə cəm edən şəxs bu vəzifə üçün müəyyən ediləcəyi zaman o insanların qərarı ilə olacaq təyinata lüzum görməyəcək.**

**Bu məram haqda dolğun söz isə önəmli bir məsələni qeyd etməyi tələb edir. O da: Əgər bir kişi seçim və sazişsiz keçinsə onun güc yolu ilə hakimiyyəti ələ keçirtməsi və camaatı ona itaət etməyə çağırması labüddür. Əgər o bunu etsə, bu zaman o həm (ona) müvafiq və tabe olanlar həm də (onun) əleyhinə çıxan və çəkişən adamlar üzərində imamdır.”**

Bura qədər Əbul-Məhasin qardaş bizlərə əl-Cuveyni’nin sözlərini tərcümə etdi. Tərcümədə dəqiqləşdirilməsi lazım olan məqamlar vardır və qarşıda göstəriləcəyi kimi mütərcim o məqamları nəzərə almamışdır. Qardaşımız əl-Cuveyni’nin sözlərini təqdim etdikdən sonra oxucularına o sözləri oxucularına özünün istədiyi tərzdə təqdim edir. Gəlin birlikdə oxuyaq:

> “**Cuveyninin sözlərinin izahı: Əgər imamlıq vəzifəsi boş və onu icra edəcək şəxsdən xali qaldığı halda imama xas olan keyfiyyətləri özündə cəm edən insan həmin işi öz öhdəsinə götürüb ona hakim cıxsa və insanlar içində bu vəzifəyə ən haqlı adam olsa, eyni zamanda həmin dönəmdə həll və əqd əhlindən hər hansı biri mövcud olsa, belə olan təqdirdə onların iki halı olacaq:**”

Burada izahın əvvəlindən əl-Cuveyni’nin zikr etdiyi halı xüsusiləşdirən çox önəmli bir vəsf düşürülmüşdür. Əbul-Məhasin qardaşın bunu qəsdən etdiyini, yoxsa xəta ilə baş verdiyini bilmirəm, lakin hüsnü zənnin tələbi olaraq bunun xəta ilə baş verdiyini deyək. Lakin bu önəmli vəsf olmadan əl-Cuveyni’nin dediklərini doğru anlamaq mümkün deyildir. əl-Cuveyni burada tamamilə xüsusi bir hal fərz edir. Təkcə zamanın imamdan xali olduğu, yəni ümmətin xəlifəsiz yaşadığı bir zamanı fərz etmir, həmçinin belə bir zamanda imamlığa yarayan tək bir nəfərin olduğunu da fərz edir. Yəni həmin bu nəfərdən başqa heç kim imamlıq vəzifəsinə yaramır. Gəlin onun sözlərini bir daha oxuyaq. Əbul-Məali əl-Cuveyni deyir:

“فَأَمَّا إِذَا اتَّحَدَ مَنْ يَصْلُحُ، وَفِي الْعَصْرِ مَنْ يَخْتَارُ وَيَعْقِدُ، فَهَذَا يَنْقَسِمُ قِسْمَيْنِ”

> “**Amma əgər (imamlığa) yararlı olan kəs yeganə şəxs olarsa və həmin əsrdə seçən və əqd bağlayan kəs varsa, bu hal iki qismə ayrılır.**”[84]

Doğru tərcümə bizim təqdim etdiyimiz kimi olmalıdır. Onun tərcüməsi ilə bizim təqdim etdiyimiz tərcümə arasındakı fərq budur ki, bizim etdiyimiz tərcümədə əl-Cuveyni’nin qəsdi tam olduğu kimi çatdırılıb, çünki əl-Cuveyni burada xüsusi bir halı fərz edir, o da imamlığa yarayan kəsin həmin zaman tək yeganə kəs olması halıdır. əl-Cuveyni’nin kitabını təhqiq etmiş Doktor Abdulazim Mahmud əd-Dib əl-Cuveyni’nin “ittəhədə” sözü üzərinə dipnot əlavə edərək deyir: “**Yəni ki, tək bir fərddən başqası olmazsa.**” Əbul-Məhasin qardaşımızın tərcüməsindən bu aydın şəkildə anlaşılmır. İstənilən halda bunu oxucularımızın diqqətinə çatdırmaq istədik. Rahatlıqla deyə bilərik ki, əl-Cuveyni’nin zikr etdiyi bu hal bizim halımıza aid deyildir, çünki heç şübhəsiz ki, ümmətdə Əbu Bəkr əl-Bağdadi adlı şəxsdən də daha əfzəl, imamlıq məqamına daha layiq olan şəxslər vardır. Ola bilsin ki, bu xilafəti dəstəkləyənlər onun imamlığa yarayan yeganə müsəlman olduğuna inanırlar. Əgər həqiqətən də buna inanırlarsa o zaman belə zehniyyətin sahibi olan insanlardan doğru-düzgün bir iş gözləmək doğru olmaz.
Vurğuladımız tək bu nöqtə belə kifayət edir ki, əl-Cuveyni’dən gətirilən bu halın bizim halımıza uyğun olmadığını sübut edək. İddia olunan “xəlifə” nəinki bu dəhrin imamlığa yararlı olan tək və yeganə müsəlmanıdır, hətta heç imamlıq şərtlərini ümumiyyətlə tam ödəməyən biridir. Lakin faydanın tam hasil olması üçün sözümüzə davam edirik. Qardaşımız davamında deyir:

> “**Birinci hal: Onlar xəlifənin kimliyinə baxmadan xilafət vəzifəsini seçməkdən, saziş bağlamaqdan və ona nəzər yetirməkdən imtina edirlər. Bu zaman onun imamlığı səhih olur və bütün insanlara**

[84] “əl-Ğiyəsi”, səh: 318;

**imkan dairəsində ona beyət etmək və ona itaət etmək vacib olur. Həll və əqd əhlindən bundan imtina edənə isə fasiq hökmü çıxarılır və o bu işin əhlindən xaric edilir.**”

Əbul-Məhasin qardaşımız bu hissəni yuxarıda belə tərcümə edib: “**Belə olacağı təqdirdə imamlığa yararlı olan şəxs insanları (özünə beyət etməyə) çağıracaq. İnsanlara isə imkan çərçivəsində eşidib itaət etmək üzərə ona icabət etmək və tabe olmaq vacib olur.**” Burada ərəbcədə önəmli hissə düşürülüb. Onu yerinə qaytarmaq bizim boynumuza düşür. Beləliklə də bildik ki, əl-Cuveyni burada xüsusi bir haldan danışır və o, bir dövrdə imamlığa yararlı olan yeganə bir fərdin olması ilə xasdır. Bu halı iki qismə ayırır və birinci qisim üçün deyir:

“أَحَدُهُمَا - أَنْ يَمْتَنِعَ مَنْ هُوَ مِنْ أَهْلِ الْعَقْدِ عَنِ الاخْتِيَارِ وَالْعَقْدِ، بَعْدَ عَرْضِ الْأَمْرِ عَلَيْهِ عَلَى قَصْدٍ، فَإِنْ كَانَ كَذَلِكَ فَالْمُتَّحِدُ فِي صَلَاحِهِ لِلْإِمَامَةِ يَدْعُو النَّاسَ، وَيَتَعَيَّنُ إِجَابَتُهُ وَاتِّبَاعُهُ عَلَى حَسَبِ الِاسْتِطَاعَةِ بِالسَّمْعِ وَالطَّاعَةِ.”

“**İki (qisim)dən birincisi: Əqd əhlindən olana bu məsələ ərz edildikdən sonra qəsdən seçməkdən və əqdi bağlamaqdan imtina edir, əgər belə olarsa imamlığa yararlılığında tək qalan həmin kəs insanları (beyətə) çağırmalıdır və on(un çağırışın)a icabət etmək, bacarıq dairəsində ona dinləyərək və itaət edərək tabe olmaq vacib olur.**”

Gördüyümüz kimi əl-Cuveyni hələ də “imamlığa yararlılığında tək qalan” bir nəfərdən danışır. Əgər belə bir hal fərz edilərsə, yəni ümmətdə imamlığa yararlı olan tək bir nəfər olarsa və həll və əqd əhli ona beyət etməkdən imtina edərsə, o zaman o, geri çəkilməməli, insanları itaətə çağırmalıdır və bu zaman ona itaət etmək insanlara vacib olur. əl-Cuveyni daha sonra deyir:

“وَلَا يَسُوغُ الْفُتُورُ عَنْ مُوَافَقَتِهِ - الْحَالَةَ هَذِهِ - فِي سَاعَةٍ، وَوُجُودُ ذَلِكَ الْمُمْتَنِعِ عَنِ الْعَقْدِ وَعَدَمُهُ بِمَثَابَةٍ وَاحِدَةٍ، وَإِذَا لَمْ يَكُنِ [لِلَّذِي] أَبْدَى امْتِنَاعًا عُذْرٌ فِي امْتِنَاعِهِ، وَتَرْكِ مُوَافَقَةِ الْمُتَعَيِّنِ لِلْأَمْرِ وَاتِّبَاعِهِ فَالْأَمْرُ يَنْتَهِي إِلَى خُرُوجِهِ عَنْ أَنْ يَكُونَ مِنْ أَهْلِ هَذَا الشَّأْنِ، لِمَا تَشَبَّثَ بِهِ مِنَ التَّمَادِي فِي الْفِسْقِ وَالْعُدْوَانِ، فَإِنَّ تَأْخِيرَ مَا يَتَعَلَّقُ بِالْأَمْرِ الْكُلِّيِّ فِي حِفْظِ خُطَّةِ الْإِسْلَامِ تَحْرِيمُهُ وَاضِحٌ بَيِّنٌ، وَلَيْسَ التَّوَانِي فِيهِ بِالْقَرِيبِ الْهَيِّنِ. فَهَذَا أَحَدُ قِسْمَيِ الْكَلَامِ.”

“**Bu halda bir an belə olsa ona müvafiq olmaqda yubanmaq olmaz. Əqdi bağlamaqdan imtina edən bu kəsin mövcud olması ilə olmaması bir bərabərdədir. İmtina etdiyini aşkara vuran kəs imtina etməkdə, bu vəzifəyə gəlməsi və tabe olunması vacib olan kəsə müvafiq olmamaqda bir üzrü yoxdursa, bunun sonu onun bu işin əhli olmaqdan çıxmasına gətirib çıxarır, çünki fisq və zülmdə davam etməkdə ilişib qalıb. Belə ki, İslamın torpaqlarını qorumaqdakı külli vəzifə ilə bağlı olanı təxirə salmağın haramlığı**

**açıq aşkardır və buna əhəmiyyət verməmək xəfif, asan deyildir. Bu, sözümüzün iki qismindən biri idi.**”

əl-Cuveyni’nin buradakı sözlərində nəzərdən yayına biləcək məqamları vurğulamaq lazımdır. Əvvəla əl-Cuveyni özü ilk cümlənin ortasına bir söz daxil edərək onun üzərinə vurğu etmişdir. O da bizim “**bu halda**” olaraq tərcümə etdiyimiz sözdür. Hansı halda? Yəni imamlığa yarayanın yeganə, tək bir fərd olması halı qəsd olunur. Həmçinin qeyd edir ki, bu halda həll və əqd əhlindən olan kəsin beyətdən imtina etməsində üzrün olmaması şərtdir, buradan anlaşılır ki, üzr varsa bu, onun ədalətinə xələl gətirməz. Daha sonra isə nə üçün həmin şəxsin beyətdən imtina etməsinin onu ədalət vəsfindən çıxarmasının, beləliklə də həll və əqd əhlindən olmaqdan çıxmasının səbəbini izah edir və qeyd edir ki, İslam ərazilərinin qorunulması kimi böyük, külli bir vəzifəni təxirə salmaq fisqdir, ağır günahdır. Beləliklə də burada nəzərdə tutulan İslam torpaqlarını kafirlərin istilasından qorumaq, onlardan azad etməkdir. Buradan anlayırıq ki, əgər xəlifə olmaq istəyən kəs özü kafirlərdən torpaqları azad etməyə çalışan müsəlman camaatlara qarşı hərb elan edirsə, onlara qarşı vuruşursa onun bu hərəkəti əl-Cuveyni’nin sözünə əsasən onu fasiqlər zümrəsinə daxil edir. Bu nöqtəni də qulağında sırğa elə!
Əlqərəz burada Bağdadi’nin camaatı üçün heç bir dəlil və ya misal yoxdur. Çünki Əbu Bəkr əl-Bağdadi bizim zamanımızda xəlifə məqamına layiq olan yeganə şəxs deyildir, ümumiyyətlə xəlifə olmaq üçün tələb olunan ictihad, rəy və tədbir, ədalət kimi şərtləri ödəmir. Həll və əqd əhlinin də ona beyət etməməsi üçün kifayət qədər şər’i və əqli üzrləri vardır, çünki onların nəzərində əl-Bağdadi bu məqama yaramır və yaramamaqdan ziyadə xilafətin məqsədlərinə tamamilə zidd addımlar atır. Bu barədə qarşıda sözümüzü genişləndirəcəyik. Hələlik əl-Cuveyni’nin zikr etdiyi ikinci hal ilə sözümüzə davam edək. Əbul-Məhasin qardaşımız həmin ikinci hissənin izahında deyir:

“**İkinci hal: Onlar xilafət vəzifəsinə seçimdən imtina etmirlər və yalnız xəlifənin şəxsiyyətinə etiraz bildirirlər. Bu halda da üstün görüşə görə onların beyətini və müvafiqliyini gözləmək gərəksizdir və həmin işə yiyələnən şəxsin xəlifəliyi bu işi sadəcə onlara ərz etməklə səhih olur. Çünki həll və əqd əhlinin baxışı yalnız xilafətə haqlı olan bir sıra şəxslər mövcud olacağı zaman məna daşıyır. Məhz bu zaman mübahisə və çəkişməni kəsmək üçün onların beyətinə və şeçiminə baxılır. Əgər imamlıq vəzifəsi boş qaldığı halda ona yiyələnən şəxs insanlar içində xilafətə ən haqlı olarsa, bu zaman onu ora təyin etmək vacibdir. Bu halda əqd əhlinin ona beyət etməsi vacib və qaçılmaz olur. Bu vacibi gecikdirməyin isə həmin vəzifəni ələ keçirənin beyətinin səhihliyində heç bir etibarı yoxdur. Onun xəlifəliyi və imamlığı onların beyəti olmasa belə səhih olur. Xəlifənin beyətini səhih etmək üçün həll və əqd əhlinin beyətini şərt qoymaq təabbüdi (yəni ibadət yönlü) iş deyil. O sadəcə əsas məqsədə aparan bir vəsilədir. Məqsəd isə ən münasib xəlifəni seçməkdir və bəlli məsələdir ki, əsasən həll və əqd əhlinin seçimindən sonra şövkət hasil olur.**”

Burada qardaşımızın öz izahında “xəlifənin şəxsiyyətinə etiraz bildirmək” mənasını haradan çıxardığını anlaya bilmədik. Əslində əl-Cuveyni sözlərində belə bir məna zikr etmir. Lakin qardaşımız Əbu Xabbəb’in bu sözlərə verdiyi şərhi olduğu kimi tərcümə etdiyi üçün onun anlayışına tabe olmuşdur, lakin həqiqət budur ki, burada əl-Cuveyni belə bir mənanı zikr etmir, heç ona işarə belə etmir. Həmçinin qardaşımız əl-Cuveyni’nin tərcih etdiyi rəyi üstün rəy kimi təqdim etmişdir, bu da yenə Əbu Xabbəb’in öz aləmində tərcih etdiyi bir şeydir, çünki əl-Cuveyni’nin özünün seçdiyi rəy heç də racih rəy olması anlamına gəlməz. Biz bu barədə alimlərin ixtilafına toxunacağıq və əksər fəqihlərimizin bu rəy ilə razılaşmadığını qeyd edəcəyik. Əslində daha əvvəl bu barədə əl-Məvardi’dən və əl-Qalqaşəndi’dən nəql zikr olundu. Lakin bir daha bu məsələyə faydalı olması üçün qayıdırıq. əl-Cuveyni’nin sözlərinə yaxından nəzər salaq. əl-Cuveyni birinci qismi zikr etdikdən sonra ikinci qismə keçir və buyurur:

“وَالثَّانِي - أَلَّا يَمْتَنِعَ مَنْ هُوَ مِنْ أَهْلِ الاخْتِيَارِ. وَلَكِنْ هَلْ يَتَوَقَّفُ ثُبُوتُ الْإِمَامَةِ - وَالْأَمْرُ مَفْرُوضٌ فِي اتِّحَادِ مَنْ يَصْلُحُ لَهَا - عَلَى الْعَقْدِ أَوْ عَلَى الْعَرْضِ عَلَى الْعَاقِدِ. هَذَا مِمَّا اخْتَلَفَ فِيهِ الْخَائِضُونَ فِي هَذَا الْفَنِّ: فَذَهَبَ ذَاهِبُونَ إِلَى أَنَّهُ لَا بُدَّ مِنَ الْعَقْدِ، فَإِنَّهُ مُمْكِنٌ، وَهُوَ السَّبَبُ فِي إِثْبَاتِ الْإِمَامَةِ. وَالْمَرْضِيُّ عِنْدِي أَنَّهُ لَا حَاجَةَ إِلَى إِنْشَاءِ عَقْدٍ، وَتَجْرِيدِ اخْتِيَارٍ وَقَصْدٍ.”

“**İkinci: seçim əhlindən olan kəsin (ona beyətdən) imtina etməməsidir. Lakin imamətin sabitliyi – və bu, imamlığa yalnız bir nəfərin yararlı olması fərz olunan hala aiddir - əqddən və ya əqdi bağlayan ərz olunmasından asılıdırmı? Bu isə bu fənlə məşğul olanların haqqında ixtilaf etdikləri məsələdir. Onların bir hissəsi əqdin olmasını vacib görürlər, çünki (əqdi bağlamaq) mümkündür və imamətin isbatının səbəbi də budur (yəni əqddir). Mənim nəzərimdə razı qalınan rəy budur ki, əqdi bağlamağa və ayrılıqda seçim və qəsdin olmasına ehtiyac yoxdur.**”

Diqqət etdiyimiz kimi əl-Cuveyni burada hansısa şəxsiyyətə etirazdan danışmır. O, burada sadəcə olaraq həll və əqd əhlinin beyət etməyə razı olduqları haldan danışır. Lakin diqqət edək ki, əl-Cuveyni hər dəfə təkrar-təkrar vurğulayır ki, burada elə bir hal, elə bir zaman fərz edilir ki, o halda və zamanda imamlıq vəzifəsinə yararlı olan tək bir nəfər vardır. Bunu unutmayaq, söhbət hələ də imamlığa yararlı olan tək bir nəfərin olmasından gedir. əl-Cuveyni də bu hal ilə bağlı iki qismi zikr edir. Birinci qisimdə həll və əqd əhli heç bir üzr olmadan ona beyət etməkdən imtina edir və bu qisimdə əl-Cuveyniyə görə həmin şəxs özü camaatı itaətə çağırmalıdır və insanlara da ona itaət etmək vacib olur. Amma ikinci qisimdə həll və əqd əhli ona beyət etməyə razıdır, heç bir etiraz yoxdur. Lakin əl-Cuveyni ümumiyyətlə belə bir sual verir: Bu halda əslən həll və əqd əhlinin beyəti şərtdirmi? Çünki onsuz da imamlığa yarayan tək bir nəfər var, ondan başqa heç kim imamlıq vəzifəsinə yaramır. Bu halda yenə də həll və əqd əhlinin beyət etməsi imamlığın səhih olması üçün şərtdirmi? əl-Cuveyni bu məsələdə alimlərin ixtilaf etdiyini zikr edir və alimlərin bir hissəsinin şərt

olduğunu deyir. Özü isə bunun şərt olmaması rəyinin qane edici olduğunu deyir və daha sonra seçdiyi bu rəyin səbəblərini belə izah edir:

“وَالسَّبَبُ فِيهِ أَنَّ الزَّمَانَ إِذَا اشْتَمَلَ عَلَى عَدَدٍ مُعَيَّنٍ مِمَّنْ يَصْلُحُ لِمَنْصِبِ الْإِمَامَةِ، فَلَا بُدَّ مِنَ اخْتِيَارٍ يُعَيِّنُ وَاحِدًا مِنْهُمْ، إِذْ لَيْسَ بَعْضُهُمْ أَوْلَى مِنْ بَعْضٍ، فَلَوْ لَمْ نُقَدِّرِ اخْتِيَارًا مَعَ وُضُوحِ وُجُوبِ اتِّخَاذِ الْإِمَامِ، لَأَفْضَى ذَلِكَ إِلَى النِّزَاعِ وَالْخِصَامِ، فَلَا أَثَرَ لِلاخْتِيَارِ وَالْعَقْدِ وَالْإِيثَارِ إِلَّا قَطْعُ الشِّجَارِ، وَإِلَّا فَلَيْسَ الاخْتِيَارُ مُفِيدًا تَمْلِيكًا، أَوْ حَاكِمًا بِأَنَّ الْعَاقِدَ فِي إِثْبَاتِ الْإِمَامَةِ يَصِيرُ شَرِيكًا. فَإِذَا اتَّحَدَ فِي الدَّهْرِ، وَتَجَرَّدَ فِي الْعَصْرِ مَنْ يَصْلُحُ لِهَذَا الشَّأْنِ، فَلَا حَاجَةَ [إِلَى] تَعْيِينٍ مِنْ عَاقِدٍ وَبَيَانٍ.
وَالَّذِي يُوَضِّحُ الْحَقَّ فِي ذَلِكَ أَنَّ الْأَمْرَ إِذَا تُصُوِّرَ كَذَلِكَ فَحَتْمٌ عَلَى مَنْ إِلَيْهِ الاخْتِيَارُ عِنْدَ مَنْ يَرَاهُ فِي هَذِهِ الصُّورَةِ أَنْ يُبَايِعَ وَيُتَابِعَ وَيَخْتَارَ وَيُشَايِعَ، وَلَوِ امْتَنَعَ، لَاسْتَمَرَّتِ الْإِمَامَةُ عَلَى الرَّغْمِ مِنْهُ فَلَا مَعْنَى لِاشْتِرَاطِ الاخْتِيَارِ، وَلَيْسَ إِلَى مَنْ يُفْرَضُ عَاقِدًا اخْتِيَارٌ. فَإِذَا تَعَيَّنَ الْمُتَّحِدُ فِي هَذَا الزَّمَانِ لِهَذَا الشَّأْنِ يُغْنِيهِ عَنْ تَعْيِينٍ وَتَنْصِيصٍ، يَصْدُرُ عَنْ إِنْسَانٍ.”

**“Bunun səbəbi budur ki, əgər bir zamanda imamlıq məqamına yararlı olan bir neçə nəfər olarsa o zaman onlardan birini müəyyən etmək üçün seçimin olması labüddür, çünki onlardan biri digərindən daha layiq deyildir. Beləliklə də imam seçməyin vacibliyi aşkar olduğu halda bir seçimin olmasını nəzərdə tutmazsaq o zaman bu, çəkişməyə və qarşıdurmaya gətirib çıxaracaq; ona görə də seçimin, əqd bağlamanın və (namizədlərdən) birinə üstünlük verməyin ixtilafı aradan qaldırmaqdan başqa bir təsiri yoxdur, əks təqdirdə seçim (bir kəsə) mülk vermə və ya hökm etmə rolunu ifadə etmir ki, əqdi bağlayan kəs imamətin isbatında şərik (seçilən kəsə) şərik olsun. Əgər bu işə yarayan kəs zamanın yeganə, əsrin yek namizədi olarsa onun müəyyənləşməsi isə əqd bayğalan tərəfindən bir təyinata və bəyana ehtiyac yoxdur.**
**Bu məsələdə haqqı izah edən budur ki, əgər hal bu cür təsəvvür olunarsa bu surətdə birini gördüyü təqdirdə (ona) beyət etməsi, tabe olması, (onu) seçməsi və (ona) dəstək verməsi seçim haqqı olan kəsə vacibdir. Əgər imtina edərsə imamlıq buna rağmən davam edəcək, o zaman seçimi şərt qoymağın mənası yoxdur və əqd bağlayan olaraq fərz olunan kəsin (həqiqətdə) bir seçimi yoxdur. Beləliklə də bu zamanda bu iş üçün (yarayan) yeganə kəsin müəyyənləşməsi bir insan tərəfindən sadir olan təyinata ehtiyac buraxmır.”**

Düşünürəm ki, əl-Cuveyni’nin öz izahı çoxumuza aydındır. O, sadəcə olaraq demək istəyir ki, əgər hansısa bir zamanda imamlıq məqamına yarayacaq yalnız tək bir nəfər varsa o zaman seçimin bir mənası qalmır. Çünki əl-Cuveyni’yə görə seçim yalnız birdən çox namizəd olduqda ortaya çıxa biləcək xüsumət və qarşıdurmanı aradan qaldırmaq üçün lazımdır, əgər yalnız bir namizəd varsa o zaman seçimə ehtiyac yoxdur.

Təkrar-təkrar özümdə düşünüb dururam ki, görəsən əl-Cuveyni'nin bu sözlərini hansı ağılla, hansı düşüncə ilə Əbu Bəkr əl-Bağdadi'nin xeyrinə istifadə etməyə çalışırlar? Görəsən həqiqətən də inanırlar ki, bu əl-Bağdadi bu zamanda bu məqama yararlı olan yeganə namizəddir?! Məncə sualın cavabı çox aşkardır və gözü kor olmuş təəssübkeş inadkardan başqa heç kim əl-Bağdadi'nin zamanımızda bu işə yarayan yeganə namizəd olduğunu iddia etməz.
Bir də gələk Əbu Xabbəb əl-İraqi'nin racih saydığı görüşə nəzər salaq və görək bu görüş həqiqətən də alimlər arasında racih olan görüşdürmü? Əbu Xabbəb və ona tabe olmuş Əbul-Məhasin qardaşımız hansı kriteriyalara əsasən əl-Cuveyni'nin görüşünü racih görüş hesab ediblər? Məgər tərcih etmək üçün əhliyyətə sahibdirlərmi? Necə olur ki, cihad sahəsində bu cür taleyüklü məsələlərdə tərcihlər etməyə əhliyyəti olan alimlərimiz var, lakin onların haqqında ümmət heç bir şey eşitməyib, adlarını yalnız internetdə yayılan məqalələrdən eşidirik?!
Əziz oxucu, bil ki, bu məsələdə əl-Cuveyni'nin qeyd etdiyi kimi ixtilaf hasil olub. Lakin bu ixtilafda əl-Cuveyni'nin seçdiyi görüş azlıqda qalmış alimlərin görüşüdür, əksəriyyət onun əksinə qərar vermişdir. Şafi'i alimlərindən Alləmə Kəmələddin Əbul-Bəqa əd-Dəmiri (vəfatı hicri 808) deyir:

"فتلخص: أن الشخص لا يصير إمامًا إلا بأحد هذه الطرق، حتى لو انفرد شخص بشروطها في وقت .. لم يصر إمامًا بمجرد ذلك كما جزم به الجمهور.وقيل: تثبت إمامته بذلك وتجب طاعته، واختاره الإمام.وحكى القمولي وجهًا: أن الإمامة تنعقد من غير عقد، قال: ومن الفقهاء من ألحق القاضي بالإمام في ذلك، قال: ومنهم من سوى بينهما في المنع، وهو أقرب من عكسه."

"**Yekun budur ki, bir şəxs bu yollardan biri olmadan imam ola bilməz, hətta bir vaxtda bir şəxsdən başqa heç kim şərtləri ödəməzsə (həmin şəxs) mücərrəd olaraq onunla imam olmur, necə əksər alimlər bu görüş üzərində qətiyyət bildiriblər. Onun imamlığının bununla sabit olduğu və ona itaət vacib olduğu da (bəziləri tərəfindən) deyilib və bu rəyi əl-İmam seçmişdir. əl-Qamuli imamətin əqd olmadan da qüvvəyə minməsinə dair bir vəch hekayət edib. Dedi: Fəqihlərdən eləsi də var ki, qazini bu baxımdan imamla eyniləşdiriblər. Dedi: Eləsi də var ki, bunun keçərli olmamasında onların ikisini də eyniləşdiriblər və bu, haqqa əksindən daha yaxındır.**"[85]

Bu sitatdan başa düşdük ki, əksər fəqihlərə görə həll və əqd əhli tərəfindən beyət və əqd olmadan hətta zamanında özündən başqa namizəd olmayan bir kəsin imamlığı səhih olmaz. Şafi'i fəqihləri "əl-İmam" dedikdə bununla İmam əl-Cuveyni'ni qəsd edirlər. Buradan anlayırıq ki, bizim qardaşımızın üstün saydığı, Əbu Xabbəb'in racih adlandırdığı rəy fəqihlərin əksəriyyətinin rəyinə müxalifdir. Daha öncə əl-Məvardi'nin bu barədə sözlərini və onun arxasında əl-

[85] "ən-Nəcmul-Vahhəc fi Şərhil-Minhəc", 9/69

Qalqaşəndi'nin sözlərini zikr etmişdik, bir daha qayıdıb əl-Məvardi'nin sözlərini oxusanız onun da əl-Cuveyni'nin zikr etdiyi məsələnin eynisi haqqında danışdığını görəcəksiz. əl-Qalqaşəndi'nin sözlərini burada fayda üçün bir daha təkrar edirik:

"وَهُوَ مَا عَلَيْهِ جُمْهُور الْفُقَهَاء وَعَلِيهِ اقْتصر الرَّافِعِيّ وَالنَّوَوِيّ والْمُعْتَمد على ترجيحهما"

"**Bu, fəqihlərin əksəriyyətinin üzərində olduğu görüşdür. ər-Rafi'i və ən-Nəvəvi yalnız bu görüşü qeyd etməklə kifayətləniblər və mötəməd rəy bu ikisinin tərcihinə əsaslanır.**"[86]

Burada artıq sözə ehtiyac qalmır. Unudulanlar xatırladılır və düşürülənlər yerinə qaytarılır. Aydın olur ki, cumhur bu halda da həll və əqd əhlinin beyət etməsini, əqdi bağlamasını şərt sayıblar və onsuz imaməti səhih görməyiblər, çünki onlar hər bir halda imamlığın bir əqd olduğunu, yəni bir kontrakt olduğunu əsas alaraq bunun bir tərəfli həyata keçməsini səhih saymayıblar və yalnız hər iki tərəfin iştirakı ilə keçərli görüblər. Düşünürük ki, məlumatları dolğun şəkildə oxucuya çatdırmaması Əbul-Məhasin qardaşımızın yazdığı məqalənin ən böyük qüsurlarındandır və belə bir məsələdə Əbu Xabbəb adlı bir məchulun yazısına etibar etməsi ciddilikdən və məsuliyyətdən uzaq bir məsləkdir. Lakin qardaşımızın məqalənin sonunda əl-Cuveyni'dən zikr etdiyi sözlərə biz də nəzər salaq. İmam deyir:

"وَتَمَامُ الْكَلَامِ فِي هَذَا الْمَرَامِ يَسْتَدْعِي ذِكْرَ أَمْرٍ: وَهُوَ أَنَّ الرَّجُلَ الْفَرْدَ وَإِنِ اسْتَغْنَى عَنِ الاخْتِيَارِ وَالْعَقْد، فَلَا بُدَّ مِنْ أَنْ يَسْتَظْهِرَ بِالْقُوَّة وَالْمنَّة، وَيَدْعُو الْجَمَاعَةَ إِلَى بَذْلِ الطَّاعَةِ فَإِنْ فَعَلَ ذَلِكَ فَهُوَ الْإِمَامُ عَلَى أَهْلِ الْوِفَاقِ وَالِاتِّبَاعِ، وَعَلَى أَهْلِ الشِّقَاقِ وَالِامْتِنَاعِ."

"**Bu məramda sözün tamamlanması bir məsələnin zikr olunmasını tələb edir: və (o məsələ) budur ki, yeganə namizəd seçimə və əqdə ehtiyac duymasa da qüvvət və güc ilə üstünlük əldə etməlidir və camaatı itaət etməyə çağırmalıdır. Əgər bunu edərsə o, həm razılaşıb tabe olanların, həm də parçalanıb imtina edənlərin üzərində imamdır.**"

Beləliklə də əl-Cuveyni zamanında imamlığa yarayan tək bir namizədin olması halında həll və əqd əhlinin seçiminin şərt olmaması görüşünü doğru saydıqdan sonra qeyd edir ki, həmin bu bir nəfər gərək hakimiyyəti ələ alacaq gücə və qüdrətə sahib olmalıdır. Əgər bunu edərsə o zaman bütün ümmətin üzərində imam olacaqdır, ona beyət edənlərin də, beyət etməyənlərin də əmiri, imamı olacaqdır.
Burada önəmli olan məqam budur ki, əl-Cuveyni burada hər bir gücü və qüvvəti etibara almır. Burada etibara alınan güc və qüvvət ümmətin hamısını və ya

[86] "Məəsirul-İnəqa fi Məalimil-Xiləfə", 1/48;

əksəriyyətinə özünə tabe etdirən bir gücdür. Yoxsa belə birisi hansısa bir şəhərdə və ya bir neçə şəhərdə hakimiyyəti ələ alarsa o, ümmətin üzərində de fakto bir xəlifə sayıla bilməz, imam ola bilməz. Çünki ümmətin üzərində ya məşruiyyət ilə, ya da güc yolu ilə imamlıq vəzifələrini yerinə yetirə bilməyən o ümmətin imamı, xəlifəsi sayıla bilməz. Buna təfsilatlı şəkildə qarşıda toxunacağıq. Lakin burada bir şeyə diqqət çəkmək lazımdır. Əbul-Məhasin qardaş əl-Cuveyni'dən gətirdiyi sözləri bura qədər gətirir və davamını qeyd etmir. Bu isə çox ehtimal ki, əsas mənbəsi sayılacaq Əbu Xabbəb'in yazısında bu miqdar ilə kifayətlənməsindən irəli gəlir. Lakin əl-Cuveyni'nin daha sonra zikr etdikləri mövzumuz üçün daha əhəmiyyətli və daha münasibdir. Ona görə də burada durmağı doğru hesab etmirik və sözlərini davam etdiririk. əl-Cuveyni – rahiməhullah – sözlərinin davamında buyurur:

"وَإِنْ لَمْ يَكُنْ مُسْتَظْهِرًا بِعُدَّةٍ وَنَجْدَةٍ، فَالْكَلَامُ فِي ذَلِكَ يَرْتَبِطُ بِفَنَّيْنِ: أَحَدُهُمَا - أَنَّهُ يَجِبُ عَلَى النَّاسِ اتِّبَاعُهُ، لِتَعَيُّنِهِ لِهَذَا الْمَنْصِبِ، وَمَسِيسِ الْحَاجَةِ إِلَى [وَزَرٍ] يَرْمُقُ فِي أَمْرِ الدِّينِ وَالدُّنْيَا، فَإِنْ كَاعُوا، وَمَا أَطَاعُوا - عَصَوا.
وَلْنَفْرِضْ هَذَا فِيهِ إِذَا عَدِمْنَا مَنْ نَرَاهُ أَهْلًا لِلْعَقْدِ وَالاخْتِيَارِ، فَلَيْسَ فِي النَّاسِ مَنْ يَتَصَدَّى لِهَذَا الشَّأْنِ، حَتَّى يُقَالَ: يَتَوَقَّفُ انْعِقَادُ الْإِمَامَةِ عَلَى صُدُورِ الاخْتِيَارِ مِنْهُ، فَعَلَى النَّاسِ كَافَّةً أَنْ يُطِيعُوهُ إِذَا كَانَ فَرِيدَ دَهْرِهِ، وَوَحِيدَ عَصْرِهِ فِي التَّصَدِّي لِلْإِمَامَةِ."

"**Əgər hazırlıq və dəstək ilə üstünlük əldə etməzsə bu barədəki müzakirə iki məqamla bağlıdır: Onlardan biri budur ki, insanlara ona itaət etmək vacibdir, çünki bu vəzifənin ona aid olması vacibləşib və dini və dünyəvi işlərə nəzarət edəcək bir rəhbərə güclü ehtiyac vardır. Beləliklə də əgər çəkinərlərsə, itaət etməzlərsə asi olarlar.**
**Biz bunu əqd və seçim əhli ola biləcək bir kəsin olmadığı halda onun üçün fərz edirik; insanlar arasında da bu işə girişəcək biri yoxdur ki, imamətin qüvvəyə minməsinin həmin kəsdən sadir olacaq seçimdən asılı olduğunu deyək. Beləliklə də əgər imamlıq vəzifəsini götürməyə öz zamanının yeganə namizədidirsə, əsrinin yek adamıdırsa o zaman insanların hamısına ona itaət etmək vacib olur.**"

Bir daha şahidi oluruq ki, əl-Cuveyni'nin bu sözləri imamlığa yarayan yalnız bir nəfərin olması halına aid edir. Daha əvvəl də təqdim edilən rəyə əsasən əl-Cuveyni'yə görə məhz bu halda həll və əqd əhlinin seçimi şərt deyildir və bəyan etdik ki, bu, cumhurun görüşünə müxalifdir. Lakin burada daha bir fərziyyə edir və deyir ki, əgər həmin dövrdə heç bir həll və əqd əhli olmazsa o zaman təbii ki, yenə də imam vəzifəsi ona aiddir. Bunun üçün üç hal zikr edəcək. əl-Cuveyni deyir:

"فَإِذَا دَعَا النَّاسَ إِلَى الْإِذْعَانِ لَهُ وَالْإِقْرَانِ، فَاسْتَجَابُوا لَهُ طَائِعِينَ، فَقَدِ اتَّسَقَتِ الْإِمَامَةُ، وَاطَّرَدَتِ الرِّيَاسَةُ الْعَامَّةُ.

وَإِنْ أَطَاعَهُ قَوْمٌ يَصِيرُ مُسْتَظْهِراً بِهِمْ عَلَى الْمُنَافِقِينَ عَلَيْهِ وَالْمَارِقِينَ مِنْ طَاعَتِهِ - تَثْبُتُ إِمَامَتُهُ أَيْضًا."

**"Əgər insanları boyun əyməyə, tabe olmağa çağırarsa və onlar itaət edərək (çağırışına) cavab verərlərsə imamlıq düzələr və ümumi riyasət hasil olar.**
**Əgər bir qövm ona itaət edərsə ki, onlar(ın dəstəyi) ilə ona qarşı gələn münafiqlər və itaətindən çıxanların üzərində güc/üstünlük əldə edərsə imamlığı bu halda da sabit olar."**

Bu iki halda imamətinin sabit olduğunu dedikdən sonra üçüncü halı zikr edir və deyir:

"وَإِنْ لَمْ يُطِعْهُ أَحَدٌ أَوِ اتَّبَعَهُ ضُعَفَاءُ لَا تَقُومُ بِهِمْ شَوْكَةٌ، [فَهَذِهِ] الصُّورَةُ تَضْطَرِبُ فِيهَا مَسَالِكُ الظُّنُونِ، وَتَقَعُ مِنَ الاحْتِمَالَاتِ عَلَى فُنُونٍ."

**"Əgər heç kim itaət etməzsə və ya zəiflər ona tabe olarlarsa, onlar(ın itaəti) ilə şövkət/qüdrət hasil olmazsa, bu surətdə gümanların izlədiyi yollar ziddiyyətdədir və ehtimallar birdən çox məqam üzərinə düşür."**

Daha əvvəlki hallarda imamətin sahit olduğunu dediyi kimi bu hal üçün belə bir qərar vermir. Lakin burada insanların nəzərinin fərqləndiyini söyləyir və məsələnin mülahizələrə açıq olduğunu deyir. Belə buyurur:

"فَيَجُوزُ أَنْ يَظُنَّ ظَانٌّ أَنَّ الْإِمَامَةَ لَا تَثْبُتُ إِذْ لَمْ يَجْرِ عَقْدٌ مِنْ مُخْتَارٍ، وَلَا طَاعَةٌ تُفِيدُ عُدَّةً، وَمُنَّةٌ تَنْزِلُ مَنْزِلَةَ الاخْتِيَارِ. وَقَدْ قَدَّمْنَا فِي أَحْكَامِ الْأَئِمَّةِ أَنَّ الْإِمَامَ إِذَا انْصَرَفَ الْخَلْقُ عَنْ مُتَابَعَتِهِ وَمُشَايَعَتِهِ، كَانَ ذَلِكَ كَوُقُوعِهِ فِي أَسْرٍ يَبْعُدُ تَوَقُّعُ انْفِكَاكِهِ عَنْهُ. نَعَمْ، تَعْصِي الْخَلَائِقُ فِي الصُّورَةِ الَّتِي نَحْنُ فِيهَا لِمُخَالَفَةِ مَنْ [تَوَحَّدَ] لِاسْتِحْقَاقِ التَّقَدُّمِ. وَسَبَبُ تَعْصِيَتِهِمْ تَقَاعُدُهُمْ عَنْ نَصْبِ إِمَامٍ يَنْدَفِعُ بِهِ النِّزَاعُ وَالدِّفَاعُ، وَالْخُصُومَاتُ الشَّاجِرَةُ وَالْفِتَنُ الثَّائِرَةُ، وَتَتَّسِقُ بِهِ الْأُمُورُ، وَتَنْتَظِمُ بِهِ الْمُهِمَّاتُ وَالْغَزَوَاتُ وَالثُّغُورُ."

**"Güman edən belə güman etməsi caizdir ki, seçici biri tərəfindən əqd olmadığı üçün, seçimin yerinə keçə biləcək hazırlıq və güc ifadə edən bir itaət olmadığı üçün imamət sabit olmur. İmamlar haqqındakı hökmlərdə daha əvvəl zikr etmişdik ki, insanlar İmama tabe olmazlarsa, ona dəstək verməzlərsə onun bu halı qurtulma gözləntisi uzaq olan əsirliyə düşməsi kimidir. Bəli, bizim sözünü etdiyimiz bu surətdə insan kütlələri asi olurlar, çünki öndər olmağa tək namizəd olaraq layiq olan kəsə müxalif olublar. Onları asi saymağın səbəbi isə çəkişmələri, münaqişələri, aralarında çıxan xüsumətləri və qopan fitnələri aradan qaldıran, işləri sahmana salan, vəzifələri, müharibələri və sərhəd bölgələrini qaydaya salan bir imamı təyin etməkdən geri düşməkləridir."**

Bir sözlə belə birinə itaət göstərməmək asilikdir, çünki zamanının imamlıq məqamına layiq olan yeganə müsəlmanıdır və həll və əqd əhli yoxdur ki, onu bu məqama seçsin, o zaman siravi müsəlmanlara itaət etmək düşür, əgər etməzlərsə asi olurlar. əl-Cuveyni'nin sözlərinin məğzi budur. Lakin burada bizim üçün maraqlı olan bir ifadə keçir: "...**insanlar İmama tabe olmazlarsa, ona dəstək verməzlərsə onun bu halı qurtulma gözləntisi uzaq olan əsirliyə düşməsi kimidir**". əl-Cuveyni qeyd edir ki, insanlar tərəfindən itaət olunmayan bir xəlifə, düşmənə əsir düşmüş və azad edilməsi gözlənilməyən bir xəlifə kimidir. Məlumdur ki, bu halda imamın imamlığı qüvvədən düşür. əl-Cuveyni burada bu hal haqqında deyilə biləcək ilk rəyi zikr etdi və daha sonra ikinci rəyə keçərək deyir:

"وَيَجُوزُ أَنْ يَصِيرَ صَائِرٌ إِلَى أَنَّهُ إِمَامٌ وَإِنْ لَمْ يُطَعْ، وَيَنْفُذُ مَا يُمْضِيهِ مِنْ أَحْكَامِه عَلَى مُوافَقَةِ وَضْعِ الشَّرْعِ، وَلَيس إِضْرابُ الْخَلْقِ [عَنْ] طَاعَته فِي هَذِهِ الصَّورَة، كَمَا سَبَقَ تَصْوِيرُهُ وَتَقْرِيرُهُ فِيمَا تَقَدَّمَ مِنْ أَبْوَابِ الْكِتَابِ، فَإِنَّ ذَاكَ مَفْرُوضٌ فِيهِ إِذَا سَقَطَتْ طَاعَةُ الْإِمَامِ، وَوَجَدْنَا غَيْرَهُ، وَصَغْوُ النَّاسِ وَمَيْلُهُمْ إِلَى غَيْرِهِ.فَالَّذِي يَلِيقُ بِاسْتِصْلَاحِ الرَّاعِي وَالرَّعِيَّةِ نَصْبُ مَنْ هُوَ شَوْفُ النُّفُوسِ.
وَالَّذِي نَحْنُ فِيهِ مُصَوَّرٌ فِيه إِذَا تَفَرَّدَ فِي الزَّمَانِ مَنْ يَصْلُحُ لِلْإِمَامَة، فَإِذَا كَانَ كَذَلِكَ تَعَيَّنَتْ طَاعَةُ مِثْلِ هَذَا عَلَى النَّاسِ كَافَّةً، وَلَا مَعْنَى لِكَوْنِ الْإِمَامِ إِمَامًا إِلَّا أَنَّ طَاعَتَهُ وَاجِبَةٌ. وَهَذَا الَّذِي فِيهِ الْكَلَامُ بِهَذِهِ الصِّفَةِ، فَهُوَ إِمَامٌ يَجِبُ اتِّبَاعُهُ فَتَنْفُذُ إِذًا أَحْكَامُهُ.
وَهَذَا مُتَّجِهٌ عِنْدِي وَاضِحٌ. وَالْأَوَّلُ لَيْسَ بَعِيدًا أَيْضًا، فَإِنَّ قَاعِدَةَ الْإِمَامَةِ الِاسْتِظْهَارُ بِالْمُنَّةِ، وَالِاسْتِكْثَارُ بِالْعُدَّةِ وَالْقُوَّةِ، وَهَذَا مَفْقُودٌ فِي الَّذِي لَمْ يُطَعْ."

**"Bir başqası belə bir rəy bildirə bilər ki, o itaət olunmasa belə hələ də imamdır və verdiyi hökmlər şəriətin qanununa əsasən keçərlidir. İnsanların bu surətdə onun itaətindən üz döndərməkləri kitabın əvvəlki bablarında təsvir olunmuş, təqrir olunmuş hal kimi deyildir, çünki orada imamın itaətinin qüvvədən düşməsi, yerinə başqasının tapılması, insanların başqasına meyl etməsi halı fərz olunurdu. İdarəçinin və rəiyyənin islahı üçün ən münasib olan nəfslərin bəzəyi olacaq birini təyin etməkdir. Bizim sözünü etdiyimiz hal zamanın imamlığa yararlı olan tək bir nəfəri tanıması halıdır. Əgər hal bu cürdürsə belə birinə itaət etmək bütün insanlara vacibdir. İmama yalnız ona görə imam deyirlər ki, çünki itaət olunması vacibdir. Haqqında bu vəsflərlə sözünü etdiyimiz bu kəs tabe olunması vacib olan bir imamdır və hökmləri də keçərlidir.**
**Bu rəy mənim nəzərimdə əsası olan rəydir, aydındır, birinci rəy də həmçinin uzaq deyildir, çünki imamətin əsasını güc ilə üstünlük əldə etmək və hazırlıqların, qüvvətlərin çoxluğu təşkil edir; bu isə itaət olunmayan birində yoxdur."**

Beləliklə də əl-Cuveyni burada ikinci ehtimalı da zikr etmiş oldu. Sözünün əvvəlində vurğulayır ki, bu möhtəməl rəylərin hamısı zənn ilə idrak olunan nəticələrdir, yoxsa güclü dəlillərə əsaslanmır. Hasil budur ki, insanların itaət etməməsi halında ya imamlığa yararlı olan yeganə namizə imam sayılmır, çünki insanlar ona itaət etmirlər, ya da itaət etməsələr də imam sayılır və verdiyi hökmlər keçərlidir. Hasil olan bu iki rəydir. əl-Cuveyni hər iki rəyin əsasının olduğunu izah edir və onlardan heç birini tərcih etmir.
Lakin bura qədər deyilənlərin hamısı yalnız bir halla xüsusiləşdirilmiş haldır və onun üzərinə biz təkrar-təkrar vurğu etdik və o, zamanda imamlıq məqamına yarayan yalnız bir nəfərin olması halıdır. Bu, o qədər önəmli məqamdır ki, bundan sonra əl-Cuveyni'dən zikr edəcəyimiz sözlərdən anlaşılacaq ki, nə üçün əl-Cuveyni bu halda beyəti etibarsız saymışdır. Çünki bundan sonrakı hissədə əl-Cuveyni imamlığa yarayan bir yox, birdən çox kəsin olduğu haldan danışır və gəlin görək nə deyir:

"فَلَوِ اشْتَمَلَ الزَّمَانُ عَلَى طَائِفَةٍ صَالِحِينَ لِلْإِمَامَةِ فَاسْتَوْلَى وَاحِدٌ مِنْهُمْ عَلَى الْبِلَادِ وَالْعِبَادِ، عَلَى قَضِيَّةِ الاسْتِبْدَادِ، مِنْ غَيْرِ اخْتِيَارٍ وَعَقْدٍ، وَكَانَ الْمُسْتَظْهِرُ بِحَيْثُ لَوْ صَادَفَهُ عَقْدُ مُخْتَارٍ، لَانْعَقَدَتْ لَهُ الْإِمَامَةُ. فَهَذَا الْقِسْمُ قَدْ يَعْسُرُ تَصَوُّرُهُ."

**"Əgər zamanda imamlığa yarayan bir qrup adam varsa və onlardan biri şəhərləri, insanları istibdad şəkli ilə, heç bir seçim və əqd olmadan istila edərsə və (güc ilə) üstünlük edən kəs elə biridir ki, əgər seçici əqdi onun üçün bağlasaydı imamlıq onun haqqında qüvvəyə minərdi. Bu qismi təsəvvür etmək çətin ola bilər."**

Gördüyünüz kimi bu hal Əbu Bəkr əl-Bağdadi üçün daha abırlı bir misaldır. Çünki ağıl sahibi insanlar başa düşürlər ki, əl-Bağdadi bizim bu dəhrin, bu zamanın yeganə namizədi deyildir, kim bunun əksini iddia edirsə onun on ikinci imama inanan rafizidən fərqi yoxdur. Lakin bir kimsə əl-Bağdadi'nin çox sayda digər insanlar kimi imamlığa yarayanlardan biri olduğunu deyərsə arqument xatirinə onun dediyini qəbul etmək olar. Ona görə də Əbu Xabbəb əl-İraqi və onun bulağından su içən Əbul-Məhasin qardaşımız əl-Cuveyni'nin bu hal haqqında dediyi sözləri zikr etsəydilər daha münasib olardı, lakin çox təəssüf ki, əl-Cuveyni'nin tamamilə xüsusi bir hal üçün qeyd etdiyi sözlərini zikr ediblər və oxucularını bu sözlərin əl-Bağdadi'nin halı ilə eyni olduğunu inandırmağa çalışıblar.
əl-Cuveyni bu hala giriş etdikdə və bu halı vəsf etdikdə qeyd edir ki, ola bilər ki, bu halı təsəvvür etmək çətin olsun. Bu çətinliyin səbəbini müzakirəsinin axırlarında qeyd edəcək. Lakin ilk öncə onun bu hal haqqında zikr etdiklərinə nəzər salaq. O, sözünə davam edərək deyir:

"وَنَحْنُ نَقُولُ فِيهِ: إِنْ قَصَّرَ الْعَاقِدُونَ فِيهِ وَأَخَّرُوا تَقْدِيمَ إِمَامٍ، فَطَالَتِ الْفَتْرَةُ، وَتَمَادَتِ الْعُسْرَةُ، وَانْتَشَرَتْ أَطْرَافُ الْمَمْلَكَةِ، وَظَهَرَتْ دَوَاعِي الْخَلَلِ، فَتَقَدَّمَ صَالِحٌ لِلْإِمَامَةِ دَاعِيًا إِلَى نَفْسِهِ، مُحَاوِلًا ضَمَّ النَّشْرِ، وَرَدَّ مَا ظَهَرَ مِنْ دَوَاعِي الْغَرَرِ، فَإِذَا اسْتَظْهَرَ بِالْعُدَّةِ التَّامَّةِ مَنْ وَصَفْنَاهُ، فَظُهُورُ هَذَا لَا يُحْمَلُ عَلَى الْفُسُوقِ وَالْعِصْيَانِ

وَالْمُرُوق، فَإِذَا جَرَى ذَلِكَ، وَكَانَ يَجُرُّ صَرْفُهُ وَنَصْبُ غَيْرِهِ فِتَنًا، وَأُمُورًا مَحْذُورَةً،
فَالْوَجْهُ أَنْ يُوَافَقَ، وَيُلْقَى إِلَيْهِ السَّلَمُ، وَتُصَفِّقَ لَهُ أَيْدِي الْعَاقِدِينَ."

"**Biz bu hal haqqında deyirik: əqdi bağlayanlar burada qüsurlu davranarlarsa, bir imamı (ümmət üçün) seçməyi gecikdirərlərsə, müddət uzanarsa, çətinlik davam edərsə və məmləkətin sərhədləri genişlənərsə, fəsada çağıran səbəblər aşkarlanarsa, bundan sonra imamlığa yarayan biri insanları özünə çağıraraq, parçalanmış sıraları birləşdirməyə çalışaraq irəli çıxarsa, təhlükəyə aparan aşkar səbəbləri rədd edərsə, beləliklə də bizim vəsf etdiyimiz kəs tam güc/hazırlıq ilə üstünlüyü əldə edərsə, bunun zühuru fasiqlik, üsyan olaraq qəbul edilməməlidir. Əgər bu baş verərsə, onu hakimiyyətdə düşürmək və yerinə başqasını təyin etmək fitnəyə, qadağan olunmuş işlərə götürürsə, doğru olan ona müvafiq olmaq, ona təslim olmaq və əqdi bağlayanların onu alqışlamasıdır.**"

əl-Cuveyni'nin sözlərini bir qədər izah etməyə ehtiyac vardır. Burada əl-Cuveyni imamlığa yarayan birdən çox kəsin olduğu haldan danışır. Lakin qeyd edir ki, zaman elə bir zamandır ki, həll və əqd əhli uzun müddətdir ki, ümmət üçün bir imam seçməyiblər, qüsurlu davranıblar, ərazilər də çox genişlənib və fəsadın səbəbləri çoxalıb, aşkara çıxıb. Belə halda imamlığa yarayan biri sahib olduğu güc, qüdrət və dəstək ilə hakimiyyətə gələrsə, onu hakimiyyətdən düşürüb yerinə başqasını gətirmək fitnələrə, qanların axmasına səbəb olarsa o zaman həll və əqd əhlinin ona beyət etməsi doğru olandır. Lakin əl-Cuveyni burada önəmli bir sual verir:

"وَهَلْ تَثْبُتُ لَهُ الْإِمَامَةُ بِنَفْسِ الِاسْتِظْهَارِ وَالِانْتِدَابِ لِلْأَمْرِ؟"

"**(Güc, qüvvə ilə) üstünlüyü ələ keçirməyin və bu vəzifəyə cavab verməsinin özü ilə imamlıq onun üçün sabit olurmu?**"

Əziz oxucu! Gördüyün kimi Əbul-Məhasin qardaşımızın yazdığı məqalə ilə isbat etmək istədiyi məhz bu sualın cavabıdır. əl-Cuveyni bizim qarşımızda belə bir halı təsvir etdi və siz də bu halı təsvir edin. Ümmət uzun zamandır ki, xəlifəsiz, imamsız yaşayır, əraziləri genişdir, fəsad artıq və yayılıb və həll və əqd əhli sayılan insanlar ümmət üçün bir imam təyin etməkdə qüsurlu davranırlar. İmamqlıq məqamına yarayan çox sayda adamın içindən bir nəfər topladığı güc və hazırlıq ilə hakimiyyəti ələ alır, yəni bütün ümməti və ya əksəriyyətini özünə tabe elətdirir. Lakin həll və əqd əhli hələ ona beyət etməyib. Bu yerdə əl-Cuveyni sual verir ki, belə birinin güc və qüvvət ilə hakimiyyəti ələ keçirməsi və imamlıq vəzifəsinə cavab verməsi, yəni bu vakansiyaya özünün keçməsi özlüyündə imamlığın sabit olması üçün kifayət edirmi? Yoxsa səhih olması üçün başqa bir şey şərtdirmi, vacibdirmi? Əbul-Məhasin qardaş yazdığı uzun məqalə boyunca sübut etməyə çalışır ki, burada başqa bir şey şərt deyildir, əgər güc və qüvvət hasil olubsa və bu güc, qüdrət və qüvvət ilə hakimiyyətə keçibsə, imamlığa yararlı biridirsə artıq bu, onun imamlığının səhih olması üçün, sabit olması üçün yetərlidir, həll və əqd əhlinin beyət etməsi şərt deyildir. Hətta bunda icma

olduğunu da iddia etmişdir. Lakin gəlin görək əl-Cuveyni özü bu suala nə cavab verir. O, deyir:

“مَا أَرَاهُ أَنَّهُ لَا بُدَّ مِنِ اخْتِيَارٍ وَعَقْدٍ، فَإِنَّهُ لَيْسَ مُتَوَحِّدًا فَنَقْضِي بِتَعَيُّنِ الْإِمَامَةِ لَهُ. وَثُبُوتُ الْإِمَامَةِ مِنْ غَيْرِ تَوْلِيَةِ عَهْدٍ مِنْ إِمَامٍ أَوْ صُدُورِ بَيْعَةٍ مِمَّنْ هُوَ مِنْ أَهْلِ الْعَقْدِ أَوِ اسْتِحْقَاقٍ بِحُكْمِ التَّفَرُّدِ وَالتَّوَحُّدِ كَمَا سَبَقَ - بَعِيدٌ.”

**“Mənim rəyim budur ki, seçim və əqdin olması labüddür, çünki o, (zamanında imamlığa yarayan) yeganə namizəd deyildir ki, imamlığın məhz ona verilməsinin vacib olduğuna hökm verək. Daha öncəki imam tərəfindən vəliəhd olaraq təyin edilmə olmadan və ya əqd əhlindən birinin beyəti olmadan və daha öncə keçdiyi kimi ya tək və bir namizəd olmaqla bu məqama layiqlik olmadan imamlığın sabit olması uzaq bir ehtimaldır.”**

Əbul-Məhasin qardaşımızı üzmək istəməzdim, amma əl-Cuveyni onunla razılaşmır və Əbu Xabbəb əl-İraqi’yə də xəbər çatdırmaq lazımdır ki, əl-Cuveyni onun xəlifəsinə beyət etmir. əl-Cuveyni burada qeyd edir ki, üç hal olmadan imamlığın sabit olması uzaqdır. Dediyi iki haldan ikincisi üzərində ittifaq vardır ki, imamlıq həll və əqd əhlinin seçimi ilə sabit olur. Həll və əqd əhlinin seçimi olmadan vəliəhd olaraq təyin etmə ilə imamlığın sabit olmasında ixtilaf vardır. Sonuncuna gəldikdə isə əksər alimlərə görə imamlıq vəzifəsinə yeganə namizəd olmaq imamlığın sabit olması üçün kifayət etmir, əl-Cuveyni isə fərqli düşünür. Lakin əl-Cuveyni’yə görə əgər birdən çox namizəd varsa, o namizədlərdən birinin güc, qüvvə yolu ilə hakimiyyəti ələ alması onun imamlığının sabit olması üçün kifayət etmir. Daha sonra isə deyir:

“[وَقَدْ] قَالَ بَعْضُ أَئِمَّتِنَا إِذَا عَسُرَتْ مُدَافَعَتُهُ، وَفِي اسْتِمْرَارِهِ عَلَى مَا تَصَدَّى لَهُ تَوْفِيَةٌ لِحُقُوقِ الْإِمَامَةِ، فَيَتَعَيَّنُ تَقْرِيرُهُ، وَإِذَا تَعَيَّنَ الْأَمْرُ لَمْ يَبْقَ لِلِاخْتِيَارِ اعْتِبَارٌ، فَإِنَّ الِاخْتِيَارَ إِنَّمَا يُفْرَضُ لَهُ أَثَرٌ إِذَا تَقَابَلَ مُمْكِنَانِ، وَلَمْ يَكُنْ أَحَدُهُمَا أَوْلَى مِنَ الثَّانِي، وَلَمْ يَتَأَتَّ الْجَمْعُ بَيْنَهُمَا، فَيُعَيِّنُ الِاخْتِيَارُ أَحَدَ الْجَائِزَيْنِ. فَالِاسْتِظْهَارُ مَعَ تَعَذُّرِ الْمُعَارَضَةِ وَالْمُنَاقَضَةِ يَتَضَمَّنُ ثُبُوتَ الْإِمَامَةِ.”

**“İmamlarımızdan bəzisi deyib ki, əgər onu dəf etmək çətinləşərsə, üstləndiyi işdə davam etməklə imamətin haqlarını tam şəkildə ödəyərsə o zaman onu (o məqamında) təsdiqləmək vacib olur və əgər bunu etmək vacibləşərsə o zaman seçimin bir etibarı qalmır. Belə ki, yalnız iki mümkün hal bir-birinə qarşı gəldikdə və onlardan biri digərindən üstün olmadıqda, ikisini bir araya gətirmək üçün asan yol olmazsa, o zaman seçim üçün bir təsir nəzərdə tutula bilər; bu halda seçim iki mümkün haldan birini müəyyənləşdirir. Beləliklə də müqavimət və müxalifət göstərməyin çətin olması ilə izlənilən üstünlük özü ilə birlikdə imamlığın sübut olmasını da gətirir.”**

Burada gördüyümüz kimi əl-Cuveyni imamlardan birinin bu barədəki rəyini zikr edir. Lakin diqqət edək ki, burada nəzərdə tutulan elə bir üstünlükdür ki, ümmətdə ona qarşı duracaq bir başqa güc və müqavimət yoxdur. Bu hal elə bir imamı təqdir edir ki, o imam tam bir güclə ümməti özünə tabe etdirib, lakin bununla belə imamlığın haqlarını da tam ödəyir və ona qarşı duracaq, ona müqavimət göstərəcək bir başqa güc yoxdur. İmamlığın haqlarını tam ödəmək isə təbii ki, İslam torpaqlarını düşməndən qorumaq, zalımlara qarşı məzlumları qorumaq, rəiyyətin arasında ədalətlə hökm etmək və digər haqların yerinə yetirilməsini nəzərdə tutur. Bu halda reallıqla barışmaq vacibdir, yəni başqa bir variant olmadığı üçün bunu qəbul etmək lazımdır və ona görə də əl-Cuveyni'nin qeyd etdiyi kimi bəzi alimlər bu halda imamlığının sabit olduğunu deyiblər. əl-Bağdadi'nin bu halda olmadığı çox aydın bir məsələdir. Lakin istənilən halda gəlin görək əl-Cuveyni bu rəydə olan alimlərlə razılaşırmı. əl-Cuveyni bundan sonra deyir:

"وَالْمَرَضِيّ عِنْدَنَا الْمَسْلَكُ الْأَوَّلُ فَيَجِبُ الْعَقْدُ لَهُ، لِمَا فِيهِ مِنْ تَقْرِيرِ غَرَضِ الْإِمَامَةِ، وَإِقَامَةِ حُقُوقِهَا، وَتَسْكِينِ الْفِتْنَةِ الثَّائِرَةِ وَتَطْفِيَةِ النَّائِرَةِ"

**"Bizim nəzərdə qane edici rəy birinci məsləkdir, beləliklə də onun üçün əqdin olması vacibdir, çünki bununla imamətin məqsədi təsdiqlənir və haqları iqamə olunur, fitnə sakitləşdirilir, ədavəti söndürür..."**

Beləliklə də bununla sənə bəlli olur ki, əl-Cuveyni razılaşmır, seçimin və əqdin olmasını vacib görür. Biz əl-Bağdadi'nin halının heç də yuxarıda zikr edildiyi kimi olmadığını bilsək də yenə arqument xatirinə qəbul etsək ki, əl-Bağdadi ümmətin üzərində fərz olan imamlıq vəzifəsini topladığı güc və hazırlıq ilə ələ keçirib, imamlıq vəzifələrini tam şəkildə yerinə yetirir və ona qarşı dura biləcək bir müqavimət, bir müxalifət yoxdur, hətta bu halda belə əl-Cuveyni'yə görə ona beyətin edilməsi şərtdir. Daha sonra çox önəmli bir nöqtəyə toxunur və deyir:

"وَغَائِلَةُ هَذَا الْفَصْلِ فِي تَصْوِيرِهِ، فَإِنَّ الَّذِي يَنْتَهِضُ لِهَذَا الشَّأْنِ لَوْ بَادَرَهُ مِنْ غَيْرِ بَيْعَةٍ وَحَاجَةٍ حَافِزَةٍ، وَضَرُورَةٍ مُسْتَفِزَّةٍ، أَشْعَرَ ذَلِكَ بِاجْتِرَائِهِ، وَغُلُوِّهِ فِي اسْتِيلَائِهِ، وَتَشَوُّفِهِ إِلَى اسْتِعْلَائِهِ، وَذَلِكَ يَسِمُهُ بِابْتِغَاءِ الْعُلُوِّ فِي الْأَرْضِ بِالْفَسَادِ."

**"Bu fəslin müsibəti onun təsvirindədir. Belə ki, bu işə girişən kəs beyət almadan, acil ehtiyac və qorxuducu zərurət olmadan bunu etməkdə tələsik davranıbsa bu, onun cürətini, istilada aşırılığını və kibrlənməyə həvəsli olduğunu göstərir. Bu isə onu Yer üzündə ucalmaq/böyüklənmə istəyi və fəsad ilə (digərləri arasında) seçkin edir."**

əl-Cuveyni burada çox incə bir nöqtəyə toxunur. Hətta imamlıq məqamına layiq olan, yarayan biri olsa da digər namizədlər olduğu halda güc və qüvvətdən istifadə edərək hakimiyyətə gələn kəs bunu həll və əqd əhlinin beyəti olmadan, məşvərətsiz tələsərək edərsə bu onun həddini aşdığını, özünü daha üstün sayaraq daha da böyüklənmək, daha yüksəklərə qalxmaq arzusunun olduğunu

göstərir. Bu isə öz növbəsində onu fəsad çıxarmaqla səciyyələndirir. Bunu izah etdikdən sonra belə biri üçün hökmü verir və deyir:

> “وَلَا يَجُوزُ عَقْدُ الْإِمَامَةِ لِفَاسِقٍ، وَإِنْ كَانَتْ ثَوْرَتُهُ لِحَاجَةٍ ثُمَّ زَالَتْ وَحَالَتْ، فَاسْتَمْسَكَ بِعُدَّتِهِ مُحَاوِلًا حَمْلَ أَهْلِ الْحَلِّ وَالْعَقْدِ عَلَى بَيْعَتِهِ، فَهَذَا أَيْضًا مِنَ الْمُطَاوَلَةِ وَالْمُصَاوَلَةِ، وَحَمْلُ أَهْلِ الِاخْتِيَارِ عَلَى الْعَقْدِ لَهُ بِحُكْمِ الِاضْطِرَارِ، وَهَذَا ظُلْمٌ وَغَشْمٌ يَقْتَضِي التَّفْسِيقَ.
> فَإِذَا تُصُوِّرَتِ الْحَالَةُ بِهَذِهِ الصُّورَةِ، لَمْ يَجُزْ أَنْ يُبَايَعَ، وَإِنَّمَا التَّصْوِيرُ فِيهِ إِذَا ثَارَ لِحَاجَةٍ، ثُمَّ تَأَلَّبَتْ عَلَيْهِ جُمُوعٌ لَوْ أَرَادَ أَنْ يَتَحَوَّلَ عَنْهُمْ لَمْ يَسْتَطِعْ، وَكَانَ يَجُرُّ مُحَاوَلَةُ ذَلِكَ عَلَيْهِ وَعَلَى النَّاسِ فِتَنًا لَا تُطَاقُ، وَمِحَنًا يَضِيقُ عَنِ احْتِمَالِهَا النِّطَاقُ، وَفِي اسْتِقْرَارِهِ الِاتِّسَاقُ وَالِانْتِظَامُ، وَرَفَاهِيَةُ أَهْلِ الْإِسْلَامِ، فَيَجِبُ تَقْرِيرُهُ كَمَا تَقَدَّمَ.
> وَالْمُخْتَارُ أَنَّهُ وَإِنْ وَجَبَ تَقْرِيرُهُ، فَلَا يَكُونُ إِمَامًا، مَا لَمْ تَجْرِ الْبَيْعَةُ، وَالْمَسْأَلَةُ فِي هَذَا الَّذِي ذَكَرْنَاهُ مَظْنُونَةٌ، وَالْمَقْطُوعُ بِهِ وُجُوبُ تَقْرِيرِهِ.”

> **“Bir fasiqə isə imamət əqdini bağlamaq icazəli deyildir və əgər hakimiyyəti ələ keçirməsi bir ehtiyaca görə edilmişdisə, sonra ehtiyac aradan qalxarsa, vəziyyət dəyişərsə, o isə gücünə dayanaraq həll və əqd əhlini özünə beyət etdirməyə çalışarsa, bu da həmçinin böyüklənmək və üstün gəlməyə çalışmaqdır və seçim əhlini məcburiyyət hökmü ilə əqd bağlamağa məcbur etməkdir, bu isə fasiq sayılmağı tələb edən bir zülmdür, şiddətli haqsızlıqdır.**
> **Əgər hal bu surətdə təsəvvür edilərsə beyət etmək caiz deyildir. Bu halda təsvir yalnız belə ola bilər ki, ehtiyac üçün hakimiyyəti ələ keçirir, sonra insan kütlələri onun ətrafında elə birləşirlər, onlardan ayrılmaq istəsə də bunu bacarmır və bunu etməyə çalışmaq həm onun özünün üzərinə, həm də insanların üzərinə dözülməz fitnələr, daşınılmaz sınaqlar çəkib gətirir və belə birinin hakimiyyətdə qalması nizam-intizamın qorunulması, müsəlmanların rifahla həyat yaşaması deməkdir. Bax bu zaman daha əvvəl deyildi kimi onun (hakimiyyətinin) təsdiq edilməsi vacibdir.**
> **Üstün olan görüş budur ki, hətta onun (hakimiyyətdə) təsdiq edilməsi vacib olsa da beyət prosesi baş vermədiyi müddətdə imam sayılmır. Bizim zikr etdiyimiz bu məsələ zənnidir, burada qəti bilinən isə onun (hakimiyyətinin) təsdiq edilməsinin vacib olmasıdır.**”

Allah əl-Cuveyni’yə rəhmət etsin! Öz zamanında “əl-Ğiyasi” kimi dəyərli bir kitab yazaraq baş verə biləcək müxtəlif surətlərə toxunub və biz bu gün bu kişinin buraxdığı mirasa çox ehtiyac duyuruq. Gördüyümüz kimi əl-Cuveyni heç bir şeyi tərk etməyib və hamısını təfsilatı ilə qeyd edib. Maraqlıdır ki, nə Əbu Xabbəb əl-İraqi, nə də bizim Əbul-Məhasin qardaşımız bu hissələrə toxunmayıblar. Halbuki bu misal daha münasibdir. O zaman bir daha əl-Cuveyni’nin izahına nəzər salaq.

əl-Cuveyni burada birdən çox nəfərin imam olmağa yararlı olduğu halda baş verə biləcək üç süjet təqdim edir:
**Birinci halda** heç bir ani ehtiyac, gözləmək üçün şans buraxmayan zərurət olmadan namizədlərdən birinin gücündən, hazırlığından istifadə edərək, həll və əqd əhlindən beyət almadan hakimiyyəti ələ keçirməsidir. əl-Cuveyni'yə görə bunu etmək fisqdir, ona görə də bunu edən fasiq olur və fasiqə imamlıq əqdini bağlamaq, ona beyət etmək caiz deyildir.
**İkinci halda** ani ehtiyac və zəruriyyət tələbi ilə namizədlərdən biri güc ilə hakimiyyəti ələ keçirir, daha sonra bu ehtiyac aradan qalxır, vəziyyət dəyişir, amma həmin namizəd hakimiyyətdən əl çəkmək istəmir, əksinə həll və əqd əhlini zorla, məcburiyyət ilə özünə beyət etdirməyə çalışır. Bu da əl-Cuveyni'yə görə onun fasiq olmasına səbəbdir və belə birinə beyət etmək icazəli deyildir.
**Üçüncü halda** isə eyni ehtiyac və zərurətin gərəyi ilə davranaraq gücünə, qüvvəsinə etimad edərək hakimiyyəti ələ keçirir, daha sonra ədalətinə, idarəsinə görə insanlar tərəfindən sevilir və insanlar onu dəstəkləyirlər, onun ətrafında toplaşırlar, o isə hakimiyyətdən getmək istəyir, lakin bunu edəcəyi halda fitnə və fəsad ortaya çıxa bilər. əl-Cuveyni'yə görə bu halda həll və əqd əhlinin belə birinə beyət etməsi vacibdir, çünki əks təqdirdə fitnə və fəsad baş verəcək. Lakin bununla belə əl-Cuveyni deyir ki, ona beyət etmək həll və əqd əhlinə vacib olsa da onlar beyət etmədikcə həmin adam imam ola bilməz, yəni legitim, qanuni imam ola bilməz.
Daha sonra əl-Cuveyni qeyd edir ki, onun seçdiyi bu görüş zənni dəlillərə dayanan ictihaddır və bununla başqa birinin başqa düşüncə ilə fərqli nəticəyə gələ biləcəyini qəbul edir, yəni qəbul edir ki, bir başqa alim bu halda onun imamlığının sabit ola biləcəyini söyləyə bilər, çünki məsələ zənnidir. Lakin üçüncü halda hakimiyyətdə olan kəsə həll və əqd əhlinin beyət etməsinin vacib olması hökmünün isə qəti olduğunu vurğulayır.
Bu gün xilafət adı ilə edilənlər görəsən bu süjetlərdən hansına uyğun gəlir? Bu sualın cavabı əql sahibləri üçün çox aydındır. Lakin onu da əlavə edək ki, əl-Cuveyni'nin bu dedikləri imamlıq məqamına yarayan birdən çox namizədin olduğu zamana aiddir. O, bu təfsilatı qeyd etdikdən sonra buyurur:

“هَذَا كُلُّهُ فِي اسْتِيلَاء مَنْ هُوَ صَالِحٌ لِمَنْصِبِ الْإِمَامَةِ، وَهُوَ قِسْمٌ وَاحِدٌ مِنَ الْأَقْسَامِ الثَّلَاثَةِ الْمَرسُومَةِ فِي صَدْرِ الْبَابِ”

> “**Bunların hamısı imamlıq vəzifəsinə yarayan birinin istilası haqqındadır və bu, babın əvvəlində təsvir edilən üç qisimdən biridir.**”

əl-Cuveyni daha sonra imamlığa yararlı olmaq üçün bəzi şərtləri naqis olan kəslərin halını qeyd edir və onlardan birinin güclə, qüvvətlə hakimiyyəti ələ keçirməsi halını burada zikr etdiyi üç süjetə ərz edir. Burada söylədiklərini o hal üçün də keçərli sayır. Bütün bu sözlərini onun “əl-Ğiyəsi” kitabından 317-ci səhifədən 328-ci səhifəyə qədər[87] oxumaq olar.
Yekun olaraq bu bölmədə qeyd etdiklərimizi təkrar gözdən keçirək. Beləliklə də aydın oldu ki, əl-Cuveyni yalnız bir halda həll və əqd əhlinin beyətini şərt görmür; o da zamanında imamlığa yarayan və şərtləri ödəyən tək bir namizədin

[87] Məktəbətu İməmil-Harameyn

olduğu haldır. Bununla bağlı həm də sübut olundu ki, əl-Cuveyni'nin bu halda beyəti şərt görməməsi əksər fəqihlərin görüşünə müxalifdir. Həmçinin aydın oldu ki, namizədlər birdən çox olarsa əl-Cuveyni'yə görə sadəcə güc və qüvvət ilə imamlıq məqamını ələ keçirmək imamlığın səhih və sabit olması üçün kifayət etmir, lakin həll və əqd əhlinin beyət etməsi şərtdir. Buradan da aydın olur ki, güc, qüvvətlə bağlı iddia edilən icma xəyali bir şeydir, reallıqda yoxdur və Əbul-Məhasin qardaşımız məqaləsini araşdırmadan, tələsərək, əl-Bağdadi tərəfdarlarından olan bəzi məchul şəxslərin yazdığı məqalələrdən iqtibas etmişdir.

## Bəs daha öncə?

Burada üzərində düşünülməsi önəmli olan bəzi suallar vardır. Ümmətin fərz olan xilafəti qurmaması onun acizliyindəndir yoxsa asiliyindən? Hamımız bilirik ki, ümmət əsrlərdir ki, tənəzzül mərhələsindədir. Bu o deməkdir ki, bir öncəki əsrdəki halımız bu əsrdəki halımızdan daha yaxşı idi, liderlərimiz və alimlərimiz daha müstəqil idilər, daha şücaətli və elmli idilər. Onlardakı ümmət şüuru daha güclü idi. Ondan bir öncəki əsr isə bu göstəricilərdə özündən sonrakı əsrlərdən daha üstün idi. Lakin xilafət fərziyyəti bu əsrdə ortaya çıxmış bir şey deyildir. Məlumdur ki, nəcd alimləri, daha dəqiq desək İbn Abdilvahhab'ın dəvətinə tabe olmuş alimlər Osmanlı dövlətini xilafət saymırdılar. Sözümüzü daha da dəqiqləşdirək və etiraf edək ki, ümumiyyətlə Osmanlı dövlətini müsəlman dövləti hesab etmirdilər, müşrik, kafir dövləti hesab edirdilər. Buradan ortaya çıxan məntiqi və təbii nəticə budur ki, nəcdli alimlərə görə onların zamanında ümməti idarə edən bir xilafət yox idi, halbuki onlar da hənbəli köklərinə tabe olaraq xilafətin qurulmasını vacib hesab edirdilər. O zaman ortaya belə bir sual çıxır: Nə üçün nə Muhəmməd bin Abdilvahhab, nə onun oğulları, nə nəvələri, nə də onların yoluna tabe olmuş digər nəcdli alimləri ümmət üçün xilafət qurmadılar, xilafət elan etmədilər?! Halbuki Aluş-Şeyx alimlərinin dəstəyi ilə Səud ailəsi ayrı-ayrı vaxtlarda üç dəfə dövlət qurdu və hər dəfəsində geniş torpaqları əhatə edən bir ərazi üzərində hökm sürüblər, hətta elə birinci Səudiyyə dövlətinin ən güclü vaxtında Məkkə və Mədinə'ni ələ keçirməyi bacarmışdılar. Alimlərinin və qoşunlarının olmasına baxmayaraq və ümmətin ən müqəddəs iki şəhərini əllərində tutmaqlarına baxmayaraq Səud ailəsinin ətrafındakı həll və əqd əhli bu halların heç birində xilafət elan etmədi. O zaman bu günün ümməti üçün verdiyimiz sualı onlar üçün də veririk. Onların xilafət qurmamaqlarının səbəbi acizlik və çarəsizlik idi yoxsa asilik və etinasızlıq idi?
Etiraf etmək lazımdır ki, Osmanlı dövlətini xilafət kimi qəbul etməyənlər təkcə nəcdlilər deyildilər, həmçinin yəmənli alimlərdən bir çoxları osmanlıları xilafət sahibləri kimi qəbul etmirdilər. Onların başında Qazi Muhəmməd Əli əş-Şəvkəni durur. Bəlkə də onların təsiri ilə hindistanlı alimlərdən Siddiq Həsən də bu rəydə olmuşdu. Belə ki, Alləmə Siddiq Həsən əl-Qannəvci (1248-1307) deyir:

"نعم نصب الإمام على الأمة واجب سمعاً وهو مجمع عليه؛ ولهذا قدمه الصحابة على دفن النبي صلى الله عليه وسلم، وعدوّه أهم المهمات، لكن آخر الزمان بناء على ضعف الإسلام صار نصبِ الإمام متروكاً ومهجوراً من الأمة، وليس هذا بأول قارورةٍ كسرت في الإسلام، وذُكر الكلام في هذا الباب بتمامه في رسالة (( إكليل الكرامة في تبيان مقاصد الإمامة )) فليرجع إليه، والله أعلم"

**"Bəli, ümmət üzərində imam təyini vəhyi dəlillərə əsasən vacibdir və bunun üzərində icma vardır, ona görə də səhabələr bunu peyğəmbərin – salləllahu aleyhi va səlləm – dəfnindən önə keçirdilər və bunu ən əsas tapşırıqlardan biri hesab etdilər. Lakin müsəlmanların zəifliyinə binaən axır zamanlarda imam təyini ümmət tərəfindən tərk olunub və bu, İslamda qırılmış ilk şüşə deyildir. Bu mövzu barədə söhbət tamamı ilə "İklilul-Kəramə fi Tibyəni Məqasidil-İməmə" adlı risalədə zikr olunub, ona müraciət edilsin. Doğrusunu Allah bilir!"**[88]

Maraqlıdır ki, Siddiq Həsən ölənə qədər 19 il müddətində Hindistanın mərkəzindəki Bhopal sultanlığının xanım sultanı Şahcahan ilə evli idi və siyasi hakimiyyətə sahib idi. Üstəlik nəcdli alimlər ilə yaxşı münasibətdə olmasına baxmayaraq xilafətin qurulması üçün heç bir müştərək bir təşəbbüs göstərməmişdilər.
Ola bilərmi ki, onlar məsələyə reallıq eynəyindən baxdıqları üçün bunun müasir şərtlər daxilində imkansız olduğunu dərk edirdilər. Çünki daha öncə də əş-Şəvkəni və qeyrilərindən təqdim etdiyimiz kimi onlar xilafətdəki ən əsas məqsədin ümmətin hövzəsini qorumaq olduğunu anladıqları üçün bunun kiçik bir ölkədə hökm sahibi olmaqla baş verməyəcəyini gözəl anlayırdılar. Həmçinin elan ediləcək xilafətin ümmət tərəfindən qəbul edilməyəcəyi bilindiyi üçün, başqa sözlə seçiləcək xəlifəyə ümmətin itaət etməyəcəyi bilindiyi üçün bunu etməkdə bir məna görmürdülər. Ümmətin itaətsizliyinin səbəbləri isə çoxdur, ən başda nəfslərində şəriət ruhunun zəifləməsi durur, lakin həm də qərbli müstəmləkəçilərin bilvasitə vəya bilavasitə idarəsi altında olmaqlarından da irəli gəlir. Onların dövründə bu nə qədər real idisə bizim dövrümüzdə də elədir və daha pisdir. Bizim zamanımıza uyğun olan bu acizliyi, bu çarəsizliyi Muhəmməd Raşid Rida növbəti sözləri ilə izah edir:

"هَذَا وَأما الْبِلَاد الإسلامية الرازحة تَحت أثقال السيطرة الْأَجْنَبِيَّة كمصر وَسَائِر أقطار إفريقية الشمالية وسورية وَالْعراق فَلَيْسَ لَهَا من أمر حكمهَا أَو حُكُومَة دينهَا شَيْء. وَلَيْسَ فِيهَا جمَاعَة تتصرف فِي ذَلِك بِحل وَلَا عقد، فَلَو أَن رُؤَسَاء الْحُكُومَة والشعب فِي قطر مِنْهَا - وهم الَّذين كَانُوا لَوْلَا السلطة الْأَجْنَبِيَّة أهل الْحل وَالْعقد فِيهَا - أرَادوا أَن يبايعوا خَليفَة فِي بِلَاد التّرْك أَو الْعَرَب مثلا مبايعة صَحِيحَة، وَهِي مَا توجب عَلَيْهِم أَن يَكُونُوا خاضعين لسلطانه، مُطيعينَ فِي أُمورهم الْعَامَّة لأمره وَنَهْيه، ناصرين لَهُ على من يقاتله أَو يبغى عَلَيْهِ، لما اسْتَطَاعُوا أَن

[88] "Fətəva əl-İməm əş-Şərif Siddiq Həsən əl-Qannəvci əl-Buxari", səh: 255-256;

يمضوا ذَلك وينفذوه بِدُونِ إِذن الدولة الْأَجْنَبِيَّة المسيطرة عَلَيْهِم، وَهي لن تَأذن وَإِن كَانَت تَدعِي أَنَّهَا لَا تعَارض الْمُسلمين فِي أُمُور دينهم، وَأَنَّهَا تاركة أَمر الْخلَافَة إِلَيهِم."

**"Misir, Şimali Afrikanın digər ölkələri, Suriya, İraq kimi əcnəbi kontrolu altında olan zəif müsəlman ölkələrinə gəldikdə isə hakimiyyətdən və ya dinini idarə etməkdən onların bir payı yoxdur... orada məsələlərin həll edilməsi və bağlanması işlərində sərbəst davranan bir camaat yoxdur. Əgər o ölkələrdən birindəki hökumət başçıları və xalq – və onlar o kəslərdir ki, əgər əcnəbi hökmranlıq olmasaydı orada həll və əqd əhli onlar olacaqdı – misal üçün türklərin və ya ərəblərin ölkəsindəki bir xəlifəyə səhih bir beyət ilə - və bu, onun hakimiyyətinə boyun əyməyi, ümumi işlərində onun əmrinə və qadağasına itaət etməyi, ona qarşı vuruşanlara və ya həddini aşanlara qarşı ona dəstək verməyi onlara vacib edən bir beyətdir - beyət etmək istəsəydilər onları kontrol edən əcnəbi dövlətin izni olmadan bunu həyata keçirməyi və icra etməyi bacara bilməzdilər. O dövlət isə müsəlmanların dini işlərinə qarışmadığını, xilafət məsələsini onların özlərinə tərk etdiyini iddia etsə də heç zaman buna izn verməz."**[89]

Muhəmməd Raşid Rida bir şəriət alimi kimi insanda etibar doğuran biri olmasa da onun öz dövründə ictimai və siyasi həyatda aktiv iştirak edən, ümmətin siyasi və ictimai varlığını yaxından izləyən, onların çətinliklərinə vaqif olan biri idi. Ümmətin acizliyini görmək üçün mötəbər bir şəriət alimi olmaq lazım deyildir, əksinə şəriət aliminin görə bilmədiyini sosioloqlar, siyasətçilər görürlər.

O dövrdə sadalanan ölkələr qərbli müstəmləkəçilərin kontrolu altında idilər və bu gün onların bir başa kontrolundan azad olsalar da acizlik əvvəlki kimi davam edir. Çünki onların rolunu bu gün mənəviyyatlarını əcnəbilərə satmış yerli hökumətlər yerinə yetirirlər.

Hər bir halda qarşımızda bu alimlərin halı ilə bağlı iki ehtimal vardır; birinci ehtimal budur ki, bu alimlər xilafət qurmağın vacib olduğunu bildikləri halda ehmalkarlıq edərək bu əhəmiyyətli vacibi tərk ediblər və bu zaman asi olurlar və etibardan düşürlər. İkinci ehtimal isə budur ki, bu alimlər xilafət qurmaqdan ümmətin aciz olduğunu görürdülər və buna görə də yalnız daha real olan məhdud bir imamlıq qurmaqla kifayətlənirdilər, necə ki, Siddiq Həsən Bhopal əmirliyində islahatlar ilə məşğul olduğu kimi nəcdlilər də Nəcd və Hicaz torpaqlarında dövlət qurmağa çalışırdılar, lakin heç biri bütün ümmət üzərində xilafət iddia etmirdi və gözəl anlayırdılar ki, xilafət elan etdikləri təqdirdə nə uzaq məğribdə, nə də uzaq məşriqdə yerləşən ümməti ingilislərin, italyanların, fransızların və digər azğın küfr qüvvələrinin hücumundan qoruya bilməyəcəklər. O zaman bütün ümmət üzərində xilafət elan etmək və bütün ümmətə onlara itaət etməyi vacib görmək hansı məntiqin, hansı şəriətin məhsulu ola bilərdi?!

[89] "əl-Xiləfə", səh: 65;

## Xilafətin qurulmasında acizlik

O zaman xilafəti qurmaqdan aciz düşən ümmətin halını müzakirə edək. Belə bir şey nəzəri olaraq müzakirə olunubmu? Praktikada atılacaq addımlar nə olmalıdır?
İlk öncə anlamaq lazımdır ki, zərurətlərdə vaciblər qüvvədən düşə bilir. Ona görə də alimlər imam üçün tələb olunan şərtlərin bir çoxunu zərurət halında düşürürlər. Bunun ən bariz nümunəsi güc yolu ilə hakimiyyəti ələ alan fasiq bir müsəlmanın imamlığını zərurət olduğu üçün qəbul etməkləridir, çünki belə birini imamlıq məqamından güc yolu ilə dəf etmək daha böyük fəsada səbəb olacağı üçün onun hakim olmasına səbr etmək zərurətdən sayılmışdır. Alləmə Saduddin ət-Təftəzəni deyir:

“وبالجملة مبنى ما ذكر في باب الإمامة على الاختيار والاقتدار ، وأما عند العجز والاضطرار ، واستيلاء الظلمة والكفار والفجار ، وتسلط الجبابرة الأشرار ، فقد صارت الرئاسة الدنيوية تغلبية ، وبنيت عليها الأحكام الدينية المنوطة بالإمام ضرورة ، ولم يعبأ بعدم العلم والعدالة وسائر الشرائط ، والضرورات تبيح المحظورات ، وإلى الله المشتكى في النائبات ، وهو المرتجى لكشف الملمات”

**“Yekun olaraq imamlıq babında zikr olunanların üzərində durduğu əsas seçim və qüdrətdir, lakin acizlik və məcburiyyət qarşısında qaldıqda və zalımların, kafirlərin və facirlərin istilası, şər sahibi despotların təsəllütü ilə üzləşdikdə hökmranlıq dünyəviliyə, zorakılığa çevrilir və imamla bağlı olan dini əhkamlar zəruri olaraq bunun üzərinə bina edilir və (bu halda imamda axtarılan) elm, ədalət və digər şərtlərə əhəmiyyət verilməz. Zərurətlər qadağaları mübah edir. Müsibətlərdə şikayət Allaha edilər və fəlakətlərdən qurtulmaq üçün ümid yeri Odur.”**[90]

[90]“Şərh əl-Məqasid”, 5/245;

Əgər bu sözləri anlaya biliriksə imamlıqla bağlı hökmlərin də zərurətə tabe olduğunu başa düşməliyik. Ona görə də zərurət halında vacib olan bu zərurətin bizə verdiyi imkan qədərində hərəkət etməkdir. İslam tarixi ərzində yalnız çox az sayda imam imamlıq şərtlərini tam şəkildə ödəyib. Onların çoxunda imamlıq şərtlərindən biri və ya bir neçəsi olmayıb. Tarixdə gəlib keçmiş çox sayda xəlifədə nəinki elm və ictihad şərti, heç adillik şərti də olmayıb, osmanlılarda bundan savayı həm də qureyş şərti əsrlər boyunca mövcud olmayıb. Hətta bir çoxu ümumiyyətlə şəri imam sayılmaq üçün heç bir şərtə sahib olmayıblar, başqa sözlə desək yalnız surətdə hakim olublar, həqiqətdə şəri bir imam olmayıblar, yalnız məsləhət xatirinə onlara itaət edilmiş və boyun əyilmişdir. Ona görə də ət-Təftəzəni kitabında müxaliflərin bununla bağlı etdikləri etirazı zikr edir və ona cavab verir və deyir:

“فإن قيل لو وجب نصب الإمام لزم إطباق الأمة في أكثر الأعصار على ترك الواجب لانتفاء الإمام المتصف بما يجب من الصفات سيما بعد انقضاء الدولة العباسية... قلنا إنما يلزم الضلالة لو تركوه عن قدرة واختبار لا عجز واضطرار”

**”Əgər desələr ki, imamın təyin edilməsi vacibdirsə burada ümmətin əksər əsrlərdə vacibi tərk etməkləri nəticəsi çıxarılmalıdır, çünki (bir imamda) vacib olan sifətlərlə vəsf olunacaq imam – xüsusilə də abbasi dövləti aradan qalxdıqdan sonra – olmamışdır... (Bunun cavabında) deyirik: (ümmətin) zəlalətdə olması yalnız qadir onların olduqları, seçim etmək imkanları olduğu halda lazım olardı, amma aciz olduqları üçün, məcburiyyət olduğu üçün (zəlalətdə) olmurlar.”**[91]

Məgər abbasilərin süqutundan sonra ümmətdə imam olmağa layiq qureyşli fəzilət sahibi liderlər yox idimi?! Məgər onlara dəstək verəcək alimlər, avtoritet sahibləri yox idimi?! Əlbəttə ki, var idi. Lakin o dövrün alimləri çox gözəl başa düşürdülər ki, başlarına keçmiş sultanlar və özlərini xəlifə sayan hakimlər əslində şəriət tələb etdiyi xəlifəliyə uyğun olmasalar da həmin halda xilafətə layiq olan birinə xəlifə olaraq beyət etmək ümmətin yanında uğur qazanmayacaqdı, əksinə ümmətin parçalanmasına, mövcud nizamın dağılmasına səbəb ola bilərdi. Həmin sultanlar, hakimlər xəlifəlik məqamına uyğun olmalar da, tələb olunan şərtləri ödəməsələr də onların hakimiyyəti altında müsəlmanların qanları və malları qorunulur, yollarda əmin-amanlıq təmin olunur, insanların yaşaması üçün tələb olunan ictimai və iqtisadi şərtlər ödənilir. Yoxsa həmin alimlərin ümmət üçün imam olmağa yarayan kəsə əl uzatmaq üçün əlləri qurumamışdı, ümməti ona beyət etməyə çağırmaq üçün dilləri kəsilməmişdi, bunu elan edərək yazı yazmaq üçün qələmləri qırılmamışdı. Lakin izah etdiyimiz kimi vəziyyətin tələblərinə tabe olmağa məcbur idilər. Ona görə də İbn Həcər əl-Heytəmi deyir:

[91]“Şərh əl-Məqasid”, 5/238-239;

“وَقَدْ يُشْكِلُ عَلَيْهِ مَا فِي التَّوَارِيخِ وَالطَّبَقَاتِ مِنْ تَنْفِيذِ الْعُلَمَاءِ وَغَيْرِهِمْ عُهُودَ خُلَفَاءِ بَنِي الْعَبَّاسِ مَعَ عَدَمِ اسْتِجْمَاعِهِمْ لِلشُّرُوطِ بَلْ نَفَّذَ السَّلَفُ عُهُودَ بَنِي أُمَيَّةَ مَعَ أَنَّهُمْ كَذَلِكَ إلَّا أَنْ يُقَالَ هَذِهِ وَقَائِعُ مُحْتَمَلَةٌ أَنَّهُمْ إنَّمَا نَفَّذُوا ذَلِكَ لِلشَّوْكَةِ وَخَشْيَةِ الْفِتْنَةِ لَا لِلْعَهْدِ بَلْ هَذَا هُوَ الظَّاهِرُ”

“**Bu rəy üzərinə bir müşkil ortaya çıxır ki, tarix və təbəqat kitablarında zikr olunduğu kimi abbasi xəlifələrinin özlərindən sonra vəliəhd təyin etməklərini alimlər qəbul ediblər/keçərli sayıblar, halbuki onlar (imamlıq) şərtlər(in)i özlərində cəm etməmişdilər. Hətta sələf əməvilərin vəliəhd təyin etməklərini keçərli saymışdılar, halbuki onlar da abbasilər kimi idilər. Lakin bununla bağlı demək olar ki, bütün bunlar onların bunu (imamın) qüdrətinə görə, fitnənin çıxmasından qorxduqlarına görə keçərli saymaqları ehtimalı daşıyan vaqeələrdir, yoxsa vəliəhdliyi doğru saydıqlarına görə keçərli saymamışdılar. Hətta deyərdim ki, aşkar görünən budur.**”[92]

Onları şəriətin tələbindən geri çəkilməyə məcbur edən zərurət nə idi? İbn Həcər əl-Heytəmi’nin zikr etdiyi kimi fitnənin baş verməsi qorxusu idi. Məlum məsələdir ki, əməvi xəlifələri özlərindən sonra zalım və fasiq olan, elmi olmayan kəsləri xəlifə olaraq əhd edirdilər, lakin o dövrdə xəlifə olmağa layiq olan, bütün şərtləri ödəyən fəzilət sahibi liderlər var idi. Buna baxmayaraq ümmətin böyük əksəriyyəti hakimiyyəti qəsb etmiş əməvilərdən haqqı geri almaq üçün edilən üsyanları dəstəkləmirdilər. Müsəlmanların qanlarının axması qorxusu onları bu vacibiyyətdən əl çəkməyə məcbur edirdi.

Bununla bağlı bir misal verməyi məsləhətli görürəm. Abdurrahmən ibn əl-Əş’as hicri 80-ci ildə Həccac’a və əməvi xəlifəli Abdulməlik bin Mərvana qarşı üsyan etdi. Üsyanın ən əsas səbəbi əməvi xəlifəsinin İraq üzərinə təyin etdiyi vali Həccac’ın zülmü, qəddarlığı idi. İbn Həcər əl-Asqələni deyir:

“وخرج عليه ابن الأشعث ومعه أكثر الفقهاء والقراء من أهل البصرة وغيرها فحاربه حتى قتله وتتبع من كان معه فعرضهم على السيف فمن أقر له أنه كفر بخروجه عليه أطلقه ومن امتنع قتله صبرا”

“**Ona (yəni Həccaca) qarşı İbnuş-Əş’as üsyan etdi və onunla birlikdə Basra əhlindən və başqalarından olan fəqihlərin və qarilərin əksəriyyəti var idi. (Həccac) onunla müharibə etdi və sonunda onu öldürdü, daha sonra onu dəstəkləyənləri bir-biri tutdurdu və onları qılıncın altına ərz etdi, belə ki, hər kim ona qarşı çıxmaqla küfr etdiyini təsdiqləyirdisə onu sərbəst buraxırdı və imtina edənləri isə məhbus olaraq öldürürdü.**”[93]

[92] “Tuhfətul-Muhtəc”, 9/78;
[93] “Təhzibut-Təhzib”, 2/210-211;

Həqiqətən də İbnul-Əş’as üsyan etdikdə dövrünün bir çox fəqihi, alimi onu dəstəkləmişdi və ona beyət etmişdi. O alimlərin arasında Əbul-Bəxtəri, Abdurrahmən bin Əbi Leyla, Said bin Cubeyr, Şabi kimi böyük şəxsiyyətlər var idi. İbnul-Əş’asın üsyanı üç ildən çox çəkdi və ilk əvvəllər əməvi ordularını dəfələrlə məğlub edirdi və bir çox yeri ələ keçirmişdi. Lakin sonunda ordusu məğlub oldu və özü qaçmalı oldu. Ən sonunda ələ keçirilərək edam edildi. İbnul-Əş’as çox sayda böyük alim tərəfindən dəstək görsə də ümmətin böyük əksəriyyəti, yəni həll və əqd əhlinin əksəriyyəti bu üsyanı təsvib etmədilər və ondan sonra gəlmiş alimlərimiz də bu hadisələri fitnə olaraq vəsf ediblər. Bununla bağlı böyük alim, tarixçi alləmə İmam İmədudd in İbn Kəsir’in reaksiyası çox maraqlıdır. İbn Kəsir tarix kitabında o dövrün hadisələrini və hadisələrin səbəblərini geniş bir şəkildə izah etdikdən sonra ona beyət etmiş alimlərin, fəqihlərin etdiklərinə təəccübünü gizlətməyərək deyir:

“وَالْعَجَبُ كُلُّ الْعَجَبِ مِنْ هَؤُلَاءِ الَّذِينَ بَايَعُوهُ بِالْإِمَارَةِ وَلَيْسَ مِنْ قُرَيْشٍ، وَإِنَّمَا هُوَ كِنْدِيٌّ مِنَ الْيَمَنِ... فَكَيْفَ يَعْمِدُونَ إِلَى خَلِيفَةٍ قَدْ بُويِعَ لَهُ بِالْإِمَارَةِ عَلَى الْمُسْلِمِينَ مِنْ سِنِينَ فَيَعْزِلُونَهُ وَهُوَ مِنْ صَلِيبَةِ قُرَيْشٍ وَيُبَايِعُونَ لِرَجُلٍ كِنْدِيٍّ بَيْعَةً لَمْ يَتَّفِقْ عَلَيْهَا أَهْلُ الْحَلِّ وَالْعَقْدِ؟ وَلِهَذَا لَمَّا كَانَتْ هَذِهِ زَلَّةٌ وَفَلْتَةٌ نَشَأَ بِسَبَبِهَا شَرٌّ كَثِيرٌ هَلَكَ فِيهِ خَلْقٌ كَثِيرٌ فَإِنَّا لِلَّهِ وَإِنَّا إِلَيْهِ رَاجِعُونَ.”

“**Ona əmirliklə beyət edənlərin etdikləri nə qədər də çox təəccüblüdür, o isə o qureyşli deyildir, o sadəcə Yəməndən olan kindi’dir.... Axı illərdən bəri müsəlmanlar üzərində əmir olması üçün beyət edilmiş bir xəlifəyə qarşı çıxıb, qureyşin sülbündən olduğu halda onu vəzifəsindən əzl edib onun əvəzinə kindi qəbiləsindən olan bir nəfərə necə beyət edirlər, halbuki ona beyət üzərində həll və əqd əhli ittifaq etməmişdi?! Buna görə də bu, bir xəta və tələskənlik olduğu üçün bunun səbəbi ilə çoxlu şər yayıldı, çox sayda insan öldü. Şübhəsiz ki, Allaha aidik və Ona geri dönəcəyik.**“[94]

İbn Kəsir təəccüb edir; necə olur ki, bu alimlər qureyşdən olan və illərlə həll və əqd əhlinin beyətini almış xəlifəni vəzifəsindən əzl edirlər və imamlıq üçün tələb olunan şərtlərin hamısını özündə cəm etmədiyi, üzərində həll və əqd əhlinin ittifaq etmədiyi bir nəfərə beyət edirlər? İşin üzərində razılaşdığımız tərəfi budur ki, İbnul-Əş’as şücaəti, ədaləti, elm əhlinə göstərdiyi inayəsi ilə xilafəliyə daha layiq idi, lakin fitnədən, müsəlman qanlarının axıdılmasından qaçmaq üçün ümmətin əksəriyyəti ona dəstək göstərmədi. İmam Zeyd bin Əli’nin qaldırdığı və rəhbərlik etdiyi uğursuz üsyanları da bura aid etmək olar, çünki onlar da əksər həll və əqd əhli tərəfindən tələb olunan dəstəyi qazanmamışdı.
Bunlar tarixin səhifələrində vərəqləyib oxuya bildiyimiz hadisələrdir və onların zamanına aiddir. O dövrdə hal necə olsa da xəlifə fiquru mövcud idi və alimlərin

[94] “əl-Bidəyə van-Nihəyə”, 9/66;

bir qisminin o xəlifələrin şər'iyyətini mübahisəli hesab etməkləri mövcud faktı dəyişmir. Fakt isə budur ki, nə qədər də zalım və fasiq olsalar da xilafət vəzifəsini daşıyan kəslər var idi. Bizim zamanımızda isə belə bir xəlifəlik yerli, dibli mövcud deyildir, xilafətin heç bir əsər, əlaməti də yoxdur. Onların zamanında söhbət xilafətin islahından gedirdisə bizim zamanımızda söhbət xilafətin sıfırdan qurulmasından gedir. Bəs bu halda zərurət atılan addımları nə dərəcədə məhdudlaşdırır? Ola bilərmi ki, ümumiyyətlə ümmətdə gördüyümüz bu acizlik xilafətin qurulması vacibliyini düşürür? Daha dəqiq desək ümmətin itaət etməyəcəyini bildiyimiz halda şərtlərə qismən cavab verən bir nəfəri həll və əqd əhlinin seçməsi vacibi əda etmək sayılacaqmı? Bu sualı müzakirə edənlərdən biri də Alləmə Saduddin ət-Təftəzəni olub. O, bu barədə "Şərhul-Məqasid" kitabında deyir:

"وههنا بحث آخر وهو أنه إذا لم يوجد إمام على شرائطه وبايع طائفة من أهل الحل والعقد قرشيا فيه بعض الشرائط من غير نفاذ لأحكامه وطاعة من العامة لأوامره وشوكة بها يتصرف في مصالح العباد ويقتدر على النصب والعزل لمن أراد هل يكون ذلك إتيانا بالواجب وهل يجب على ذوي الشوكة العظيمة من ملوك الأطراف المتصفين بحسن السياسة والعدل والإنصاف أن يفوضوا الأمر إليه بالكلية ويكونوا لديه كسائر الرعية"

"**Burada başqa bir bəhs vardır; əgər imamlıq şərtlərinə uyğun olan bir imam yoxdursa, həll və əqd əhlindən bir qrup bəzi şərtləri özündə daşıyan bir qureyşliyə beyət edərsə, lakin onun hökmlərinin heç bir təsiri/tətbiqi yoxdursa və xalq kütləsi onun əmirlərinə itaət etmirsə, bəndələrin məsləhətlərində təsərrüf etmək, istədiyini vəzifəyə təyin edib o vəzifədən çıxarmağa qadir olmaq üçün qüdrəti olmazsa, bu, vacib olanı yerinə yetirmək sayılacaqmı? Böyük güc və qüdrətə sahib, gözəl siyasət, ədalət və insaf ilə vəsf olunan ətraf ölkələrin krallarına bu işi tamamilə ona tərk etmək və onun yanında digər rəiyyəti kimi olmaq vacibdirmi?**"

ət-Təftəzəni'nin təqdim etdiyi bu bəhsi daha sadə sözlərlə izah edək. Ümmətin üzərində heç bir imam yoxdur və xəlifə seçmək fərzdir. Lakin bütün şərtləri özündə cəm edən bir qureyşli yoxdur, lakin bəzi şərtlərə cavab verən bir qureyşli vardır və həll və əqd əhlindən bir qrup həmin qureyşliyə xəlifə olaraq beyət edirlər. Amma problem budur ki, həmin xəlifə ümmət üzərində bir nüfuza sahib deyildir, verdiyi hökmlər tətbiq olunmur, ümmət ona itaət etmir, istədiyini vəzifəyə təyin edib, istədiyini vəzifədən çıxara bilmir. Lakin buna baxmayaraq yenə də belə birinə həll və əqd əhli beyət edərsə bu vacibi yerinə yetirmək sayılacaqmı? Əgər sayılacaqsa o zaman müxtəlif ölkələrdəki müsəlman hakimlərə ona itaət etmək və ona tabe olmaq, vəzifələrindən əl çəkərək onun idarəsi altına keçmək vacib olacaq. ət-Təftəzəni'nin sözlərindən başa düşürük ki, bu məsələ müzakirəyə tabe olan bir məsələdir. Bu halda vacibi yerinə yetirmiş saymaq da olar, saymamaq da olar. Lakin ət-Təftəzəni daha sonra özü hansı rəyə meyl etdiyini göstərərək deyir:

“وقد يتمسك بمثل قوله تعالى (أطيعوا الله وأطيعوا الرسول وأولي الأمر منكم) وقوله صلى الله عليه وسلم من مات ولم يعرف إمام زمانه مات ميتة جاهلية فإن وجوب الطاعة والمعرفة يقتضي وجوب الحصول”

**“(Bununla bağlı) Allahu təalənin “Allaha itaət edin və Allahın elçisinə itaət edin, həm də sizdən olan əmr sahiblərinə” sözünə və peyğəmbərin – salləllahu aleyhi va səlləm – “kim zamanının imamını tanımadan ölərsə cahiliyyə ölüsü kimi ölər” sözünə əsaslanmaq olar, çünki itaətin və tanımağın vacibliyi (xəlifə təyinindəki vacibliyin) hasil olmasını gərəkdirir.”**[95]

Saduddin ət-Təftəzəni’nin bu sözləri onun qəti olaraq bu rəy üzərində dayanmadığını, lakin vacib olması rəyinə meyl etdiyini göstərir. Amma istənilən halda məsələ ictihadi bir məsələdir, ona görə də ət-Təftəzəni qəti olaraq vacib olduğunu demir, tərəddüd edir və vacib olması görüşünə meyl etdiyini göstərir. Ona görə də müfəssir alim Şihəbuddin Əbus-Sənə Mahmud əl-Alusi “Nəhcus-Sələmə ilə Məbəhisil-İməmə” adlı kitabında deyir:

“ويفهم من كلام بعض الأجلّة انه إذا لم يوجد إمام على الوجه المشروع بحيث يستجمع الشرائط، وبايعت طائفة من أهل الحل والعقد قرشيا فيه بعض الشرائط من غير نفاذ لأحكامه، وطاعة من العامة لأوامره، وشوكة بها يتصرف في مصالح العباد، من غير عزل ونصب لمن أراد، يكون ذلك إتيانا بالواجب”

“**Dəyərli alimlərdən birinin sözündən başa düşülür ki, şərtləri özündə toplayacaq şəkildə məşru qaydada bir imam olmazsa, həll və əqd əhlindən bir qrup bəzi şərtləri özündə daşıyan bir qureyşliyə beyət edərsə, lakin onun hökmlərinin heç bir təsiri/tətbiqi yoxdursa, xalq kütləsi onun əmirlərinə itaət etmirsə, bəndələrin məsləhətlərində təsərrüf etmək üçün qüdrəti yoxdursa, istədiyini vəzifədən çıxarıb vəzifəyə təyin edə bilmirsə, bunu etmək vacib olanı yerinə yetirmək sayılacaq...**“

Dəyərli alim ilə qəsd etdiyi təbii ki, Saduddin ət-Təftəzəni’dir. əl-Alusi’nin də sözlərindən başa düşülür ki, ət-Təftəzəni qəti olaraq bu görüşü ifadə etməmiş, lakin onun sözlərindən bu başa düşülür. Ona görə də sözlərinə “sözündən başa düşülür” deyərək başlamışdır. Bəzi alimlər ət-Təftəzəni’nin sözlərini sadəcə tərəddüd kimi qəbul ediblər və heç bir görüşə üstünlük verməməsi kimi başa düşüblər. Alləmə Əbus-Su’ud Abdulqadir bin Əli əl-Fəsi əl-Fihri (1007-1091) bu mövzunu müzakirə edərkən imamlığın səhih olması üçün onun hökmlərini tətbiq etmək qüdrətinin olmasını şərt görür və bu əsnada ət-Təftəzəni’nin sözlərinə toxunur:

“ثم ما ذُكِر في انعقاد البيعة للقاصر عن استيفاء بعض شرائط الإمامة وسقوط الواجب عن الخلق عند ذلك إنما هو مع شرط القدرة على تنفيذ الأحكام وحفظ

[95] “Şərhul-Məqasid”, 5/245

حدود الإسلام وانتصار المظلوم من الظالم وإلا فقد تردد السعد في بيعة العاجز مع فقد غيره فإنه ذكر أنه إذا لم يوجد إمام على شرائطه وقدمت طائفة من أهل الحل والعقد قرشيا فيه بعض الشروط من غير نفاذ لأحكامه ولا طاعة من العوام لأوامره ولا شوكة لَهُ بِهَا يَتَصَرَّفُ في مصارف العباد ويقدرُ على النصب والعذل أن يفوضوا إليه الأمرَ ويكونوا كسائر رعيته, وفي ذلك نظر."

"**Sonra imamlıq şərtlərindən bəzilərini ödəməkdə qüsurlu olana edilən beyətin keçərli olması və bu edildikdə vacibliyin insanların üzərindən düşməsi haqqında deyilənlər, hökmləri tətbiq etməyə, İslamın hüdudlarını qorumağa, zalıma qarşı məzluma dəstək verməyə qadir olmaq şərti ilədir, yoxsa əks təqdirdə əs-Sad (ət-Təftəzəni) başqası olmadıqda aciz birinə beyət etməkdə tərəddüd etmişdir, belə ki, o, zikr edir ki, "şərtləri ödəyən bir imam olmazsa və həll və əqd əhlindən bir qrup özündə bəzi şərtləri daşıyan bir qureyşlini irəli sürərlərsə, lakin onun verdiyi hökmlər tətbiq olunmazsa, siravi xalq kütləsi onun əmrlərinə itaət etməzsə, bəndələrin işlərində təsərrüf etmək üçün, vəzifəyə təyin etməyə və vəzifədən çıxarmağa qadir olmaq üçün qüdrəti olmazsa (hakimlər, sultanlar) bu işi ona tərk etməli və özləri də onun digər rəiyyəsi kimi olmalıdırlarmı?" Bu, mübahisəlidir.**"

Alləmə Abdulqadir əl-Fəsi təsdiqləyir ki, bu məsələ alimlər arasında mübahisəli bir məsələdir. Həmçinin onun sözlərinin zahirindən başa düşürük ki, ət-Təftəzəni özü tərəddüddə olub və bu məsələdə hansısa bir rəyə üstünlük verməyib. Lakin daha sonra çox önəmli bir nöqtəyə toxunur:

"وانظر قوله: "وقدمت طائفة من أهل الحل والعقد" فإن ذلك هو محل النظر وأما إن قدمه من ليس من أهل الحل والعقد ولا معرفة له بأحكام الإمامة ولا بأمور الدين بل قدَّمه بعض الغَوّغَاء والرِعاع بأنه ليس محل النظر بل يتفق على عدم لزومها إذ يشترط في أهل الحل والعقد العدالة ومعرفة أحكام ذلك كما هو المنصوص." "

"**Onun "həll və əqd əhlindən bir qureyşlini irəli sürərlərsə" sözünə nəzər salın, belə ki, mübahisə yeri buradır. Yoxsa onu həll və əqd əhlindən olmayanlar, imamlıq hökmləri, dini məsələlər barəsində mərifəti olmayanlar irəli sürərlərsə, hətta səfil qara millət onu irəli sürərlərsə, o zaman bu mübahisə nöqtəsi deyildir, əksinə bunun keçərli olmamasında ittifaq vardır, çünki həll və əqd əhlində adillik və bu barədəki hökmləri bilmək vacibdir, necə ki, bu bir mənalı şəkildə qeyd edilib.**"[96]

[96]"Risalətəni fil-İmamətil-Uzmə", səh: 35-36;

Beləliklə də bizim indiki halımızla bağlı olan bu məsələ həll və əqd əhlinin seçiminə bağlıdır, yoxsa həll və əqd əhli olmayan kəslərə buraxılmamışdır. Burada nəzərə alınması çox önəmli olan daha bir nöqtə vardır; əgər bu halda aciz birini xəlifə olaraq seçmək ümmətin parçalanmasına və müxtəlif qruplara bölünərək bir-birilərinə qarşı vuruşmaqlarına götürəcəksə o zaman bu xilafət keçərli sayılmamalıdır. Əgər nəzərə alsaq ki, bu halda xəlifə olaraq irəli sürüləni irəli sürənlər həll və əqd əhli olmağa yaramırlar, həm də belə bir addım ümmətin içində müsəlmanların qanlarını axıdan müharibələrə səbəb olur, o zaman bu xilafətin batilliyində heç bir şəkk və şübhə qalmamalıdır.
Acizlik ilə bağlı buraya qədər qeyd etdiklərimiz acizlik halında atıla biləcək addımlardan biridir və bu, izah etdiyimiz kimi şərtlərin hamısını ödəməyən aciz birini bütün ümmətin üzərində xəlifə olaraq seçmək və daha sonra ümmətdən ona itaət etməyi tələb etməkdir. Qeyd etdik ki, əgər belə bir şeyi həll və əqd əhlindən bir qrup edərsə və bunun daha böyük fitnəyə səbəb olmaq qorxusu olmazsa o zaman bəzi alimlərə görə bu keçərlidir. Lakin burada zərurət halında başqa bir addım da mövcuddur. Bu isə müxtəlif bölgələrdə birdən çox imamın seçilməsi və hər birinin idarə etdiyi torpaqlarda itaət olunması vacib bir imam olmasıdır. Əslində bu hal tarix boyu ümmətin tətbiq etdiyi bir model olub, çünki ümmətin yayıldığı coğrafiyanın genişliyi və böyüklüyü səbəbi ilə bir xəlifənin o dövrün imkanları ilə ümməti idarə etməsi imkansız idi, çünki xəlifənin əmirlərinin icra edilməsi üçün onun xəbərlərinin qısa bir müddətdə uzaq ölkələrə çatması lazım idi. Üstəlik itaətsizlik halında xəlifənin cəzasından qorxu olmalı idi, çünki xəlifə ehtiyac olduqda uzaq ölkələrə öz ordusunu göndərməyi bacarmalı idi. Əgər bunu edə bilmirdisə o zaman onun orada şövkəti, qüdrəti olmadığı üçün real siyasi bir hakimiyyəti də olmurdu. Bu isə öz növbəsində həmin ərazilərdə faktiki olaraq imamın mövcudluğunun hiss olunmamasına gətirib çıxarırdı. Bu problem ümmətin tarixi boyunca göz qarşısında olduğu üçün alimlərimiz bu barədə danışıblar və ixtilaf ediblər. Əksər alimlər eyni zamanda birdən çox imamın olmasını icazəli görməsələr də bir çox alim buna icazə vermişdir. Bununla bağlı bəzi alimlərin sözlərini zikr edək. əl-Qadi Əbu Abdilləh İbnul-Əzraq əl-Məliki (832-896) deyir:

“إن شرط وحدة الإمام بحيث لا يكون هناك غيره لا يلزم مع تعذر الإمكان. قال بن عرفة في ما حكاه الأبي عنه : "فلو بعد موضع الإمام حتى لا ينفذ حكمه في بعض الأقطار البعيدة، جاز نصب غيره في ذلك القطر." وللشيخ علم الدين من علماء العصر بالديار المصرية : يجوز ذلك للضرورة”

**“İmamın tək olması, o mənada ki, ondan başqa imamın olmaması şərti imkan olmadıqda vacib olmur. əl-Ubbi’nin hekayət etdiyinə görə İbn Arafə deyir: “Əgər imamın qaldığı yer onun hökmünün uzaq ölkələrdən birində keçərli olmayacağı dərəcədə uzaq olarsa, həmin ölkədə bir başqasının (imam olaraq) təyin edilməsi icazəlidir.” Misir diyarında əsrin alimlərindən olan Şeyx İlmuddin deyir: “Bu, zərurət olduqda icazəlidir.”...**”[97]

[97]“Bədəi’us-Silki fi Tabə’il-Mulki”, 1/77;

İlmuddin ilə qəsd etdiyi çox ehtimal ki, şafi'i alimi, İbn Həcərin tələbəsi Əbul-Həsən əs-Səxavidir, çünki onun müasirlərindən və misirli olub. İbn Arafə'nin isə böyük maliki alimi, üsulçu olduğu daha əvvəlki sətrlərdə zikr olundu. Maliki alimlərindən həmçinin böyük müfəssir Əbu Abdilləh əl-Qurtubi də bu rəydə olub və təfsirində bununla bağlı deyir:

"وهَذَا أَدَلُّ دَلِيلٍ عَلَى مَنْعِ إِقَامَةِ إِمَامَيْنِ، وَلأَنَّ ذَلِكَ يُؤَدِّي إِلَى النِّفَاقِ وَالْمُخَالَفَةِ وَالشِّقَاقِ وَحُدُوثِ الْفِتَنِ وَزَوَالِ النِّعَمِ، لَكِنْ إِنْ تَبَاعَدَتِ الْأَقْطَارُ وَتَبَايَنَتْ كَالْأَنْدَلُسِ وَخُرَاسَانَ جَازَ ذَلِكَ، عَلَى مَا يَأْتِي بَيَانُهُ إِنْ شَاءَ اللَّهُ تَعَالَى."

"**Bu, (eyni zamanda) iki imamın təyin edilməsinin qadağan olmasının ən aşkar dəlilidir və həmçinin çünki bu, nifaqa, müxalifətə, parçalanmaya, fitnələrin çıxmağına, nemətlərin aradan qalmağına götürür. Lakin Əndəlüs ilə Xorasanın halında olduğu kimi ölkələr bir-birindən uzaq olarsa, aralı olarsa bu icazəli olar və bunun izahı inşallah qarşıda gələcək.**"[98]

Bu rəyi İməmul-Harameyn əl-Cuveyni əşarilərin imamı Əbul-Həsən əl-Əşari'yə və digər böyük əşari alimi Əbu İshaq əl-İsfəraini'yə nisbət etmişdir. Yenə əşari şafi'i alimlərindən Abdulqahir bin Tahir əl-Bəğdədi (vəfatı hicri 429) bu rəyi doğru hesab etmişdir. O, "əl-Fərqu beynəl-Firaq" kitabında deyir:

"وَقَالُوا لَا تصلح الامامة الا لوَاحِد فى جَمِيع ارْض الاسلام الا أَن يكون بَين الصقعين حاجز من بَحر أَو عَدو لَا يُطَاق وَلم يقدر أهل كل وَاحِد من الصقعين على نُصْرَة اهل الصقع الآخر فَحِينَئِذٍ يجوز لأهل صقع عقد الامامَة لوَاحِد يصلح لَهَا مِنْهُم"

"**Dedilər ki, imamlıq İslam torpaqlarının hamısında yalnız bir nəfər üçün doğru ola bilər, lakin iki ölkə arasında dəniz və ya müqavimət göstərmək mümkün olmayan düşmən kimi bir maneə olması, iki ölkədən hər birinin əhlinin digər ölkənin əhlinə kömək etməyə qadir ola bilməməsi halı istisnadır; bu zaman (kənarda qalan) ölkənin əhlinə özlərindən imamlığa yararlı olan biri üçün imamlıq əqdini bağlamaqları icazəlidir.**"[99]

Son dönəm yəmənli alimlərdən Əmir əs-San'ani və Qadi Muhəmməd Əli əş-Şəvkəni və onu yoluna tabe olmuş Siddiq Həsən əl-Qannəvci də bu rəyi doğru sayıblar, hətta bundan başqa rəylərin şəriətə və əqlə müxalif olduğunu deyiblər. əş-Şəvkəni "əs-Seylul-Cərrar" kitabında qəti bir tərzdə bu rəyi müdafiə edir və deyir:

" وأما بعد انتشار الإسلام واتساع رقعته وتباعد أطرافه فمعلوم أنه قد صار في كل قطر أو أقطار الولاية إلى إمام أو سلطان وفي القطر الآخر أو الأقطار كذلك ولا ينفذ لبعضهم أمر ولا نهي في غير قطره وأقطاره التي رجعت إلى ولايته فلا بأس

[98]"Təfsir əl-Qurtubi", 1/273
[99]"əl-Fərqu beynəl-Firaq, səh: 341;

بتعدد الأئمة والسلاطين ويجب الطاعة لكل واحد منهم بعد البيعة له على أهل القطر الذي ينفذ فيه أوامره ونواهيه وكذلك صاحب القطر الآخر فإذا قام من ينازعه في القطر الذي قد ثبتت فيه ولايته وبايعه أهله كان الحكم فيه أن يقتل إذا لم يتب ولا تجب على أهل القطر الآخر طاعته ولا الدخول تحت ولايته لتباعد الأقطار فإنه قد لا يبلغ إلى ما تباعد منها خبر إمامها أو سلطانها ولا يدرى من قام منهم أو مات فالتكليف بالطاعة والحال هذه تكليف بما لا يطاق وهذا معلوم لكل من له اطلاع على أحوال العباد والبلاد فإن أهل الصين والهند لا يدرون بمن له الولاية في أرض المغرب فضلا عن أن يتمكنوا من طاعته وهكذا العكس وكذلك أهل ما وراء النهر لا يدرون بمن له الولاية في اليمين وهكذا العكس فاعرف هذا فإنه المناسب للقواعد الشرعية والمطابق لما تدل عليه الأدلة ودع عنك ما يقال في مخالفته فإن الفرق بين ما كانت عليه الولاية الإسلامية في أول الإسلام وما هي عليه الآن أوضح من شمس النهار ومن أنكر هذا فهو مباهت لا يستحق أن يخاطب بالحجة لأنه لا يعقلها."

**"Lakin İslam yayıldıqdan, torpaqları genişləndikdən və tərəfləri bir-birindən uzaqlaşdıqdan sonra məlumdur ki, hər bir ölkədə və ya ölkələrdə hakimiyyət bir imamın və ya sultanın əlinə keçmişdir, başqa ölkədə və ya ölkələrdə də hal belədir və onlardan heç birinin əmri və qadağası onun hakimiyyətinə tabe olan ölkədən və ya ölkələrdən başqasında keçərli deyildir, ona görə də imamların və sultanların çox olmasında bir problem yoxdur. Onlardan hər birinə beyət etdikdən sonra itaət etmək əmrlərinin və qadağalarının keçərli olduğu ölkənin əhalisi üzərinə vacibdir və başqa ölkənin sahibi də bunun kimidir. Hakimiyyətinin orada sabitləşdiyi və əhalisinin də beyət etdiyi ölkədə bir kimsə çıxıb onun hakimiyyətini ələ keçirməyə çalışarsa belə birinin hökmü tövbə etmədiyi təqdirdə öldürülməkdir. Başqa ölkənin əhalisinə ona itaət etmək və onun hakimiyyəti altına daxil olmaq vacib deyildir, çünki ölkələr bir-birindən uzaqdır, belə ki, uzaqda olan ölkəyə imamının və ya sultanının xəbəri çatmaya bilər və onlardan kimin hakimiyyətə gəldiyi və ya öldüyü bilinməz. Hal belə olduqda (onları) itaətlə mükəlləf qılmaq (onları) bacarmadıqları bir şeylə mükəlləf qılmaqdır və bu, insanların və ölkələrin halından xəbəri olan hər kəsə məlumdur. Belə ki, Çinin və Hindistanın əhalisinin Məğrib torpaqlarında hakimiyyətdə olana itaət etməklərinin mümkün olması bir kənara qalsın, heç orada hakimiyyətin kimə aid olduğunu belə bilmirlər. Bunun əksi də doğrudur. Eyni şəkildə Mavərənnəhr torpaqlarının əhalisi Yəməndə hakimiyyətin kimin əlində olduğunu bilmirlər və əksi də bunun kimidir. Bunu çox yaxşı anla, çünki bu, şəriətin qaydalarına münasibdir və dəlillərin dəlalət etdiyinə müvafiqdir. Bunun dəlillərə müxalif olması barədə deyilənlərə fikir vermə! Çünki İslamın əvvəlində islami hakimiyyətin halı ilə indiki halı arasındakı fərq gündüz**

> **vaxtı günəşdən də aydındır. Kim bunu inkar edərsə o, xurafatçıdır və onunla dəlillə danışmağa layiq deyildir, çünki dəlili anlamaz.**”[100]

əş-Şəvkəni’nin nümayiş etdirdiyi bu qətiyyət onun bu məsələdə reallığa əsaslanmasından irəli gəlir. Tarixən bunun belə olduğunu gözəl bildiyi üçün bunu inkar etməyin inadkarlıq olduğunu da gözəl anlayır. Müaviyədən sonra bu hal günümüzə qədər davam edir. Abdullah bin əz-Zubeyr Hicazda xəlifə olduğu zaman Yezid digər torpaqlarda xəlifə idi və Yeziddən sonra gələn əməvilərdə də bu hal təkrarlanıb. Əməvilərin Bağdaddakı süqutundan sonra məşriqdə xilafət abbasilərin əlində olduğu halda məğribdə əməvilər də xilafət qurmuşdular. Osmanlıların zamanında bu daha bariz görünürdü, çünki osmanlıların nüfuzu ümmətin bütöv coğrafiyasının yalnız məhdud bir hissəsinə yayılmışdı. Yəməndə osmanlı xilafəti etiraf edilmirdi, Hindistan və İndoneziya torpaqlarında isə tamamilə başqaları hakimiyyətdə idilər. İbn Kəsir bununla əlaqədar olaraq deyir:

> “وَحَكَى إِمَامُ الْحَرَمَيْنِ عَنِ الْأُسْتَاذ أَبِي إِسْحَاقَ أَنَّهُ جَوَّزَ نَصْبَ إِمَامَيْنِ فَأَكْثَرَ إِذَا تَبَاعَدَت الْأَقْطَارُ وَاتَّسَعَت الْأَقَالِيمُ بَيْنَهُمَا، وَتَرَدَّدَ إِمَامُ الْحَرَمَيْنِ فِي ذَلِكَ، قُلْتُ: وَهَذَا يُشْبِهُ حَالَ خُلَفَاءِ بَنِي الْعَبَّاسِ بِالْعِرَاقِ وَالْفَاطِمِيِّينَ بِمِصْر وَالْأُمَوِيِّينَ بِالْمَغْرِبِ.”

> “**İməmul-Harameyn isə Ustaz Əbu İshaq’dan hekayət etmişdir ki, o, ölkələr bir-birindən uzaqlaşdıqda və aralarındakı ərazilər genişləndikdə iki və daha çox imamın seçilməsinə icazə vermişdir. İməmul-Harameyn (özü) bu barədə tərəddüd etmişdir. Mən isə deyirəm: Bu, İraqda abbasilərin, Misirdə fatimilərin və Məğribdə əməvilərin halına bənzəyir.**”[101]

Düşünmək lazımdır ki, Əndəlüsdəki alimlər o torpaqların əmirinə itaəti vacib gördükləri kimi şərqdəki alimlər də Bağdaddakı xəlifəyə itaəti vacib görürdü. Bir tərəf digərinin beyətini batil saymırdı, çünki zərurətdən qaynaqlandığını qəbul edirdilər. Hətta bu görüş son dönəm malikilərdən məzhəbin mötəməd görüşü olaraq kitablarında qeyd edilir.[102] Qeyd edək ki, İbn Kəsir burada əl-Cuveyni’nin tərəddüd etdiyini demişdir. Lakin doğru olan budur ki, əl-Cuveyni özü də bunu icazəli saymış, lakin Əbul-Həsən əl-Əşari və Ustaz Əbu İshaq’dan fərqli olaraq seçilən imamları xəlifə hesab etməmişdir. O, belə deyir:

> “وَإِنْ لَمْ يَتَقَدَّمْ نَصْبُ إِمَامٍ كَمَا تَقَدَّمَ تَصْوِيرُهُ، وَلَكِنْ خَلَا الدَّهْرُ عَنْ إِمَامٍ فِي زَمَنِ فَتْرَةٍ، وَانْفَصَلَ شَطْرٌ مِنَ الْخِطَّةِ عَنْ شَطْرٍ، وَعَسُرَ نَصْبُ إِمَامٍ وَاحِدٍ، يَشْمَلُ رَأْيُهُ الْبِلَادَ وَالْعِبَادَ، فَنُصِبَ أَمِيرٌ فِي أَحَدِ الشَّطْرَيْنِ لِلضَّرُورَةِ فِي هَذِهِ الصُّورَةِ، وَنُصِبَ أَمِيرٌ فِي الْقُطْرِ الْآخَرِ مَنْصُوبٌ، وَلَمْ يَقَعِ الْعَقْدُ الْوَاحِدُ عَلَى حُكْمِ الْعُمُومِ، إِذَا كَانَ

---

100“əs-Seyl əl-Cərrar əl-Mutədəffiq alə Hədəiqil-Əzhər”, səh: 941;
101 “Təfsir İbn Kəsir”, 1/222;
102 Bax: “Haşiyətus-Savi aləş-Şərh əs-Sağir”, 4/190;

يَتَأَتَّى ذَلِكَ، فَالْحَقُّ الْمُتَّبَعُ فِي ذَلِكَ أَنَّ وَاحِدًا مِنْهُمَا لَيْسَ إِمَامًا، إِذِ الْإِمَامُ هُوَ الْوَاحِدُ الَّذِي بِهِ ارْتِبَاطُ الْمُسْلِمِينَ أَجْمَعِينَ.
وَلَسْتُ أُنْكِرُ تَجْوِيزَ نَصْبِهِمَا عَلَى حَسَبِ الْحَاجَةِ، وَنُفُوذَ أَمْرِهِمَا عَلَى مُوجَبِ الشَّرْعِ، وَلَكِنَّهُ زَمَانٌ خَالٍ عَنِ الْإِمَامِ... فَإِنِ اتَّفَقَ نَصْبُ إِمَامٍ، فَحَقٌّ عَلَى الْأَمِيرَيْنِ أَنْ يَسْتَسْلِمَا لَهُ لِيَحْكُمَ عَلَيْهِمَا بِمَا يَرَاهُ صَلَاحًا"

**"Əgər – daha əvvəl təsvir olunduğu kimi – daha öncədən bir imam seçilməyibsə, lakin fətrət zamanında bir imam yoxdursa, bölgələrin bir hissəsi digərindən ayrılarsa, rəyi ölkələrin və insanların hamısına şamil olacaq bir imamı seçmək çətin olarsa, ona görə də bu surətdəki zərurətə görə iki tərəfdən birində bir əmir seçilərsə və digər ölkədə də bir başqası əmir seçilərsə və bu əqdlərdən heç biri – (ümumi hökm) asanlaşacağı zaman - ümumi hökmdə olmazsa, o zaman bu məsələdə tabe olunacaq haqq görüş budur ki, onlardan heç biri imam deyildir, çünki imam müsəlmanların hamısının irtibatda olduğu tək bir nəfər ola bilər.**

**Mən onların ikisinin də ehtiyac çərçivəsində seçilməklərini və əmirlərinin şəriətin vacib etdiyi ölçüdə keçərli olmasını inkar etmirəm, lakin bu hal zamanın imamdan xali olduğu haldır... əgər (daha sonra bütün ümmət üçün) bir imam seçimi baş verərsə, o zaman hər iki əmirə onların üzərində doğru gördüyü ilə hökm etməsi üçün ona tabe olmaqları vacibdir.**"[103]

Beləliklə də əl-Cuveyni burada zərurət üçün eyni zamanda birdən çox əmirin olmasını icazəli görür, lakin onların heç biri üçün imamlıq əqdini bağlamağı caiz görmür, çünki əl-Cuveyni'yə görə imamlıq əqdi yalnız bütün müsəlmanların üzərində hökmü keçərli olan bir nəfər üçün bağlana bilər. Lakin hər bir ölkədə seçilən əmir praktikada böyük imamın vəzifələrini yetirmiş olacaq və ona itaət vacib olacaqdır.

Təbii ki, belə bir sual vermək olar ki, ayrı-ayrı ölkələrdə olan əmirlər, hakimlər olmaqla yanaşı ümmətin tək bir xəlifəsi ola bilməzmi?! Belə bir şey nəzəri olaraq mümkündür. Ümmət üçün bir xəlifə seçilir və bir-birindən uzaq ölkələrdə hakimiyyəti əlində tutan sultanlar tək bir xəlifə üçün naib rolunu oynamış olur və xəlifə ehtiyac gördükdə onları vəzifələrindən azad edə bilər və başqalarını onların yerinə təyin edə bilər. Birdən çox imamın olmasını alimlərin icazəli görməməklərinin ən əsas səbəbi də naib olaraq təyin etmək imkanının olmasıdır. Lakin müxtəlif səbəblərdən belə bir şey imkansız ola bilər, ya bunun nəticəsində fitnələrin çıxması belə bir şeyi imkansız edə bilər, yaxud da ümumiyyətlə seçilmiş xəlifənin başqaları tərəfindən o məqama layiq görülməməsi ola bilər.

[103] "əl-Ğiyəsi", səh: 176-178;

Müxtəlif səbəblərə görə bu naiblik variantı imkansız olarsa o zaman birdən çox imamın seçilməsi və öz ölkəsində itaət olunan hakim olması yeganə zəruri seçim olur. Bununla əlaqədar olaraq malikilərdə muharrir alimlərdən sayılan Əbul-Həsən Əli bin Əhməd əs-Saidi əl-Adəvi (1112-1189) haşiyəsində deyir:

“أَشْعَرَ فَرْضُ الْمُصَنِّف جَوَازَ تَعَدُّد الْقَاضِي بِمَنْعِ تَعَدُّدِ الْإِمَامِ الْأَعْظَمِ وَهُوَ كَذَلِكَ وَلَوْ تَنَاءَتْ الْأَقْطَارُ جِدًّا لِإِمْكَانِ النِّيَابَة وَقِيلَ إلَّا أَنْ لَا تُمْكِنَ النِّيَابَةُ وَاقْتَصَرَ عَلَيْهِ ابْنُ عَرَفَةَ وَنَحْوُهُ لِلْأُصُولِيِّينَ. (أَقُولُ) وَلَا يَنْبَغِي أَنْ يَكُونَ ذَلِكَ مَحَلَّ خِلَافٍ.”

“**Müəllifin (bir ölkədə) birdən çox qazinin olmasının icazəli olduğunu fərz etməsi ən böyük imam məqamının birdən çox olmasının qadağan olması mənasını verir və bu, hətta ölkələrdən bir-birilərindən çox uzaqda olsa da belədir, çünki naiblik vermək imkanı vardır. Deyilib ki, naiblik vermək imkanının olmaması halı istisnadır. İbn Arafə yalnız bu görüşü qeyd etməklə kifayətlənib və bunun bənzərini üsul alimləri deyirlər. Mən isə deyirəm: Bu, üzərində ixtilaf ediləcək bir məsələ olmamalıdır.**”[104]

əl-Adəvi bu sözlərində ən böyük imam vəzifəsinin birdən çox adamda olmasını müzakirə edir və qeyd edir ki, bu, icazəli deyildir, hətta ölkələr bir-birindən çox uzaqda olsa da bunu etmək icazəli deyildir, çünki bir ölkədə bütün ümmət üçün tək bir xəlifənin olması və uzaq ölkələrdəki hakimlərin isə bu xəlifənin naibləri olması mümkündür. Lakin daha sonra əl-Adəvi qeyd edir ki, məsələdəki ikinci görüş budur ki, naiblik imkanı yoxdursa o zaman birdən çox imamın olması icazəlidir və bu görüşü İbn Arafə'yə və ümumilikdə üsul alimlərinə nisbət etmişdir. Daha sonra əl-Adəvi bununla bağlı öz rəyini bildirərək qeyd edir ki, bu məsələ o qədər aşkar məsələdir ki, bunun tələbi o qədər zəruri məsləhətdir ki, bunun üzərində ixtilaf olmamalıdır. Daha əvvəl əş-Şəvkəni'dən təqdim etdiyimiz sözlər də bunu təsdiqləyir, çünki nəzəri olaraq naiblik mümkün olsa da praktikada bu, həddindən artıq çətindir. Bizim müasir zamanımızda da ümmətin üzərində tək bir xəlifənin seçilməsi imkansız bir haldır, çünki ümmət parçalanmış haldadır və sözü, hökmləri bütün ümmət üzərində keçərli olacaq bir xəlifənin seçilməsi real bir şey deyildir. Başında zərrə qədər ağlı və insafı olan hər kəs bunu anlayır və etiraf edir. Yalnız xurafat sahibləri bu reallığı gördükləri halda inkar edirlər. Ona görə də bu gün ən real olan müxtəlif müsəlman ölkələrində birdən çox islam dövlətinin qurulması və onların gələcəkdə bir bütöv xilafət üçün çalışmasıdır.

Ona görə də zərurət olduğu üçün bu yolu seçmək labüddür. Zərurət olduqda digər şərtlər qüvvədən düşdüyü kimi imamın tək olması şərti də düşür. Binaən aleyh bu zamanımızda xilafət elan etmək, bu xilafəti qəbul etməyənlərə qarşı vuruşmaq, bütün digər islami camaatları və əmirlikləri ləğv etmək, bu amal üçün

[104] “Şərh Muxtəsar Xalil”, əl-Xarraşi, 7/144;

günahsız müsəlmanların qanını axıtmaq, illərdir cihad üçün qurulmuş zəmini dağıtmaq, müsəlmanları parçalamaq, İslamın simasını bütün dünyada qaralamaq ən yumşaq sözlərlə vəsf etsək bir hikmətsizlikdir, real vəziyyətdən qafil olmaqdır və fiqhdən cahil olmaqdır. Məgər xilafətin məqsədləri haqqında doğru bir təsəvvürə sahib deyillərmi?!

## Xilafətin məqsədləri

Əgər şübhələndiyimiz kimi xilafətin məqsədləri haqqında doğru bir təsəvvür yoxdursa o zaman burada bununla bağlı bir neçə sətr yazmağımızda fayda olar. İlk öncə anlamaq lazımdır ki, xəlifəlik qayə deyildir, lakin bir vasitədir, şəriətimizin etibara aldığı bəzi ağır məsləhətlərə nail olmaq üçün labüd olan bir vasitədir. Ona görə də biz xilafətin hansı məqsədlər üçün vacib buyurulduğunu anlamalıyıq. Alləmə Fəxruddin ər-Razi deyir:

“...نصب الإمام يتضمن اندفاع ضرر لا يندفع إلا بنصبه ودفع الضرر عن النفس واجب بقدر الإمكان. وهذا يقتضي أنه يجب على العقلاء أن ينصبوا إماما لأنفسهم”

“**İmam seçmək (həm də) zərərdən qorunmağı – elə bir zərər ki, yalnız imamın seçilməsi ilə ondan qorunmaq olar - özünə daxil edir və candan zərəri dəf etmək imkan miqdarında vacibdir. Bu isə əql sahiblərinin özləri üçün bir imam seçməklərini tələb edir**”[105]

Bu, ər-Razi’nin xəlifəliyin vacibliyi üçün gətirdiyi xüsusi bir səbəbdir. Bir başqa yerdə isə bunu daha geniş bir məqsəd olaraq izah edir və deyir:

“ومعلوم أن المقصود من نصب الإمام إزالة الفتنة بقدر الإمكان...”

“**İmamı seçməkdəki məqsədin imkan daxilində fitnəni aradan qaldırmaq üçün olduğu məlum bir məsələdir...**”[106]

Bu sözlərlə mövzu haqqında yazmış elm əhlinin kitablarında tez-tez rastlaşmaq olur. Bu barədə ibarələri fərqlənsə də ümumilikdə məna üzərində ittifaq ediblər. Mövzu haqqında ən geniş yazmış alimlərdən olan Əbul-Məali əl-Cuveyni isə deyir:

---

[105]“əl-Ərba’in fi Usulid-Din”, 2/256;
[106]“əl-Ərba’in”, 2/269;

"فَإِنَّ مَقْصُودَ الْإِمَامَةِ الْقِيَامُ بِالْمُهِمَّاتِ وَالنُّهُوضُ بِحِفْظِ الْحَوْزَةِ، وَضَمُّ النَّشْرِ، وَحِفْظُ الْبِلَادِ الدَّانِيَةِ وَالنَّائِيَةِ بِالْعَيْنِ الْكَالِئَةِ، فَإِذَا تَحَقَّقَ عُسْرُ ذَلِكَ لَمْ يَكُنْ الِاتِّسَامُ بِنَبْزِ الْإِمَامِ مَعْنًى"

**"Belə ki, imamlıqdakı məqsəd vəzifələri yerinə yetirmək, səylə hövzəni qorumaq, parçalanmışları birləşdirmək, diqqətli nəzarət ilə yaxın və uzaq torpaqları qorumaqdır, beləliklə də əgər bunu etməy(in ona) çox çətin olduğu dəqiq bilinərsə o zaman "imam" ləqəbi ilə seçilməyin bir mənası olmaz.**"[107]

əl-Cuveyni – rahmətullahi aleyhi – burada açıq sözlərlə ifadə edir ki, imamlığın məqsədi onun üçün ayrılmış vəzifələri yerinə yetirməkdir, nəinki yaxın torpaqları, hətta uzaqlardakı müsəlman torpaqları da qorumaqdır, parçalanmış ümməti birləşdirməkdir. Hövzə ilə qəsd edilən İslamın hədləri və qadağalarıdır, yəni şəriətin hüdudunun çeynənilməsinə izn verməməlidir. Əgər bir kimsə bunları bacarmırsa o zaman onun "imam" adlanmasında heç bir məna yoxdur, onun olması ilə olmaması arasında bir fərq yoxdur. Hənəfi alimlərindən əl-Kəməl bin Əbi Şərif də birdən çox imamın olmasının qadağan olmasını əsaslandırarkən eyni həqiqəti təsdiqləyərək deyir:

"وَالْمعْنَى فِي امْتنَاع تعدد الإِمَام أَنه منَاف لمقصود الْإِمَامَة من اتِّحَاد كلمة أهل الْإِسْلَام واندفاع الْفِتَن"

**"İmamın birdən çox olmasının qadağan edilməsindəki səbəb onun İslam əhlinin sözünü bir araya gətirmək, fitnələri dəf etmək kimim imamətin məqsədlərinə zidd olmasına görədir.**"[108]

Beləliklə də müsəlmanların sıralarının parçalanmasına, fitnənin çıxmasına səbəb olacaq hər bir addım xilafətin, imamətin məqsədlərinə müxalifdir. Digər alim əl-Qadi əş-Şəvkəni buyurur:

"وعندي أن ملاك أمر الإمامة و السلطنة، وأعظم شروطها، وأجل أركانها ، أن يكون قادرا على تأمين السبل، و إنصاف المظلومين من الظالمين، ومتمكنا من الدفاع عن المسلمين إذا دهمهم أمر يخافونه كجيش كافر أو باغ فاجر، غير متهاون ولا مؤثر للدعة والسكون. فإذا كان السلطان بهذه المثابة فهو الإمام الذي أوجب الله طاعته وحرم مخالفته، بل هذا الأمر هو الذي شرع الله له نصب الأئمة والسلاطين، وجعل ذلك من أعظم مهمات الدين، ولا يضر الإمام نقص شيء واحد أو أكثر من شروط ذكروها مهما كان قائما بما ذكرناه. فليس للمسلمين حاجة في قاعد في مصلاه، ممسك سبحته، مؤثر لمطالعة الكتب العلمية، مدرس فيها لطلبة عصره، مصنف في مشكلاتها، متورع عن سفك الدماء والأموال، والمسلمون يأكل بعضهم بعضا ، ويظلم قويهم ضعيفهم ويضطهد شريفهم

[107] "əl-Ğiyəsi", səh: 99

[108] "əl-Musəmərə fi Şərhil-Musəyərə", səh: 170;

وضعيفهم، فإن الأمر إذا كان هكذا لم يحصل من الإمامة والسلطنة شيء لانعدام وجود الأهم الأعظم الذي شرعت له"

> "**Mənə görə imamət və səltənət işinin əsas ünsürü, ən əzəmətli şərti, ən böyük dayağı (imamın) yolların əmin-amanlığını təmin etməkdir, zalımlara qarşı məzlumların haqqını verməkdir, kafir ordu, fasiq bağilər kimi anidən üzləşilən təhlükədən müsəlmanları qorumağa mütəməkkin olmaqdır, səhlənkar olmamaqdır, hərəkətsizliyə, passivliyə üstünlük verməməkdir. Əgər sultan bu deyildiyi kimidirsə o zaman o, Allahın itaət etməyi vacib etdiyi, müxalifət etməyi isə haram etdiyi imamdır. Elə məhz bu iş üçün Allah imamları, sultanları seçməyi məşru qılmışdır və bunu dini vəzifələrin ən əzəmətlisi saymışdır. Bizim bu dediklərimizi yerinə yetirdiyi müddətdə İmamda zikr etdikləri şərtlərdən birinin və ya birdən çox şərtin olmaması zərər verməz. Müsəlmanların bir-birilərini yedikləri, güclülərinin zəiflərinə zülm etdiyi, şərəflilərinin zəiflərini alçaltdığı müddətdə namazgahında oturan, təsbehini əlindən düşürməyən, elmi kitabları mütaliə etməyə üstünlük verən, onlarda əsrinin tələbələrinə dərs keçən, onların müşkülləri barədə kitab yazan, qan axıtmaqdan, mallara toxunmaqdan ehtiyat edən birinə müsəlmanların ehtiyacı yoxdur, çünki hal belə olarsa imamlığın uğrunda məşru qılındığı ən əhəmiyyətli, ən əzəmətli məqsədlər olmadığı üçün imamət və səltənətdən heç bir şey hasil olmaz.**"[109]

Allah əş-Şəvkəni'yə və digər alimlərimizə rəhmət etsin! Onlar boş yerə havaya söz uçurmurdular, lakin deyilən hər sözün arxasındakı hikməti görməyə çalışırdılar. İşə yaramayan bir imamlıq, bir xilafət qurmağı heç zaman təsvib etməyiblər. Əgər bu alimlər xilafətin məqsədlərini həyata keçirməyən imamlığa rıza verməyiblərsə o zaman görəsən xilafətin məqsədlərinin əksini yerinə yetirən, yəni düşmənə qarşı mübarizə aparan müsəlman camaatlara, islami əmirliklərə qarşı vuruşaraq, onları içdən parçalayaraq onları düşmən qarşısında zəif düşürən bir "xəlifəliyə" necə razı ola bilərdilər?! Bunun üzərində bir daha düşün, əziz müsəlman oxucu! Çünki bu, məsələnin ən önəmli nöqtəsidir.

Bu dediklərimizin bəlkə də ən bariz nümunəsi İmam əl-Həsən bin Əli'nin – Allah ondan və atasından razı olsun! – atdığı addım olmuşdur. O, xəlifəlik vəzifəsindən özünü əzl etmişdi. Bunu isə məhz iki müsəlman tayfasının vuruşmaması üçün, müsəlman qanlarının axmaması üçün etmişdi. Lakin bilirik ki, əl-Həsən bunu etməklə nəbəvi xilafət erası bitmiş oldu və davamında mülk, başqa cür desək krallıq erası başladı. Əksər alimlərə görə nəbəvi xilafətin hökmü vacibdir, lakin bundan imtina etmək üçün önəmli bir səbəb var idi, çünki xilafətin məqsədlərindən biri müsəlmanların qanlarını, mallarını qorumaqdırsa o zaman müsəlmanların qanları bahasına xilafət qurmaq necə səhih ola bilər ki?! Şeyx Muhəmməd əl-Əmin əş-Şənqiti deyir:

---

[109] "İklilul-Kəramə fi Tibyən Məqasidil-İməmə", səh: 70-71

"وَلِذَا أَجْمَعَ جَمِيعُ الْمُسْلِمِينَ عَلَى الثَّنَاءِ عَلَى سِبْطِ رَسُولِ اللَّهِ - صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ - الْحَسَنِ بْنِ عَلِيٍّ - رَضِيَ اللَّهُ عَنْهُمَا - بِعَزْلِ نَفْسِهِ وَتَسْلِيمِهِ الْأَمْرَ إِلَى مُعَاوِيَةَ، بَعْدَ أَنْ بَايَعَهُ أَهْلُ الْعِرَاقِ ; حَقْنًا لِدِمَاءِ الْمُسْلِمِينَ"

"**Buna görə də bütün müsəlmanlar Allahın elçisinin – salləllahu aleyhi va səlləm – nəvəsi əl-Həsən bin Əli'ni – radiyallahu anhumə - tərifləmək barəsində icma ediblər, çünki İraq əhli ona beyət etdikdən sonra müsəlmanların qanını qorumaq məqsədi ilə özünü vəzifədən çıxarıb işi Müaviyəyə təslim etdi.**"[110]

Məlumdur ki, bu səbəb olmasaydı haqq xəlifənin özünün vəzifəsindən əsl etməsi haramdır, icazəli deyildir. Allahın elçisi də - salləllahu aleyhi va səlləm – nəvəsini bu əməlinə görə tərifləmiş, onun üçün dua etmişdir.

110 "Ədvaul-Bəyən", 1/32;

## Xəlifə bütün ümmət tərəfindən hiss olunmalıdır

Daha əvvəl qeyd etdiklərimizin üzərinə daha bir məsələ bina etmək lazımdır. Deyək ki, bizim bu zamanımızda və bu vəziyyətimizdə şərtlərə tam cavab verməyən qureyşli bir kəs İraqda və Suriyada bəzi şəhərləri güc yolu ilə ələ keçirib və həll və əqd əhli ilə məşvərət etmədən, onların beyətini almadan xilafət elan edib. Məgər bunu etmək xəlifəliyin qurulması üçün kifayət edirmi? Bu sualın bizim nəzərimizdə cavabı budur ki, kifayət etmir, çünki xəlifəlik kağız üzərində yazılan və sadəcə dillərdə səslənən bir şey deyildir. Xəlifə katoliklərin papası kimi insanların ruhaniyyətini idarə edən və ya bu barədə qərarlar qəbul edən bir institut deyildir. Xəlifə və xilafət insanların canlarını, mallarını, hüquqlarını idarə edən bir qurumdur. Ona görə də ümmətin üzərində və ya ən azından əksəriyyəti üzərində belə bir dövlət qurulmadığı müddətdə nəbəvi xilafət qurulmuş sayılmaz. İmamul-Harameyn əl-Cuveyni deyir:

“لَوْ سَقَطَتْ طَاعَةُ الْإِمَامِ فِينَا، وَرَثَّتْ شَوْكَتُهُ، وَوَهَنَتْ عُدَّتُهُ، وَوَهَتْ مُنَّتُهُ، وَنَفَرَتْ مِنْهُ الْقُلُوبُ، مِنْ غَيْرِ سَبَبٍ فِيهِ يَقْتَضِيهِ، وَكَانَ فِي ذَلِكَ عَلَى فِكْرٍ ثَاقِبٍ، وَرَأْيٍ صَائِبٍ، لَا يُؤْتَى فِي ذَلِكَ عَنْ خَلَلٍ فِي عَقْلٍ، أَوْ عَتَهٍ وَخَبَلٍ، أَوْ زَلَلٍ فِي قَوْلٍ أَوْ فِعْلٍ، أَوْ تَقَاعُدٍ عَنْ نَيْلٍ وَفَضْلٍ، وَلَكِنْ خَذَلَهُ الْأَنْصَارُ، وَلَمْ تُوَاتِهِ الْأَقْدَارُ، بَعْدَ تَقَدُّمِ الْعَهْدِ إِلَيْهِ، أَوْ صَحِيحِ الِاخْتِيَارِ، وَلَمْ نَجِدْ لِهَذِهِ الْحَالَةِ مُسْتَدْرَكًا، وَلَا فِي تَثْبِيتِ مَنْصِبِ الْإِمَامَةِ لَهُ مُسْتَمْسَكًا، وَقَدْ يَقَعُ مِثْلُ ذَلِكَ عَنْ مَلَلٍ أَنْتَجَهُ طُولُ مَهَلٍ، وَتَرَاخِي أَجَلٍ، فَإِذَا اتَّفَقَ ذَلِكَ، فَقَدْ حِيلَ بَيْنَ الْمُسْلِمِينَ وَبَيْنَ وَزَرٍ يَسْتَقِلُّ بِالْأَمْرِ، فَالْوَجْهُ نَصْبُ إِمَامٍ مُطَاعٍ، وَلَوْ بَذَلَ الْإِمَامُ الْمُحَقَّقُ أَقْصَى مَا يُسْتَطَاعُ. وَيَنْزِلُ هَذَا مَنْزِلَةَ مَا لَوْ أُسِرَ الْإِمَامُ، وَانْقَطَعَ نَظَرُهُ عَنِ الْأَنَامِ، وَأَهْلِ الْإِسْلَامِ، فَلَا يَصِلُ إِلَى مَظَانِّ الْحَاجَاتِ أَثَرُ رَأْيِ الْإِمَامِ، إِذَا لَمْ تَكُنْ يَدُهُ الطُّولَى، وَلَمْ تَنْبَسِطْ طَاعَتُهُ عَلَى خِطَّةِ الْإِسْلَامِ عَرْضًا وَطُولًا، وَلَمْ يَصِلْ إِلَى الْمَارِقِينَ صَوْلُهُ، وَلَمْ يَنْتَهِ إِلَى الْمُسْتَحِقِّينَ طَوْلُهُ، وَالْإِمَامُ لَا يُعْنَى لِعَيْنِهِ، وَلَا يَقْتَصِرُ انْقِطَاعُ نَظَرِهِ عَلَى مُوَافَاتِهِ حِينَ حَيْنِهِ.”

**“(İmama əvvəlki imam tərəfindən) əhd verildikdən sonra və ya səhih yolla seçildikdən sonra əgər ona aramızda artıq itaət olunmazsa, qüdrəti zəifləyərsə, gücü və hazırlıqları azalarsa, heç bir səbəb olmadan insanların qəlbləri ondan qaçarsa və bütün bunlarda (imamın) düşüncəsi dərin, rəyi sağlam olarsa, bunların**

> **heç biri (imamın) əqlində qüsurun olmasından və ya (qocalıq səbəbi ilə) kütbeyin və axmaq olmasından və ya sözündə və felində yol verdiyi xətalardan və ya nəaliyyət və fəzilət əldə etməyə əhəmiyyət verməməsindən qaynaqlanmazsa, lakin tərəfdarları onu köməksiz buraxarsa, taleh onun xeyrinə əyilməzsə, o zaman bu halı düzəldəcək bir yol olduğunu və imamlıq məqamının onun üçün sabit olması üçün tutunacaq bir şey olduğunu görmürük. Belə bir hal adətən möhlətin uzanması, əcəlin gecikdirilməsi səbəbi ilə doğan cansıxıcılıqdan baş verə bilir. Əgər belə bir şey baş verərsə o zaman müsəlmanlar ilə müstəqil şəkildə işini görə biləcək əmr sahibi arasında uçurum əmələ gəlmişdir, beləliklə də mövcud imam hətta əlindən gələn hər şeyi etsə belə burada doğru olan itaət olunan (başqa) bir imam təyin etməkdir. Belə bir hal imamın əsir düşməsi, müsəlmanlar və İslam əhlinin üzərindəki nəzarətinin aradan qalxması halı ilə eyni mərtəbədədir, belə ki, əgər imamın əli uzun olmazsa və ona eninə və uzununa doğru İslam ərazilərində itaət olunmursa, itaətsizlik göstərənlərə hakimiyyəti çatmırsa, (cəzaya) layiq olanlara qüdrəti çatmırsa o zaman ehtiyacların çox olduğu yerlərdə imamın rəyinin bir təsiri hiss olunmaz. İmam isə özlüyündə olmağına görə tələb olunmur və nəzarətinin kəsilməsi sadəcə həlak olaraq vəfat etməsi halı ilə məhdud deyildir.**”[111]

İmam əl-Cuveyni’nin burada zikr etdiyi vəsflər mövzunu anlamaq üçün çox önəmlidir. əl-Cuveyni rəiyyəti tərəfindən itaət olunmayan bir imamın imamlığının sabit olması üçün hər hansı bir əsasın olmadığını deyir. Burada diqqət edilməsi vacib olan məqam itaəti bütün ümmətə şamil etməsidir, yəni İslam ərazilərində eninə və uzununa doğru yaşayan ümmətin itaəti qəsd olunur. Hardasa bir neçə şəhərdə yaşayan müsəlmanların məcburi itaət etməsi ilə xəlifəyə ümmətin itaəti hasil olmur. Digər önəmli bir vəsf budur ki, imamın itaətinin olmamasından əlavə, onun hakimiyyəti əgər müxtəlif bölgələrdə yaşayan müsəlmanların üzərində keçərli deyilsə o zaman belə bir imamın mövcud olması ilə olmaması arasında bir fərq yoxdur. Ona görə də itaətdən məhrum olmuş bir imam əsir düşmüş imamla eyniləşdirilmişdir. əl-Cuveyni’dən nəql etdiyimiz sitatın ən son cümləsi də çox önəmlidir; üzərində vurğu etdiyi nöqtə budur ki, xəlifə məqamının vacibliyini yerinə yetirmək sadəcə bir xəlifə olsun deyə tələb olunmur, lakin onun yerinə yetirəcəyi vəzifələrə görə tələb olunur və əgər itaət olunmayan, nüfuzu və hakimiyyəti zəif olan bir xəlifə varsa onun imamlığının etibarsız sayılması üçün ölməsini gözləmək şərt deyildir.

Bu deyilənlər həm əqlin, həm də şəriətin tələb etdiyi nəticələrdir. Çünki əgər əksini söyləsək o zaman hətta bir şəhərdə belə hakimiyyəti güc yolu ilə ələ

[111] “əl-Ğiyasi”, səh: 116-117;

keçirmiş bir qureyşli'nin xəlifəliyinin və imamlığının səhih olduğunu, bunu etməklə ümmətin üzərindəki fərzi yerinə yetirmiş olduğunu qəbul etməliyik. Bu rəyin isə fasidliyi çox aşkardır. Bir anlığa belə bir halı fərz edin: İraqda bir qureyşli əlindəki silahlı dəstə ilə Mosul şəhərini ələ keçirir və xilafət elan edir, lakin bir neçə ildən sonra kafirlərin, rafizilərin ordularına məğlub olur və əsir alaraq öldürülür. Daha sonra uzaq məğrib ölkələrinin birində qureyşli birinin mövcud olduğunu və ona dəstək verən silahlı qrupların olduğunu fərz edək, əgər bu miqdarın fərzi ödədiyini desək o zaman həmin qureyşliyə şəhərlərdən birini və ya bir neçəsini tutub orada xilafət elan etməsinin vacib olduğunu söyləməliyik. Əgər o da məğlub olarsa ümmətin başqa yerində eyni imkanı olan başqa qureyşliyə də bunu vacib qılmalıyıq. Beləcə bu şəkildə bir-birinin ardınca üsyanları, fəsadları fərz qılmalıyıq, bu isə hikmətli şəriətimizin nəzərdə tutduğu məsləhətlərə müxalifdir. Əgər desələr ki, bir və ya iki şəhəri tutmaq kifayət etmir, o zaman deyəcəyik ki, eləcə də beş və ya on şəhəri də tutmaq kifayət etmir, çünki ümmət bu beş on şəhərdən ibarət deyildir. Görəsən bu miqdar ümmətin heç olmasa iki-üç faizini təşkil edirmi?!

Tarix səhifələrinə "xilafət" adı ilə düşmüş Osmanlı dövləti bu "xilafət" rolunu abbasilərdən hicri 923-cü ildə dövr aldı və hicri 1337-ci ilə qədər vücudunu sürdürdü. Osmanlı dövlətinin idarə etdiyi ərazilər ümmətin yayıldığı coğrafiyadan çox böyük bir hissəni əhatə edirdi. Bura Cənub-şərqi Avropadan başlayaraq Anadolu, Suriya, İraq, Hicaz, Misir, Şimali Afrikanın bir çox ölkələri daxil idilər. Bununla belə daha da böyük coğrafiyada Osmanlı dövləti xilafət kimi qəbul olunmurdu. Yəməndə, Əfqanıstanda, Hindistanda və daha bir çox yerdə alimdən başlayaraq əmirlərə qədər mötəbər kəslər bu xilafəti etiraf etməyiblər. Bu reallığı bizə misirli Rəşid Rida növbəti sətrlərdə çatdırır:

"فقد كَانَ السّلْطَان عبد الحميد يَدعي الْخلَافَة، وَلما لم يكن مستجمعاً لشروطها وَلَا قَائِما بواجباتها لم يكن مسلمو الأفغان واليمن ونجد وَالْمغْرب الْأَقْصَى يُؤمنُونَ بِصِحَّة خلَافَته، وَلَا يَعْتَقِدُونَ وجوب طَاعَته، فيجعلوا حكوماتهم تَابِعَة لدولته، بل لم يكن أَهل مصر الَّذين كَانُوا تَحت سيادته السياسية معترفين بخلافته، يقبلُونَ أَن يكون لَهُ عَلَيْهِم أمر وَلَا نهي، وَإِنَّمَا كَانَ اعترافهم أمرا صورياً معنوياً يتوكأون عَلَيْهِ فِي مقاومة السيطرة البريطانية عَلَيْهِم، كَمَا هُوَ شَأْنهمْ وشأن أمثالهم فِي الاعْتِرَاف بالخلافة الاسمية الحديثة فِي الآستانة على مَا بَيناهُ فِي موْضعه من هَذَا الْبَحْث،"

**"Sultan Abdulhəmid xilafət iddia edirdi, lakin (xəlifənin) şərtlərini özündə toplamadğı üçün və vaciblarını yerinə yetirmədiyi üçün Əfqanıstan, Yəmən, Nəcd və uzaq Məğribin müsəlmanları bu xəlifəliyin səhihliyinə inanmırdılar və ona itaət etməyin vacibliyinə etiqad etmirdilər ki, hökumətlərini onun (yəni Abdulhəmidin) dövlətinə tabe tutsunlar. Hətta onun siyasi hegemonluğu altında olan Misir əhli belə onun xəlifəliyini etiraf etmirdilər və onların üzərində onun bir əmrinin və qadağasının keçərliliyini qəbul etmirdilər. Onların etirafı sadəcə üzdə olan,**

> **mənəvi olan bir şey idi; ingilislərin hökmranlığına müqavimə göstərmək üçün ona etimad edirdilər, necə ki, bu bəhsimizdə öz yerində bəyan etdiyimiz kimi bu, onların və onların əmsallarının Astanadakı/İstanbuldakı müasir simvolik xilafəti etiraf etməkdəki tərzləridir.**”[112]

Osmanlıların nüfuzuna qarşı müqavimət göstərmiş ölkələrdən biri də Məğribdəki Sa’dilər dövləti idi. Sa’dilər nəsəb baxımından qureyşli idilər və peyğəmbərin – aleyhissalətu vassələm – nəsəbinə bağlı idilər. Sa’dilər dövlətinin böyük fəqihləri də osmanlı xilafətinin səhihliyini qəbul etmirdilər. Misirdəki hal barəsində Rəşid Rida’nın dediklərinə gəldikdə isə kimsə bununla razılaşmaya bilər, lakin Rəşid Rida özü misirlidir, ona görə də onunla bu məsələdə mübahisə etmək bizim şanımızdan deyildir, bu işi əhlinə tərk edirik. Sözün məğzi isə budur ki, Raşid Rida burada önəmli bir nöqtəyə toxunur və qeyd edir ki, şərtləri ödəməməkdən savayı xilafət vəzifələrini də yerinə yetirmək imkanından məhrum idi. Məgər osmanlılar Anadoluda, Şamda, İraqda təyin etdikləri valilər ilə tam bir siyasi, hərbi qüvvəyə sahib deyildilərmi? Məgər bu torpaqlarda himayə, əmin-amanlıq onların əlində deyildimi? Rəşid Rida bunu inkar etmir, amma ümmətin əksəriyyətini təşkil edən müsəlmanların ehtiyaclarını qarşılaya bilmirdi. Ona görə də daha əvvəl zikr etdiyimiz kimi Yəməndə əş-Şəvkəni, Hindistanda, Əfqanıstanda Siddiq Həsən kimi alimlər zamanın xəlifəsiz olduğunu deyirdilər. Rəşid Rida’nın sözlərini təsdiqləyən həqiqət ümmətin müasir tarixində yaşanmış və müşahidə edilmiş bir həqiqətdir. Burada qəsdimizin daha aydın olması üçün bunun nümunələrindən birini təqdim edirik. Məğribin müftilərindən olmuş Əbu İsa Sidi əl-Mehdi əl-Vazzəni’nin (vəfatı hicri 1342) topladığı fətvalardan birinin bizim mövzumuzla əlaqəsi vardır. əl-Vazzəni deyir:

> “قال الشيخ التسولي : لما افتتح الروم – دمرهم الله – ثغر الجزائر – أعادها الله دار الإسلام – في المحرم سنة ست وأربعين ومائتين وألف وغنموا سلطانها وبقي ذلك الجو بلا أمير يجمع كلمتهم فدخلهم الرعب واختلفت الكلمة وغلب الفساد فيهم فأتى رؤساؤهم وأهل الوجاهة منهم إلى أمير المؤمنين الآخذ لراية الكتاب والسنة باليمين ظلّ الأمن والأمان مولانا عبد الرحمن سائلين منه الدخول إلى في إيالته وإجراء الأحكام فيهم بكلمته وسطوته فاستشار – أيده الله – قاضي هذه الحضرة الإدريسية وقتئذ وعلماءه فأفتَوه بعدم قَبولهم لأن تلك إيالة أخرى وسلطانهم – وهو العثماني – سلطان اصطنبول لا زال قائما موجودا. ”

> “**Şeyx ət-Tusuli deyir: Rumlar – Allah onları dağıtsın! - əl-Cəzair cəbhəsini 1246-cı ilin muharram ayında ələ keçirdikdə - Allah oranı yenidən darul-islam etsin! – və sultanını əsir götürdükdə**

[112] “əl-Xiləfə”, səh: 114;

**həmin bölgə insanların sıralarını birləşdirəcək bir əmirsiz qaldı. Qəlblərinə qorxu düşdü və sıraları parçalandı və aralarında fəsad çoxaldı. Onların başçıları və böyükləri, Kitab və Sünnətin bayrağını götürməyi və əmin amanlığı qorumağı and içmiş möminlərin əmiri mövlamız Abdurrahmən'in yanına gəldilər; onun vilayətinə daxil olmağı, onun sözü və hökmranlığı ilə verdiyi hökmlərin onların arasında icra edilməsini ondan istədilər. O da – Allah onu gücləndirsin! – o idrisi şəhərin o zamankı qazisi və alimləri ilə istişarə etdi. Onlar da qəbul etməməsinə fətva verdilər, çünki ora başqa vilayət idi və sultanları – və o, İstanbuldakı osmanlı sultandır – hələ də mövcud idi.**"

Burada zikr olunan hadisə fransızların miladi tarix ilə 1830-cu ildə Əlcəzairi işğal etməkləridir. O zaman Əlcəzair bölgəsi Osmanlı vilayəti sayılırdı və oranın əmiri Osmanlı sultanına beyət etmişdi. Lakin bölgə başsız qaldıqdan sonra bu bölgədə fəsadın artması səbəbi ilə indiki Mərakeş ərazisindəki Ələvi dövlətinin sultanı Abdurrahmən bin Hişəmə nümayəndəlik gedir və ondan Əlcəzairi öz vilayətinə daxil etməsini və beyətlərini qəbul etməsini tələb edir. Lakin ələvi sultan alimlər ilə istişarə edir və o bölgədəkilərin boynunda osmanlı sultanına verilmiş beyət olduğu üçün bunu etməyin halal olmayacağına fətva verirlər.

"فلما رأي علماء ذلك الجو وأهل الوجاهات منهم ما أفتى به قاضي فاس وعلماؤها كتبوا للسلطان المذكور وهو يومئذ بفاس ما نصه:

لِيَعْلمْ سيدُنا قطب المجد ومَرْكَزُه ومحل الفخر ومَحْرَزُهُ السلطان الأعظم الأمجد الأفخم نجل الملوك العظام مولانا عبد الرحمان بن هشام أنّ فتوى ساداتنا علماء فاس مَبْنِيّةٌ على غير أساس لأنهم اعتقدوا أن في عنقنا للإمام العثماني بيعةً وذلك لو صح لكان علينا حجة وليس الأمر كذلك وإنما له مجرد الاسم هنالك وعامل الجزائر إنما كان متغلبا وبالدين متلاعبا فأهلكه الله بظلمه وتَطَاوُله على عباد الله وجَوْرِه وفِسْقِه إن الله يهمل على الظالم حتى يأخذه فإذا أخذه لم يُفلته. "

"**O bölgənin alimləri və böyükləri Fasın qazisinin və alimlərinin verdiyi fətvanı gördükdə adı keçən sultana məktub yazdılar və o, o gün Fas şəhərində idi:**

**"Ağamız, böyüklüyün qütbü və mərkəzi, fəxrin yeri və qoruğu, ən böyük sultan, ən böyük sultanların övladı, mövlamız Abdurrahmən bin Hişəm! Böyüklərimiz olan Fasın alimlərinin fətvası bir əsas üzərində qurulmayıb, çünki onlar bizim boynumuzda osmanlı imama bir beyətin olduğuna inanırlar. Əgər bu səhih olarsa bizim əleyhimizə hüccət olardı, lakin məsələ**

**heç də onların dediyi kimi deyildir. Onun sadəcə burada adı vardır, Əlcəzairdəki vali sadəcə mutəğallib biri olub, dini oyuncağa çevirmişdi və Allah da zülmünə, Allahın bəndələri üzərinə despotluq etməsinə və fasiqliyinə görə onu həlak etdi. Allah cəza verənə qədər zalıma möhlət verir və cəza verərsə ona qurtuluş yoxdur.”**

Beləliklə də buradan öyrənirsən ki, Əlcəzairin o dövrdəki alimləri təqrir edirlər və bəyan edirlər ki, Əlcəzairin Osmanlı xilafətinin bir hissəsi olması sadəcə rəmzi bir şey idi və osmanlının o torpaqlardakı valisi isə hakimiyyətə güc və zorbalıq ilə gəlmişdi. Həqiqətdə Osmanlı dövlətinin orada hakimiyyəti yox idi. Bunu növbəti sözləri ilə daha da aydın şəkildə təsdiqləyirlər:

“ويدل على تغلبه واستقلاله عدم وقوفه عند أمر العثماني وامتثاله بل لا يكترث به أصلا ولا يتبع له قولا ولا فعلا كيف وقد أمره أن يعقد مع النصارى صلحا فلم يقبل له قولا ولا نصحا وطلب منه بعض الأموال ليستعين بها على ما حلّ به مع النصارى من الأهوال فامتنع منها غاية الامتناع ولم يُمَكِّنه من شبر منها فضلا عن الباع حتى أخذها العدو الكافر وهذا جزاء كل فاسق فاجر مالٌ جُمع من حرام سَلَّط الله عليه الأعداء اللئام وهذا كله من هذا المتغلب متواتر مشاهد بالعيان مستغْنٍ عن إقامة الدليل والبرهان الناس كلهم عبيد الله وإماؤُهُ والسلطان واحد منهم ملَّكه الله أمرهم امتحانا وابتلاء فإن قام فيهم بالعدل والرحمة والإنصاف والصلاح مثل سيدنا نصره الله فهو خليفة الله في أرضه وظل الله على عبيده وله الدرجة عند الله تعالى وإن قام فيهم بالجَور والعُنف والطغيان والفساد مثلَ هذا المتغلب فهو متجاسر على الله تعالى في مملكته ومتسلط ومتكبر في الأرض بغير الحق ومتعرض لعقوبة الله الشديدة وسخطه. ”

**“Onun (ölkəni) güc yolu ilə idarə etməsinə və müstəqil davranmasına dəlalət edən onun osmanlı padişahının əmri ilə durmaması, ona boyun əyməməsidir, hətta ona əslən heç bir əhəmiyyət vermir və ona nə sözdə, nə də əməldə tabe olmurdu. Ona nəsranilər ilə sülh bağlamağı əmr etmişdi və onun nə bir sözünü, nə də nəsihətini qəbul etmədi. Nəsranilər ilə düşdüyü ağır vəziyyətdə dəstək görmək üçün ondan maddi kömək istəmişdi, o isə bundan tam şəkildə imtina etdi, ondan nəinki bir arşın, heç bir qarış belə vermədi, ta ki, sonunda kafir düşmən onu əsir aldı. Bu da hər fasiq facirin cəzasıdır, haramdan toplanmış malın üzərinə Allah alçaq düşmənləri musallat etdi. Bunlar hamısı bu mutəğallibdən gözlə müşahidə edilmiş mütəvatir xəbərlərdir, dəlil və burhan ilə isbat etməyə ehtiyac buraxmır.**

**İnsanların hamısı Allahın qullarıdır və sultan onlardan biridir; Allah onun üçün sınaq olsun deyə onların üzərinə əmir etmişdir; əgər ağamız (Abdurrahmən) kimi – Allah onu zəfər versin! - onların arasında ədalət, rəhmət, insaf və doğruluq ilə hökm verərsə o, Allahın yer üzündəki xəlifəsidir və qulları üzərində Allahın kölgəsidir və onun Allah qatında yüksək dərəcəsi vardır. Əgər bu mutəğallib kimi onların arasında zülmə, zorakılıq, tüğyan və fəsad ilə idarə edərsə o, hökm etdiyi dövlətdə Allaha qarşı həddini aşandır, haqsız yerə Yer üzündə despotluq edən və təkəbbürlənəndir, Allahın şiddətli cəzasına və qəzəbinə məruzdur.**”

Bu sözlər ilə əlcəzairli alimlər isbat edirlər ki, osmanlı xilafətinin o bölgələrdə sadəcə adı var idi. Diqqət etmək lazımdır ki, osmanlının Əlcəzairdəki valisi Hüseyn Dəy fransızlar tərəfindən götürülərək Neopala aparılana qədər orada tam müstəqil şəkildə hakimiyyət onun əlində idi. Adda Osmanlı sultanına beyət olan Hüseyn Dəy reallıqda öz sözünün ağası idi və alimlər buna nəzərən bunun keçərsiz bir beyət olduğuna inanırdılar. Nə üçün? Çünki osmanlıların hakimiyyəti o torpaqlarda hiss olunmurdu. əl-Vazzəni gətirdiyi fətvanın davamında yazır:

“هذا وعلى فرض تسليم أن في عنقنا للعثماني بيعة فلا تكون علينا حجة لأنه تباعد عنا قُطرَه فلم يُغن عنا شيئا مُلكُه لما بيننا وبينه من المفاوز والقفار والقرى والمدن والأمصار وربما قَرُب مَحَلُّه من جهة البحار لكن منعه الآن من ركوبه الكفار على أنه ثبت بتواتر الأخبار بالغ حد الكثرة والانتشار أنه مشتغل بنفسه ومَقَره عاجز عن الدفع عن إيالته القريبة من محله حتى إنه هادن النصارى خمس سنين على عدد كثير من المئينَ وأعطى فيه منهم ضامنا ليكون في المدة المذكورة على نفسه وحَشَمه آمنا فكيف يمكنه مع هذا الدفع عن قُطرنا وناحيتنا وبلدنا. وأدل دليل على بعده عن هذا المرام خبر مصر ونواحي الشام فقد استولى عليها أعداء الدين مدة تزيد على الخمس سنين فلم يَجُرّ لهم نفعا ولا ملك عنهم دفعا حتى استعان بالعدو الكافر والله تعالى قد يؤيد هذا الدين بالرجل الفاجر.

هذا وقد نص الأُبِّيّ في شرح مسلم مفصحا عن مثل قضيتنا ومعلما أن الإمام إذا لم ينفذ في ناحية لبعدها أمره جاز إقامة غيره فيها ونصره فانتظار نصرته يؤدي للهلاك ...”

“**Bunları bildikdən sonra hətta boynumuzda Osmanlı sultana bir beyətin olduğunu qəbul etdiyimiz fərz etsək belə bu, bizim əleyhimizə hüccət olmaz, çünki o, bizim ölkədən çox uzaqdadır və**

**onun sultanlığının bizim ehtiyacımızı qarşılamır, çünki aramızda böyük səhralıqlar, çöllüklər, kəndlər, şəhərlər, ölkələr vardır. Ola bilsin ki, dəniz tərəfdən onun torpaqları bizə yaxındır, lakin dəniz yolunu istifadə etməsinə indi kafirlər mane olublar. Üstəlik mütəvatir dərəcəsinə çatmış, yayğın və çox olan xəbərlərə görə o, özü ilə və öz torpaqları ilə məşğuldur və öz torpaqlarına yaxın olan vilayətləri müdafiə etməkdən acizdir. Hətta o, yüzlərlə məbləğ qarşılığında nəsranilər ilə beş il davam edəcək sülh bağlayıb və orada onlara təzminat ödəyib ki, bu müddətdə özü və ətrafındakıları əmin-amanlıqda olsun. Bütün bunlarla birlikdə onun bizim ölkəni, bizim tərəfləri müdafiə etməsi necə mümkün ola bilər? Onun bu məramdan uzaq olmasının ən aşkar dəlili Misir və Şamın ətraflarının xəbəridir; o torpaqları beş ildən uzun sürən bir müddətdə kafirlər istila etdilər və ta ki kafir düşmənin köməyindən istifadə edənə qədər onlara heç bir faydası toxunmadı, onları müdafiə edə bilmədi. Allah bəzən bu dinə facir bir kəsin vasitəsilə kömək verər.**

**Bunu bildikdən sonra bil ki, əl-Ubbi Muslimin şərhində bizim halımızın eynisi ilə bağlı danışıb və bildirib ki, əgər uzaq olduğu üçün imamın hansısa bölgədə əmri keçərli olmazsa başqa imamı orada seçmək və ona dəstək olmaz icazəlidir və o biri imamı gözləmək həlaka səbəb olar...**”[113]

Bu sözlər sənə bizim bu kitabda izah etdiyimiz ən önəmli məqamlardan birini praktikada canlandırır. Xilafət xəyali bir şey deyildir, xilafət hiss olunan, ümmətin üzərində himayədar kimi duran idarə sistemidir. Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sözləri bu həqiqəti ən bariz şəkildə ifadə edir:

“وَإِنَّمَا الإِمَامُ جُنَّةٌ يُقَاتَلُ مِنْ وَرَائِهِ وَيُتَّقَى بِهِ”

“**İmam yalnız bir qalxandır, onun arxasından vuruşulur və onunla müdafiə olunur.**”[114]

O zaman özünüzə sual verin! Suriyadakı və İraqdakı rejimlərə dişi bata bilməyən, Aynul-Arab şəhərini yüzlərlə müsəlman gəncə məzarlıq etməsinə baxmayaraq oranı kürd kommunistlərindən ala bilməyən biri necə ümmətin üzərində xəlifə ola bilər və bütün ümmətə ona beyət etmək necə vacib ola bilər?! Üstəlik bütün ümmətə tutduğu kiçik əraziyə hicrət etməyi necə vacib görə bilər?! Ümumiyyətlə belə bir şey əql ilə mümkündürmü?! Əlbəttə ki, ümmətin əgər əksəriyyətini müsəlman görməsən o zaman belə bir şey mümkün ola bilər.

[113] “ən-Nəvazil əl-Cədidə əl-Kubra”, 3/56-58;
[114] “Sahih əl-Buxari”, 2957; “Sahih Muslim”, 416, 1841

Sözümüzün canı nədir? Bu cür xilafət olmur. Nigeriyada, Sinayda, Əfqanıstanda kiçik silahlı dəstələr beyət etdiyi üçün xilafətin Nigeriya, Sinay və Xorasan adlı vilayətləri əmələ gəlmir. Belə bir şey xilafət deyildir, sözün əsl mənasında bir xurafatdır. Bunu yaxşı idrak etmək lazımdır, yoxsa dərin bir xətanın qurbanı olacaqsan.

## Qısa tarixçə

Burada artıq iddia olunan xilafət haqqında və bu xilafətin sələfi olan İraq İslam Dövləti adlı təşkilat haqqında danışmaq istəyirik. Düşünürəm ki, oxuculara bu təşkilatın qurulması və tarixçəsi haqqında qısa məlumat vermək önəmlidir. Çünki Əbul-Məhasin qardaş iddia olunan xilafətin məşruiyyətini gah güc və qüvvətin hasil olmasına bağlayır, gah da əslinin İraq İslam Dövləti olaraq səhih olmasına bağlayır. Bunun üçün bu "dövlətin" tarixçəsinə nəzər salmalıyıq.
Amerika Birləşmiş Ştatları 2003-cü ildə İraqı işğal etdikdə sünni mücahid qruplar formalaşdı və bu qruplar Amerikanın işğalçı qüvvələrinə qarşı qoymağa hədəf görürdülər. Qısa bir zaman içində Əbu Musab əz-Zərqavi adlı iordaniya əslli Əhməd Fadil ən-Nəzəl əl-Xaləylə belə bir mücahid qrupu qurur və qrup "Cəməatut-Təvhid val-Cihəd" adı ilə tanınmağa başlayır. 2004-cü ilin əvvəlində Əbu Musab İraqdakı cihad əməliyyatlarını genişləndirmək məqsədi ilə əl-Qaidəyə beyət etmək qərarına gəlir və o zamandan rəhbərlik etdiyi camaat "Qaidətul-Cihəd fi Bilədir-Rafideyn" adlanmağa başlayır. 2005-ci ilin oktyabr ayında isə bəzi digər qruplar ilə birlikdə "Məclisu Şura əl-Mucəhidin" adlı ittifaq qurulur və 2006-cı ilin əvvəlindən əz-Zərqavi bu yeri əsli iraqlı olan və o zaman Əbu Abdilləh ər-Raşid əl-Bağdadi adı altında tanınan Həmid Davud Muhəmməd Xalil əz-Zavi'yə verir. Daha sonra Həmid əz-Zavi qurulacaq İraq İslam Dövləti'nin əmiri elan ediləcək və Əbu Ömər əl-Bağdadi adi ilə tanınacaq.
2006-cı ilin oktyabr ayının 15-i bir neçə qrup birləşərək "Hilful-Mutayyəbin" adlanan bir toplantıda Şura məclisi ləğv olunur və yerinə İraq İslam Dövləti'nin qurulduğu elan edilir. 2010-cu il aprel ayının 19-u amerikalıların hücumu nəticəsində Əbu Ömər əl-Bağdadi və onun hərbi işlərinə nəzarət edən naibi, Əbu Həmzə əl-Muhacir adı ilə tanınan Abdulmunim İzzuddin Əli əl-Bədəvi öldürülür. Bundan sonra "İraq İslam Dövləti" adı ilə tanınan əmirliyin başına Əbu Bəkr əl-Bağdadi keçir.
Bu zaman Suriyada xalq dirənişi başladılır və ələvi bəsi hökumətə qarşı cihad bayrağı qaldırılır. Lakin İraq İslam Dövləti ilk öncə döyüşçülərinin Suriyaya keçməsini və orada iştirak etməsini qadağan edir. əl-Bağdadi'nin əsas məsləhətçisi sayılan Həci Bəkr ona bu məsləhəti verərkən bəzi əmirlərin əmirlikdən ayrılmaq riskini nəzərə almışdı. Lakin bəzi məlumatlara görə Həci Bəkrin, digər məlumatlara görə isə əz-Zavahiri'nin təklifi ilə[115] 2011-ci ilin axırlarında suriyalılardan ibarət bir qrup təşkil edilərək Suriyaya göndərilir və qrupun başına Əbu Muhəmməd əl-Cövləni əmir olaraq təyin edilir və 2012-ci ildə bu qrup rəsmi olaraq Suriyada özünü "Cəbhətun-Nusra" olaraq elan etdi. Qısa zamanda "Nusra" camaatı Suriyada məşhurlaşır və kənardan çox sayda cihad fikirli gənclərin axışdığı bir qibləyə çevrilir. Nusra cəbhəsi suriyalılar tərəfindən böyük təqdir qazanır və həmin dövrdə nə əl-Qaidə, nə də "İraq İslam Dövləti" ilə əlaqəli olduqlarını elan etmirlər. Suriyalılardan ibarət olan və

---

[115] Bax: Abdulbəri Atvan, "əd-Dəvlə əl-İsləmiyyə; əl-Cuzur, ət-Təvahhuş, əl-Mustəqbəl", Dar əs-Səqi, birinci nəşr, 2015, Beyrut

suriyalıların mübarizəsi üçün orada iştirak etdiklərini elan edən bir qrup olmaqları, əl-qaidə və İraqdakı “dövlət” ilə əlaqəli olmamaqları onların işlərini asanlaşdırırdı.
Lakin Nusra cəbhəsinin qısa müddətə çox yüksəlməsi və onun sıralarına qoşulanların İraq İslam Dövləti ilə bağlı olmaqlarından xəbərsiz olmaqları əlbəttə ki, həm Əbu Bəkr əl-Bağdadi'ni, həm də Həci Bəkri narahat edirdi. Buna görə də Həci Bəkrin nəsihəti ilə əl-Bağdadi Suriyadakı əl-Cövləni'yə xəbər göndərərək ona Nusra Cəbhəsinin İraqdakı “dövlətin” bir qolu olduğunu elan etməsini əmr edir. əl-Cövləni bunun üzərində düşünəcəyini söz verir, lakin üzərindən bir müddət keçməsinə rağmən ondan bir cavab gəlmir. əl-Bağdadi bu səfər ona töhmət verərək bir daha əmrini təzələyir. əl-Cövləni bu səfər də düşünəcəyini deyir və ətrafındakılar ilə məşvərət etdikdən sonra əl-Bağdadi'yə yazaraq fikrini bildirir. Ona görə əl-Bağdadi'nin tələbini yerinə yetirmək Suriyadakı dirənişin xeyrinə olmayacaqdı. Belə bir cavab əl-Bağdadi'ni və Həci Bəkri qəzəbləndirir. Üstəlik bu ərəfədə Birləşmiş Ştatlar “Nusra” cəbhəsini terrorist təşkilatlar siyahısına daxil edir və əl-Cövləni'ni axtarışa verir. Bu onu Suriyada ən çox axtarılan kəs halına gətirir. Bütün bunlar əl-Bağdadi və Həci Bəkrdə ciddi narahatçılığa səbəb olurdu və Nusra cəbhəsinin əldən çıxmasını istəmirdilər. Doktor Huzeyfə Azzam'ın verdiyi məlumatlara görə bundan sonra Nusra cəbhəsini özünə birləşdirmək üçün Həci Bəkrin tövsiyəsi ilə əl-Bağdadi bəzi addımlar atdı. Bu addımlar əl-Cövləni'yə bəzi əmirlər verməkdən ibarət idi. Verilən əmirlər arasında İraqda “ceyşul-mucəhidin” qrupunun əmiri Doktor Əbu Said əl-İraqi'ni qətl etmək, Azad Suriya Ordusuna qarşı hücumlar başlatmaq və Türkiyə'nin daxilində partlayışlar törətmək var idi. Lakin “Nusra” cəbhəsinin əmiri bu əmirləri rədd etdi. Belə bir rədd artıq əl-Cövləni'nin itaətdən çıxdığını göstərirdi və əl-Bağdadi bundan sonra Nusra cəhbəsinin əmirini iki seçim arasında tərk etdi: ya əmirlərə itaət etməli, ya da Nusra cəbhəsi ləğv edilərək başqa bir qrup qurulmalı idi. əl-Cövləni'nin cavabı gəlmədi. Bundan sonra onunla şəxsən görüşmək üçün yanına elçi göndərildi və əl-Cövləni təhlükəsizliklə bağlı rahatsızlıqları əsas gətirərək görüşdən imtina etdi. Bundan sonra iraqlı əmirlər Suriyaya göndərilərək Nusra cəbhəsində vuruşan digər əmirlərlə görüşlər təşkil edildi və bu görüşləri nəticəsi olaraq Nusra Cəbhəsinin daxilində parçalanmalar başladı. Bu əsnada Nusra cəbhəsinin rəhbərliyi fitnə çıxarmaq və təkfirdə aşırılıq ittihamları ilə bəzi üzvlərini həbs etdi və onların arasında Əbu Ratəc əs-Susi və Əbu Ömər əl-Abbədi ləqəbli iki tunisli, Əbu Damdam əl-Həsəni və Əbul-Həccəc ən-Nəvari adlı iki məğribli və Əbu Bəkr Ömər əl-Qahtani adlı səudiyyəli mühacirlər var idi. Əbu Bəkr əl-Qahtani daha sonra Nusra cəbhəsindən ayrılaraq əl-Bağdadi'nin “dövlətində” şəri əmir vəzifəsi alacaqdı.
Bu mərhələdən sonra əl-Bağdadi'nin özünün şəxsən Suriya torpaqlarına gəlməsi məsləhətçiləri tərəfindən nəsihət edildi. Nusra cəbhəsinin əmirləri ilə görüşlərdə mücahidlərin sıralarının birləşdirilməsi üçün Nusra cəbhəsinin ləğv edilməsinin, yalnız bir adla yeni bir dövlətin qurulmasının zəruriliyi üzərində vurğu edilirdi. Bu barədə əl-Cövləni'nin özünə də xəbər göndərilsə də əl-Cövləni yenə görüşdən imtina edirdi. əl-Cövləni'dən tələb olunan Nusra cəbhəsinin ləğv edilməsi və “İraqda və Şamda İslam Dövləti” (İŞİD) adı altında daha böyük bir dövlətin qurulması idi. Lakin əl-Cövləni bununla razılaşmırdı və bunun yalnız suriya xalqının iştirakı ilə nəzərdə tutulan cihada böyük zərərinin olacağını söyləyirdi. Bu arada Həci Bəkr əl-Bağdadi'yə Nusra cəbhəsini ləğv etməsini bəyan etməyi, lakin bəyanda əl-Cövləni'ni əzl edildiyinin zikr olunmamasını məsləhət görür.

Onun fikrini dəyişəcəyinə ümid olunurdu. Beləliklə də 2013-cü ilin aprel ayının 9-u əl-Bağdadi Nusra cəbhəsinin ləğv edildiyini və İŞİD-in qurulduğunu elan etdi. Bu elandan sonra Nusra cəbhəsi üç hissəyə ayrıldı; bir hissəsi əl-Bağdadiyə qoşuldu, digər hissəsi Nusra cəbhəsində qaldı və üçüncü hissə müstəqil camaat halına gəldi. Bundan sonra bıçaq sümüyə dirəndi və əl-Cövləni özünü məcburiyyət qarşısında hiss edərək Nusra cəbhəsinin əl-Qaidə'yə beyətli olduğunu elan etdi. Konflikt daha da şiddətləndi. Bu müddətdə əl-Cövləni'yə qarşı sui-qəsd təşkil olunsa da hədəfi öldürməkdə uğur əldə etmədi, lakin maşının altına yerləşdirilmiş partlayıcı qurğu vasitəsinin işə düşməsi nəticəsində Nusra rəhbərliyinin iki müavini, Əbu Həfs ən-Nəcdi ləqəbli Ömər əl-Muhisni və Əbu Ömər əl-Cəzravi ləqəbli Abdulaziz əl-Usmən öldürüldü.
Bundan sonra əl-Cövləni məsələyə müdaxilə etməsi üçün əz-Zavahiri'yə xitab etdi. Bu zaman əz-Zavahiri aradakı konflikti həll etmək üçün Yəməndən və Səudiyyə'dən bəzi şəxsləri dəvət etdi. Məhz bu ərəfədə Şam torpaqlarında Abdullah Muhəmməd əl-Muhisni, Əbu Xalid əs-Suri və Əbu Süleyman əl-Muhacir kimi mücahidlər tərəfindən tanınan şəxsiyyətlər aradakı konflikti həll etməyə səy göstərirdilər. Lakin bu səylər heç bir fayda vermirdi. Lakin konfliktin həlli üçün hər iki tərəf məsələni beyət etdikləri və özlərinə əmir hesab etdikləri əz-Zavahiri'yə götürməyə razılaşdılar. Əbu Süleyman əl-Muhəcir şahidlik edir ki, əl-Bağdadi və onun şəriləri ilə görüşdükdə əz-Zavahiri'yə həqiqi beyətinin olduğunu təsdiq etmişdi, lakin konflikti həll etmək üçün Şam ərazisində müstəqil şəriət məhkəməsinin qurulmasına razı olmamışdı.
Əymən əz-Zavahiri'nin qərarı özünü gecikdirmədi və qərar Nusra cəbhə'sinin Şam torpaqlarında qalmasını, İŞİD-in ləğv edilərək İraqa qayıtmasını və yenidən İraq İslam Dövləti olaraq fəaliyyətinə davam etməsini nəzərdə tuturdu. Lakin məsələni əz-Zavahiri'yə götürməyə razılaşan əl-Bağdadi qərarın onun xeyrinə olmadığını gördükdə qərar ilə razılaşmadı və tamamilə qərarı rədd etdi. Bu mərhələdən sonra artıq əl-Bağdadi'nin camaatı rəsmi bəyanlarında və çıxışlarında əz-Zavahiri'ni yolunu azmaqda, "tağuta təkfir" minhəcini tərk etməkdə ittiham etməyə başladılar. Bu mərhələdən sonra ümumiyyətlə əz-Zavahiri'yə beyətli olduqlarını inkar etməyə başladılar. Bundan sonra 2013-cü ildə İŞİD Şam torpaqlarında artıq heç kimə hesabat vermədən addımlar atmağa başladı.
Buna baxmayaraq birdən çox elm əhli aradakı konflikti həll etmək üçün müstəqil şəriət məhkəməsinin qurulmasına çağırırdı. Şeyx Yusuf əl-Əhməd bu barədə bir neçə bəyan yayınladı. Abdullah əl-Muhisni "Mubədəratul-Ummə" adı altında sahədəki bütün camaatlara xəbər göndərərək vuruşan tərəflərin arasındakı konflikti həll etmək üçün şəriət məhkəməsinin qurulmasına çağırdı. Ən fasiq camaatlar belə bu təkliflə razılaşdıqları halda əl-Bağdadi'nin camaatı Allahın şəriəti ilə mühakimə olunmaq üçün Quranda və sünnətdə olmayan şərtlər irəli sürdü. Abdullah əl-Muhisni şahidlik etdiyi məqamlardan birində hətta arada hökm vermək üçün Şeyx Süleyman əl-Ulvan'ı təklif etdiyini, lakin əl-Bağdadi'nin müavini əl-Ənbəri'nin onun uzaqda olmasını səbəb gətirərək bu təklifi rədd etdiyini zikr edir. Bundan sonra yəmənli şeyx ər-Rubeyş tərəfindən məhkəmə üçün bir komitə'nin gətirilməsini təklif etdiyini, hətta bunun da rədd edildiyini xəbər verir.
Suriyadan çıxmaq qərarına tabe olmadıqdan sonra gələn aylarda əl-Bağdadi'nin camaatı ilə digər müxalif qruplar arasında silahlı toqquşmalar başladı və bu döyüşlər nəticəsində minlərlə müsəlman həlak oldu. əl-Cövləni'nin əl-Cəzira

kanalında yayınlanan proqramda verdiyi müsahibəsində onların sıralarından 700-dən çox müsəlmanın əl-Bağdadi'nin camaatı tərəfindən öldürüldüyünü bildirib.
əl-Bağdadi'nin təşkilatı 2014-cü ilin yazında İraqda ani və gözlənilməyən nəaliyyətlər əldə etdilər və həmin ilin iyun ayının 29-unda "xilafət" qurduqlarını elan etdilər.

## İraq “İslam Dövləti” başqasına beyətli idi

Bu təşkilat və ya əmirlik haqqında qısa bir tarixçə təqdim etdikdən sonra bu tarixçədə qeyd edilən və mövzumuzla bağlı olan ən önəmli nöqtələrdən birinə toxunmaq istəyirik. Bu isə İraqda 2006-cı ildə qurulmuş əmirliyin həqiqətdə əl-Qaidə’yə beyət etməsi ilə bağlıdır. 2014-cü ilin əvvəllərinə qədər cihad sahəsində fəal olan və xəbərlər ilə maraqlanan hər kəs bunu belə bilirdi. Lakin 2014-cü ildən başlayaraq əl-Qaidə’yə boyun əyməkdən imtina edən bu təşkilat belə bir beyətin olduğunu inkar etməyə başladılar. Lakin fakt çox sırtıq və inadkar bir şeydir, onu nə qədər də inkar etsən də yaxandan əl çəkməz. Biz burada bu təşkilatın həqiqətdə qurulandan əl-Qaidə camaatına beyətli olduğunun danılmaz sübutlarını qeyd edəcəyik.
İlk öncə Əymən əz-Zavahiri’nin iki qrup arasında, yəni əl-Bağdadi’nin camaatı ilə əl-Cövləni’nin camaatı arasında hökm verməsi ilə bağlı səs yazısına baxaq. Görürük ki, əz-Zavahiri özünü hər ikisinin də əmiri hesab edir. Ona görə də çıxışının əvvəlində deyir:

> “أ – أخطأ الشيخ أبو بكر البغدادي الحسيني بإعلانه دولة العراق والشام الإسلامية دون أن يستأمرنا أو يستشيرنا بل ودون اخطارنا”
>
> “**a) əş-Şeyx Əbu Bəkr əl-Bəğdədi əl-Huseyni bizdən əmr almadan və ya istişarə etmədən, hətta bizi xəbərdar etmədən “İraq və Şamda İslam Dövlətini” elan etməkdə xəta etmişdir...**”[116]

əz-Zavahiri qeyd edir ki, əl-Bağdadi bu addımı atarkən onlardan əmr almamışdı. Əgər əz-Zavahiri özünü əl-Bağdadi’nin əmiri hiss etmirdisə nə üçün bu halda əl-Bağdadinin ondan əmr almadan və ya onunla istişarə etmədən belə addım atmasını xəta adlandırır?! Görəsən nə üçün əz-Zavahiri özünün əmir olduğuna inanırdı? Bunun çox sadə bir izahı vardır, çünki əl-Bağdadi həqiqətən də əz-Zavahiri’yə eşidib itaət etməyə dair beyət etmişdi. əz-Zavahiri bunun dəlillərini ayrılıqda bir səs yazısında bir-bir oxumuşdur və biz o səs yazısında əl-Bağdadi tərəfindən ona yazılmış məktublardan bəzi hissələri burada qeyd edirik:

> “الدولة الإسلامية في العراق فرعٌ تابعٌ لجماعةِ قاعدةِ الجهادِ وأودُ هنا أن أبينَ بعض التفاصيلِ: لما قامت دولة العراق الإسلامية دون أن تستأمر فيها قيادة جماعة قاعدة الجهاد وعلى رأسها الإمام المجدد الشيخ أسامة بن لادن رحمه الله بل ولم تستشر ولا حتى أخطرت بها أرسل الشيخ الشهيد كما نحسبه أبو حمزة المهاجر رحمه الله رسالة للقيادة العامة يبرر فيها إنشاء الدولة ويؤكد فيها على

[116] https://www.youtube.com/watch?v=A182rGoC_GE; 0:25 – 0:37

ولاء الدولة لجماعة قاعدة الجهاد وأن الإخوة في الشورى قد أخذوا العهد على الشيخ الشهيد كما نحسبه أبي عمر البغدادي بأن أميره هو الشيخ أسامة بن لادن رحمه الله وأن الدولة تابعة لجماعة قاعدة الجهاد ولكن رأوا أن يُعلموا الأخوة بذلك ولا ينشروه لبعض الاعتبارات السياسية التي رأوها في العراق حينئذ .”

**“İraq İslam Dövləti Cihad Qaidəsi camaatına tabe olan bir qoldur və burada bəzi təfsilatları bəyan etmək istəyirəm:**
**Cihad Qaidəsi camaatının rəhbərliyinin və başında mücəddid imam Şeyx Usəmə bin Laden'in – rahiməhullah - əmrini almadan, hətta istişarə etmədən, nə də hətta xəbərdar etmədən İraq İslam Dövləti qurulduqda şəhid hesab etdiyimiz Şeyx Əbu Həmzə əl-Muhəcir – rahiməhullah – ümumi rəhbərliyə məktub yazaraq orada dövlət qurmağın doğruluğunun səbəblərini izah edir və orada dövlətin Cihad Qaidəsi camaatına bağlılığını təkid edir və (qeyd edir ki,) şuradakı qardaşlar şəhid hesab etdiyimiz Şeyx Əbu Ömər əl-Bağdadi'dən əhd alıblar ki, onun əmiri Şeyx Usəmə bin Laden – rahiməhullah – olacaq və dövlət Cihad Qaidəsi camaatına tabe olacaq, lakin bunu qardaşlara bildirməyi və o zaman İraqda nəzərə aldıqları bəzi siyasi etibarlara görə bunu elan etməməyi doğru görüblər.”**[117]

Bu sözlərdən anlaşılan budur ki, ilk dəfə İraqda dövlət elan edildikdə Əbu Ömər əl-Bağdadi əslində Usamə bin Laden'ə beyətli idi. Əbu Ömər vəfat etdikdə əl-Qaidənin məsullarından Atiyyə İraqdakı dövlə rəhbərlərinə məktub yazaraq onlara müvəqqəti rəhbərlik seçməyi və namizədlər siyahısını onlara göndərməyi təklif edirlər. Lakin bu məktub çatmadan öncə artıq 2010-cu ildə Əbu Bəkr əl-Bağdadi yeni lider olaraq seçilmişdi. Bütün bu məlumatları əl-Qaidə rəhbərliyi ilə İraq İslam Dövləti rəhbərliyi arasındakı məktublaşmalardan öyrənirik. Bunun xəbəri əl-Qaidə rəhbərliyinə çatdıqda Usamə bin Laden Atiyyə'yə məktub yazaraq Əbu Bəkr əl-Bağdadi'nin kim olması haqqında və rəhbərlikdə digərləri haqqında məlumatların təqdim edilməsini tələb edir. Bu məktubdan da anlaşılır ki, əl-Qaidə rəhbərliyinin bu şəxslər haqqında məlumatları yox idi. 2010-cu ildə İraq İslam Dövlətinin cavab olaraq göndərdiyi məktubda əl-Qaidə rəhbərliyinə verdikləri xəbərlər arasında bunu da qeyd edirlər:

“نحيطكم علما مشايخنا وولاة أمرنا الكرام أن دولتكم الإسلامية في بلاد الرافدين بخير ومتماسكة ... أجمع الأخوة هنا وفي مقدمتهم الشيخ أبو بكر حفظه الله ومجلس الشورى على أنه لا مانع من أن تكون هذه الإمارة مؤقتة وأن إرسال أي شخص من قِبل المشايخ عندكم إن رأوا أن ذلك من تمام تحقيق المصلحة ليتسلم الإمارة فلا مانع لدينا وسيكون الجميع هنا جنوداً له عليهم واجب السمع

[117] https://archive.org/details/shahada-sham; 02:12 – 03:21

والطاعة وهذا الالتزام مجمع عليه من مجلس الشورى والشيخ أبو بكر البغدادي حفظهم الله "

"**Şeyxlərimiz, əmr sahiblərimiz, sizi məlumatlandırırıq ki, sizin Raifeyn torpaqlarındakı İslam Dövlətiniz xeyir içindədir və kontrola sahibdir...Burada qardaşlar, hamısından da əvvəl Şeyx Əbu Bəkr – hafizəhullah – və şura məclisi icma ediblər ki, bu əmirliyin müvəqqəti olmasına mane olan bir şey yoxdur və əgər bunun məsləhətin tamamlanması olaraq görərlərsə əmirliyin başına keçmək üçün şeyxlər istənilən bir kəsi göndərərlərsə bizə görə buna bir maneə yoxdur, beləliklə də hamı burada onun əsgərləri olacaq, onu dinləyin itaət etmək onlara vacib olacaq. Buna tabe olmaq vədi üzərində Şura Məclisi və Şeyx Əbu Bəkr əl-Bağdadi – hafizəhumullah – icma edib.**"[118]

Bir il sonra 2011-ci ildə Usamə bin Ladenin öldürülməsi xəbəri yayıldıqdan sonra Dövlətin əlaqələr üzrə məsuli əl-Qaidə'dədə vəzifəli Atiyyəyə məktub yazaraq Əbu Bəkr əl-Bağdadi'nin suallarını çatdırır. Məktubda deyilir:

"وهو يسأل عن المناسب من وجهة نظركم عند إعلان الأمير الجديد للتنظيم عندكم هل تجدد الدولة بيعته علناً أم تكون سراً كما هو معلوم معمول به سابقاً"

"**... və o (yəni əl-Bağdadi) sizin oradakı təşkilat üçün yeni əmirin elan edilməsi zamanı sizin baxış açınızdan münasib olanın nə olduğunu soruşur: dövlət beyətini aşkar olaraq yeniləsin yoxsa daha öncə əməl edildiyi kimi bunu gizlincə etsin?**"[119]

Beləliklə də Əbu Bəkr əl-Bağdadi Usamə öldükdən sonra əz-Zavahiri'yə beyət edib və əl-Qaidə'nin rəhbərliyinin İraq İslam Dövlətinin əsl əmirləri olduğunu təsdiqləyib və onlara itaətin vacibliyini qəbul edib. Bunu təsdiqləyən tərəf budur ki, "Nusra Cəbhəsi" ilə "Dövlət camaatı" arasında ixtilaf zühur etdikdə məsələni əz-Zavahiri'yə götürdülər və Əbu Bəkr əl-Bağdadi'nin bu münasibətlə Əymən əz-Zavahiri'yə yazdığı məktubda ona bu şəkildə müraciət edir: "**Əmirimiz, fəzilətli şeyx ....ə...**" Eyni ərəfədə Əbu Muhəmməd əl-Adnani də Xorasandakı rəhbərliyə yazdığı məktubunda əz-Zavahirinin və əl-Bağdadi'nin onun əmirləri olduğunu etiraf edir. Bütün bu məktubları əz-Zavahiri səsli yazısında oxuyur.

Bu məktublarda dövlətin əl-Qaidə'yə beyətli olmağının sübutu aşkar şəkildə görünür. Şahidi olduq ki, Əbu Bəkr əl-Bağdadi dövlətin əmiri seçildikdə məqsəd bunun müvəqqəti olması idi və əl-Qaidə'dən təsdiq gözləyirdilər, hətta əl-

[118]Eyni səs yazısı: 08:12 – 09:40
[119]Eyni səs yazısı: 11:10 – 11:30

Qaidə’nin öz namizədini göndərməsinə də razılaşmışdılar. Həmçinin əl-Qaidənin rəhbərliyi təşkilata yeni əmir seçdikdə İraq İslam Dövləti beyətini təzələmişdi. Bəs görəsən İraq İslam Dövləti bütün bu məktubları onların göndərdiyini qəbul edir, yoxsa inkar edir? Cavab budur ki, qəbul edir. Lakin qəbul etməklə yanaşı məktublarda yazdıqları aşkar sözləri sadəcə “təvazökarlıq” və “güzəşt” olaraq yozurlar, bunu əz-Zavahiri’yə hörmət olaraq izah edirlər. Bu barədə İraq İslam Dövlətinin rəsmi danışmanı Əbu Muhəmməd əl-Adnani’nin şahidliyi kifayət edir. O, əz-Zavahiri’nin bu səsli çıxışından sonra səsli bir müraciət yaymış və o müraciətində bu sözləri demişdir:

“إنّ كل ما ذكرتَ من شهادتك صحيح، بل وأزيدُكَ عليه أننا كنّا ولحينٍ قريب نُجيبُ مَن يسألنا عن علاقة الدولة بالقاعدة بأنّ علاقتها علاقة الجنديّ بأميره، ولكنّ هذه الجنديّة يا دكتور لجعل كلمة الجهاد العالميّ واحدة، ولم تكُن نافذةً داخل الدولة، كما أنّها غير مُلزمةٍ لها، فإنّما هي تنازلٌ وتواضعٌ وتشريفٌ وتكريمٌ لكُم مِنّا...”

**“Şübhəsiz ki, şahidliyində zikr etdiklərinin hamısı səhihdir, hətta mən sənin üstünə əlavə edirəm ki, biz bu yaxın vaxtlara qədər bizdən Dövlətin əl-Qaidə ilə əlaqəsi barədə soruşanlara belə cavab verirdik ki, əlaqəsi əsgərin əmiri ilə əlaqəsi kimidir. Lakin bu əsgərlik, ay Doktor, dünya cihadının sözünü bir etməkdən ötrü idi və dövlətin daxilində keçərli deyildi, eləcə də dövlət üçün itaət edilməsi vacib deyildi. Bu sadəcə güzəşt, təvazö idi, bizim tərəfimizdən sizə qarşı təşrif və hörmət idi...”**[120]

Necə deyərlər; etiraf sübutların anasıdır. əl-Adnani bu oxunulan məktubların doğru olduğunu təsdiqləyir, lakin onların sadəcə hörmət və təşrif məqsədi ilə edildiyini deyir. Buradan belə çıxır ki, Dövlətin əmirləri məktub göndərərək əl-Qaidə rəhbərliyinə beyətlərini təzələdikdə bunu sadəcə təvazökarlıq olaraq ediblər, əl-Qaidə rəhbərliyinə təşrif olaraq ediblər. Bu məqamda biz çox çətin bir vəziyyətə düşürük və düşünürük ki, bu, necə də qəribə bir dövlətdir. Əgər bu dövlət həqiqətən də bölgədə hegemon olsa o zaman mütləq çap edəcəkləri fiqh kitablarına yeni bir beyət növü də daxil etməli olacaqlar: “hörmət və təşrif beyəti”. Əslində bu yozmalar və təvillər ağıl və insaf sahibləri yanında heç bir dəyərə malik deyildir, lakin İraq İslam Dövlətinin rəhbərliyinin düşdüyü gülünc vəziyyəti göstərir. Üstəlik Dövlətin həqiqətən də əl-Qaidə’yə beyətli olduğuna bu camaatın öz üzvləri də şahidlik ediblər və bu şahidlikləri özləri də inkar edə bilmirlər, çünki öz üzvlərini yalançı çıxarmaq istəməzlər.
Bu yöndə ilk etiraf dövlətin üzvü olmuş və cihad sahəsində sevilən, hörməti saxlanan Abdulaziz əl-Qatari’dən gələcək. O bir video yazıda buna şahidlik edərək deyir:

**“Baş vermiş hadisə, əziz qardaşım, əmirlər arasındadır. Təfsilatına girmirik. Lakin iş belədir ki, mən həm Şeyx əl-Cövləni’nin, həm də**

[120] https://archive.org/details/kalimah_201405; 13:20 – 13:52;

> **Şeyx əl-Bağdadi'nin hər ikisinin də dediyinə şahid oldum: "Biz Şeyx Əymən əz-Zavahiri'dən – hafizəhullah – (cavab) gözləyirik: əgər əmr gəlsə ki, "ey Şeyx əl-Bağdadi, daha əvvəl olduğun İraq İslam Dövlətinə qayıt" deyəcək: "eşitdik, itaət etdik, mən və ordularım dediyin kimi geri qayıdırıq..."**[121]

Əgər əz-Zavahiri həqiqətən də əl-Bağdadi'nin əmiri deyilsə necə əmr edə bilər?! Dövlətin bir başqa üzvü Əbu Bəkr əl-Qahtani səsli yazıda deyir:

> "**... biz iki mərhələ yaşayırıq; Şeyx Əymən əz-Zavahiri'nin xitabından öncəki mərhələ və Şeyx Əymən əz-Zavahiri'nin xitabından sonrakı mərtəbə; Şeyx Əymən əz-Zavahiri'nin xitabından sonra hamının ona tabe olması lazımdır və kim tabe olmazsa asidir... Şeyx Əymən əz-Zavahiri desə ki, "ey Cövləni, cəbhə ismində qal"...hamımız tabeyik...**"[122]

Bir başqa səs yazısında Əbu Bəkr əl-Qahtani deyir:

> "**Əgər Şeyx Əymən əz-Zavahiri'nin ayırıcı əmri gələrsə Əbu Bəkr əl-Bağdadinin bu halda dediyi sözlər bu oldu: "Allaha and içirəm ki, dövlətə hər kim beyət edibsə Şeyx Əymən əz-Zavahiri'nin əmrinin tələbi ilə beyətindən azaddır.**"[123]

Əbu Bəkr əl-Qahtani özü bu sözləri ilə etiraf edir ki, əgər əz-Zavahiri'dən gələn əmr dövlətin Şam torpaqlarından çıxmasını tələb edərsə o zaman əl-Bağdadi Şamda ona beyət edən hər kəsin beyətindən azad olacağını söyləyib. Bu da onu göstərir ki, əz-Zavahiri'nin əmir olduğu qəbul olunurdu. Lakin əz-Zavahiri xitabında əl-Bağdadi'nin xeyrinə qərar vermədikdə əl-Bağdadi əlaqələri kəsdi və vədinə əməl etmədi.
Həmçinin dövlətin bir başqa üzvü Əbu Ənəs əl-İraqi səsli yazıda əz-Zavahiri'nin əl-Bağdadi'nin əmiri olduğunu öz dili ilə etiraf edir.[124]
Bu bizi bir başqa həqiqət qarşısında qoyur. İraq İslam Dövləti qurulduqda İraqda bu işin altına imza atmış kəslər qurulacaq dövlətin əl-Qaidəyə tabe olacağını nəzərə alaraq ediblər, başqa sözlə beyət edənlər əslində Usamə bin Ladenə beyət ediblər və dövlətin əmiri əslində Usamə bin Ladenə tabe bir əsgər sayılmalı idi.
Bütün bunları dedikdən sonra məqalənin sahibi Əbul-Məhasin qardaşın dediyi sözlərə qayıdaq. Məqalə sahibi İraq İslam Dövlətinin əsasının qoyulması haqqında və bunun nəticəsi haqqında danışaraq deyir:

> "**Bununla da şura yığışaraq gələcək İslam Xilafətinin özülü olaraq İraq İslam Dövlətini elan edir və onun əmiri olaraq Əbu Ömər əl-Bağdadini – rahiməhullah – Dövlətin başçısı seçirlər. Şeyx Əbu Ömər əl-Bağdadi şəhid ediləndən sonra isə İslam Dövlətinin şurası Əbu Bəkr əl-Bağdadini – hafizahullah - Dövlətin əmiri seçir...**

[121] https://www.youtube.com/watch?v=35aFG8t8zQo;
[122] https://www.youtube.com/watch?v=ekxO2k-McRE;
[123] https://www.youtube.com/watch?v=37oa3mE1Q3I;
[124] https://www.youtube.com/watch?v=2H2Ilu9jyng;

> **Bəlli olur ki, İraq İslam Dövləti İraqda olan həll və əqd əhlinin cumhuru ilə təsis edilmiş və qurulmuşdur. Bunu isə yalnız gözü kor və qəlbi xəstə adam inkar edə bilər!... Qeyd etdik ki, İraq İslam Dövləti səhih təməl üzərə qurulub. Sonradan ondan şaxələnən şeylər isə səhih təməldən şaxələndiyinə görə, şəriətə müxalif olmayacağı təqdirdə özü də səhih olur. İslam dövlətinin mövcud olmadığı bir ərəfədə, şövkət və qüdrət sahiblərindən ibarət olan İraq və Şam Dövlətinin şurasının yığışıb məşvərətdən sonra müsəlmanları öz ətrafında birləşdirəcək İslam Dövlətini elan etmələri (istəyirsən onu xilafət, istəyirsənsə İslam dövləti adlandır fərq etməz) şər`i qaydalara əsasən səhihdir və doğrudur.**"

Yuxarıda yazdıqlarımızdan sonra məqalənin sahibinin dediklərinin nə qədər absurd olduğunu görmək olar, çünki bizə aydın oldu ki, İraqda edilən beyətdə iştirak edən ən böyük camaat əl-Qaidə'yə bağlı olduğu üçün seçiləcək əmirin əl-Qaidə rəhbərliyinə beyət edəcəyini şərt görmüşdülər. Beləliklə də burada səhih olan budur ki, əl-Bağdadi öz əmirinə asi olmuşdur və əz-Zavahiri həqiqi əmir kimi İraq və Şam Dövlətini ləğv etmişdi. Ona görə də xilafətin səhihliyini bu təmələ bağlamaq əsassızdır.

Belə bir sual vermək olar ki, əgər həqiqətən də elədirsə o zaman nə üçün bu "dövlət" qurulduqdan sonrakı dövrdə əl-Qaidə İraqda heç bir əl-qaidə qolunun olmadığını elan etmişdir. Bu sualın cavabı hər nə olursa olsun əsla bu təşkilatın əl-Qaidə'yə beyətli olduğunu inkar edə bilməz, çünki yuxarıda təqdim etdiyimiz faktlar danılmazdır. Lakin sualın cavabı olaraq deyə bilərik ki, əl-Qaidə'ni tanıyan adamlar çox gözəl bilirlər ki, son illər ərzində siyasətlərində dəyişiklik baş vermişdir. Bu dəyişikliklərdən biri də əl-Qaidə adının gizlədilməsi və elan edilməməsidir. Eyni düşüncə ilə ümumiyyətlə Suriyada belə bir elanın verilməsini doğru görmürdülər və məhz bu səbəbdən əz-Zavahiri onunla heç bir məşvərət etmədən əl-Cövləni'nin əl-Qaidə'yə beyətli olduğunu elan etməsini qınamışdı. Bu, təbii ki, bir ehtimaldır. İkinci bir ehtimal isə İraqda iki ayrı camaatın olduğunun görünməməsi məsləhəti idi, yəni "İraq İslam Dövləti"nin sərbəst bir birlik olduğunu və məsləhət üçün hamının İraqda onların çətiri altında birləşməsini istəmiş ola bilərlər. Amma gizlində bu təşkilatın əl-Qaidə'yə beyətli olması bir fakt olaraq qalır. Üçüncüsü isə bu sualın ən doğru cavabını əz-Zavahiri verə bilər, ancaq beyətli olmaqlarını inkar etmək aşkar faktları inkar etməkdir.

## əl-Bağdadi xəlifə olmağa yarayırmı?

Məlumdur ki, 2014-cü ildə bu təşkilat öz əmirlərini bütün ümmətin üzərində "xəlifə" təyin etdikdə ümmət belə bir təyinatı tərəddüdsüz rədd etdi. Belə bir təyinatı nə müsəlman cəmiyyətlərində tanınmış və ictimai-siyasi fəaliyyətlə məşğul olan həll və əqd əhli, nə də cihad işinə illərini sərf etmiş təcrübəli şəxsiyyətlər qəbul etmədilər. Əlbəttə ki, bunun bir səbəbi olmalıdır. Müsəlmanlar şübhə etmirlər ki, bu şəxsiyyətlər sözsüz ki, ümmətin üzərində İslam Xilafətinin qurulmasını istəyirlər, çünki bunun ümmət üzərində fərzu-kifayə olduğunu gözəl bilirlər. Lakin əl-Bağdadi və onun camaatını bu vəzifəni yerinə yetirəcək camaat olaraq görmürdülər. Biz aşağıda bunun səbəblərini izah etməyə çalışacağıq.

**Birinci səbəb**:

Bu camaat cihad sahəsində kifayət qədər müsəlman qanı tökmüş bir camaat olaraq tanınır və əlbəttə ki, bütün bunların məsuliyyətini bir başa əmirləri daşıyır. Təkcə Şam ərazisində bu camaatın törətdikləri cinayətlər ağıl almaz dərəcədə çox və sərhədsizdir. Onlardan bəzilərinə misal verməklə kifayətlənəcəyik.
2013-cü ilin sonlarında əl-Bağdadi camaatı Əhraruş-Şam camaatının əmirlərindən sayılan təbib Əbu Rayyən Hüseyn əs-Süleymanı əsir götürür, daha sonra 2013-cü ildən 2014-cü ilə keçid ərəfəsində tərəflər arasında əsir mübadiləsi həyata keçirildikdə Əbu Rayyən'in ölü cəsədi verilir. Lakin ölü cəsədin üzərində əzab və işgəncə əlamətləri var idi.
Həmin ərəfədə Əhraruş-Şam'dan Əbu Abdilləh əl-Hələbi ləqəbli Muhəmməd Faris yaralı olduğu halda əl-Bağdadi camaatı tərəfindən başı kəsilmişdir.
2014-cü ilin may ayında "tank snayperi" ləqəbi ilə tanınmış Əhraruş-Şam döyüşçüsü Əbul-Miqdəmi əsir götürərək başını kəsirlər, daha sonra başını qoparıb belinin üstünə qoyurlar.
2014-cü ilin aprel ayında Şeyx Muhəmməd əl-Eys'in cəsədi tapılır və məlumdur ki, Muhəmməd daha əvvəl əl-Bağdadi camaatının sıralarına qoşulmuş, onlar tərəfindən qazi təyin olunmuş, daha sonra isə onlardan ayrılaraq cümə xütbəsində onların cinayətləri, aşırılıqları haqqında danışmışdı.
Əbu Sad əl-Hədrami daha əvvəl Nusra cəbhəsinin əmirlərindən idi, sonra əl-Bağdadi'nin camaatı Şama daxil olduqda onlara qoşulur və Raqqa şəhərində əmir təyin olunur. əz-Zavahiri'nin qərarı gəldikdə yenidən Nusra cəbhəsinə qayıtmağa qərar verir və bu qərarının üzərindən çox keçmir ki, yox çıxır. Üzərindən bir müddət keçdikdən sonra edam olunduğu öyrənilir.
Əbu Xalid əs-Suri Hələbdə Əhraruş-Şam'ın bazalarından birinə təşkil olunmuş hücum nəticəsində öldürülür.
Hims şəhərində Nusra cəbhəsinin şərisi olan Əbu Süleyman əl-Xalidi'ni, Şamın xatiblər birliyinin üzvü olan Şeyx Muhəmməd Əmin ən-Nəccərı, hənəfi şeyxi Cələl Bəyərli və daha bir çox önəmli şəxsiyyəti qətl etməklə kifayətlənməmişlər,

bir çox əmirə qarşı sui-qəsdlər hazırlamışlar, həbsxanalarında yerli əhalidən çox sayda insana əzab vermişlər, ölümlərinə səbəb olmuşlar.
Dəfələrlə müxalif qruplara qarşı partlayıcı maddələrlə təchiz edilmiş maşınlar, başqa cür desək sui-qəsd, intihar maşınları göndəriblər, bu cür törədilmiş partlayışlar nəticəsində məsum müsəlmanlar da həlak olmuşdur. Bütün bunlar yaxşı sənədləşdirilmişdir.
Ramadi şəhərində yaşayan Əlbunimr əşirəti vaxtında "İraq İslam Dövlətinə" qarşı "sahavat" dirənişində iştirak etdikləri üçün 2014-cü ilin oktyabr ayında kütləvi qətlə məruz qaldılar. Ramadi şəhərinin kontrolunu ələ keçirmiş əl-Bağdadi camaatı şəhərin içində bu əşirətdən olan əllidən çox və ya əlliyə yaxın kişini edam etdi. Şəhərin kənarında daha sonra kütləvi məzarlıq tapıldı. Eləcə də Suriyada Deyruzzur bölgəsində əl-Bağdadi camaatına qarşı müqavimət göstərmiş əş-Şueytat qəbiləsi də şiddətli şəkildə cəzalandırıldılar və yüzlərlə fərdi edam edildi, kütləvi sayda sürgünə məruz qaldılar.
Cinayətləri təkcə Şam və İraq torpaqları ilə məhdudlaşmadı, hətta Əfqanıstanda, Yəməndə və Liviyada da müsəlman qanı axıtdılar. Əfqanıstanda talibana dəstək verən qəbilə üzvlərini – aralarında yaşlı nəslin nümayəndələri olmasına baxmayaraq – partlayıcı maddələr üzərinə oturdub onları çox fəci şəkildə öldürdülər.
Suriyada neft mənbələrini ələ keçirmək uğrunda Nusra Cəbhəsinin azad etdiyi neftlə zəngin bölgələri hiylə və zorakılıq ilə ələ keçirmək xatirinə onlarla müsəlmanı qətl etmək və həlak olmaqlarına səbəb olmaqları da yaxın tariximizin bir hissəsidir.

**İkinci səbəb**:

Zikr edə biləcəyimiz ikinci səbəb əl-Bağdadi'nin idarə etdiyi camaatın təkfirdə həddini aşmasıdır və xaricilik vəsflərini özlərində toplamaqlarıdır. Bu camaat nəinki küfr dərəcəsinə çatmamış böyük günahlara görə, hətta mübah olan əməllərə görə də təkfir edirlər.
Əbu Sad əl-Hadrami'ni öldürdükdə onun mürtəd olduğuna dair – gec olsa da – bir bəyan yaydılar. Mürtəd olması üçün gətirdikləri ən ağır ittiham onun casusluq etməsi idi. Halbuki casusluq dörd məzhəbin heç birinə görə küfr deyildir. Həmçinin Əfqanıstanda talibana kömək etdiyinə görə öldürülən qəbilə üzvləri də mürtəd olaraq öldürüldülər, halbuki talibana kömək etməyin nə zamandan küfr olduğunu izah etməkdə çətinlik çəkdilər. Ola bilsin ki, onların nəzərində ümumiyyətlə qurduqları "dövlətə" qarşı vuruşmaq küfrdür. Əslində bunu rəsmi danışmanları əl-Adnani "ya qaumənə, əcibu daiyəllah" adlı səsli xitabında etiraf edərək deyir:

"نعم، إنك تكفر بذلك، فاحذرْ، فإنك بقتال الدولة الإسلامية تقعُ بالكفر من حيث تدري أو لا تدري"

**"Bəli, sən bununla küfr etmiş olursan, bundan çəkin! Belə ki, İslam Dövlətinə qarşı vuruşmaqla bildiyin və ya bilmədiyin halda küfrə düşmüş olursan."**

əl-Adnani'nin bu sözlərini daha sonra camaatın rəsmi jurnalı sayılan Dabiq jurnalı da təsdiqlədi və buradakı küfr ilə "millətdən çıxaran küfrün" qəsd olunduğunu etiraf etdi.[125]
Həmçinin keçən ilin ramazan ayında buraxılmış Dabiq jurnalının onuncu nömrəsində Ummu Sumeyyə əl-Muhəcira ləqəbli bir qadının yazdığı məqalə nəşr olunub. Məqalədə Ummu Sumeyyə "sahavat" adlandırdığı qruplarda vuruşan kəslərin zövcələrinə xitab edir. Məqalədə "sahavat" adı ilə kimləri qəsd etdiyini açıq şəkildə söyləməsə də Azad Suriya Ordusunun döyüşçülərinin şəkli ilə Nusra cəbhəsinin döyüşçülərinin şəkli yerləşdirilib. Ummu Sumeyyə məqalədə Sahavat döyüşçülərinin küfr əhli olduqlarını və mürtəd olduqlarını bəyan edir və onların zövcələrinə onlarla evliliklərinin batil olmasına dair hökm verir. Bununla kifayətlənmir və onunla evliliyinin əslində zina olduğuna hökm verir və bununla da kifayətlənmir; bütün qadınlara və kişilərə "İslam Dövlətinin" torpaqlarına hicrət etməyin fərzu ayn olduğunu ifadə edir.
əl-Bağdadi camaatının hələ 2014-cü ildən İslam Cəbhəsi və onun daxilindəki qrupları təkfir etməsi və bu barədə bir bəyan yayması isə çoxumuza məlum olan bir xəbərdir.

**Üçüncü səbəb**:

Zikr edilə biləcək daha bir səbəb isə əl-Bağdadi'nin və onun camaatının əhdə vəfa göstərməməkləri, vədlərinə müxalif davranmaqları ola bilər. Belə ki, əl-Bağdadi yuxarıda sübut etdiyimiz kimi beyət etmişdi, daha sonra bu beyəti rədd etdi. Üstəlik əl-Cövləni ilə arasında əz-Zavahirinin hökm verməsinə razılaşmışdı, lakin hökm onun leyhinə olmadıqda vədinə xilaf çıxdı. Burada əz-Zavahiri'nin bir əmir kimi, yoxsa bir qazi kimi hökm verməsi arasında mahiyyət etibarı ilə bir fərq yoxdur. Hər iki halda da hökmə boyun əyəcəyini vəd etdikdən sonra bunu rədd etməsi onun siqa və etibarlı biri olmadığının göstəricisidir.
Halbuki İraqda dəstək toplamasının ən böyük səbəbi əl-Qaidə'yə tabeçilik göstərməsi və əl-Qaidə tərəfindən dəstək görməsi idi. Bütün bunlar sadəcə onu göstərir ki, bu camaat əl-Qaidə'dən istifadə etdikdən sonra onlara arxa çevirdilər.

**Dördüncü səbəb**:

əl-Bağdadi'nin şəxsiyyətini xəlifə olmağa yararsız edən bir başqa səbəb isə onun müstəqil şəriət məhkəmələrində Allahın hökmü ilə mühakimə olunmaqdan qaçmasıdır. Müsəlman qanlarının axmasının qarşısını almaq üçün bir neçə yöndən müstəqil şəriət məhkəmələrinin qurulması çağırışları səsləndi, çünki müştərək məhkəmələr məsələni həll etmədi. Ona görə də Yusuf əl-Əhməd, Abdullah əl-Muhisni, Əbu Muhəmməd əl-Maqdisi və daha bir çox zat müstəqil məhkəmələrin qurulması üçün səy göstərdilər və bütün qrupların razılaşmasına baxmayaraq hər dəfə əl-Bağdadi camaatı bu təşəbbüsün qarşısını aldı, hər dəfə müstəqil üçüncü tərəfin qaziliyi ilə Allahın hökmü ilə hökm olunmaq üçün batil şərtlər irəli sürüldü. Halbuki ona vacib olan müstəqil məhkəməyə razılaşmaq idi və əgər müstəqil məhkəmə qərəzli və ədalətsiz davransaydı o zaman məhkəmənin çıxardığı qərarı rədd edə bilərdi. Lakin bir müsəlmanı axılan qan

[125] http://justpaste.it/mc7r

məsələlərində Allahın hökmü ilə mühakimə olunmağa çağırdıqda tərəddüdsüz buna razı olmalıdır.

**Beşinci səbəb**:

Hikmətsizlik və xilafətin məqsədlərinə zidd siyasət aparmaq da səbəblərdən biridir. Bunun bəlkə də ən bariz nümunəsi dünyada İslamı qaralamaq cəhdləridir. Xilafətin ən əsas muhimmətlərindən, vəzifələrindən biri müsəlmanların canlarını və mallarını qorumaqdır. Lakin biz tamamilə bunun əksini müşahidə edirik.
2014-cü ilin avqust ayında əl-Bağdadi camaatı kasetlər buraxmağa başladı və bu kasetlərdə amerikalı jurnalist James Foley narıncı paltara geydirilmiş şəkildə kamera qarşısına çıxarılmışdı və arxasında camaatın nümayəndələrindən biri danışaraq Amerika Birləşmiş Ştatlarını təhdid edir və meydan oxuyurdu. Yayılan çəkilişin adını da "Amerikaya mesaj" adını daşıyırdı. Daha sonra jurnalistin başının kəsildiyi göstərilir. Bunun üstündən bir neçə gün keçdikdən sonra Steven Sotloff adlı digər bir rəhin eyni tərzdə kamera qarşısına çıxarıldı və o da o şəkildə edam edildi. Kənardan müşahidə edənlər buradan yalnız bir nəticə çıxara bilirdi; əl-Bağdadi camaatı Amerika Birləşmiş Ştatlarını təhdid edərək hər vəch ilə onları müharibəyə dəvət edirdilər. Məgər müsəlmanların mallarını və canlarını düşünən bir "xilafət" belə bir mühimmatı bu tərzdə yerinə yetirərmi?!
Digər tərəfdən ümumiyyətlə Suriyada gedən mübarizəyə ən böyük zərbəni vurmağı bacardılar. Daha öncə vaxtları və resurslarını rejim ilə vuruşa sərf edən müxalif qruplar artıq iki cəbhədə vuruşmağa məcbur edildilər. əl-Bağdadi camaatının Suriyaya daxil olmasından öncə müxaliflərin rejimə qarşı əldə etdiyi nəaliyyətləri onların indiki halları ilə müqayisə etsək bunun böyük bir itki olduğunu başa düşə bilərik.
Müxtəlif bölgələrdəki əmirliklərin içində daxili parçalanmaların əmələ gəlməsi də bu siyasətin nəticəsi oldu. Əfqanıstan, Yəmən, Liviya, Qafqaz kimi bir-birindən fərqli yerlərdə mövcud cihad əmirliklərinin rəhbərlərindən narazı olan kiçik qrupların beyətini qazanaraq oranı "xilafətin" vilayətləri elan etmək həddindən artıq "ağıllı" siyasətdir, halbuki orada nə "xilafət" ordusu, nə idarə strukturu vardır. Əslində bu həm vəziyyətin absurdluğunu, həm də hikmətsizliyini göstərir. Çünki hardasa kiçik silahlı bir qrupun olması oranı xilafət vilayəti etməz. Sabah Azərbaycanda "meşə qardaşları" kimi bir qrup dağlara, meşələrə çəkilib orada əl-Bağdadi'yə beyət etdiklərini elan edərlərsə Azərbaycan vilayəti adlı yeni bir vilayət meydana çıxacaq. Amma bunun bir vilayət olmadığını, heç bir siyasi gücü olmayan silahlı bir dəstədən başqa bir şey olmadığını ağıl sahibləri dərk edirlər.

**Altıncı səbəb**:

əl-Bağdadi nəinki ictihad şərtini, heç ümumiyyətlə hansısa elmi əhliyyət şərtini ödəmir. Alimlər imamın şəriət elmlərində mötəbər bir hasiləyə sahib olmasını ittifaq ilə şərt görüblər və bu, Quranda üzərində vurğu edilmiş bir məqamdır.

"وَقَالَ لَهُمْ نَبِيُّهُمْ إِنَّ اللَّهَ قَدْ بَعَثَ لَكُمْ طَالُوتَ مَلِكًا قَالُوا أَنَّىٰ يَكُونُ لَهُ الْمُلْكُ
عَلَيْنَا وَنَحْنُ أَحَقُّ بِالْمُلْكِ مِنْهُ وَلَمْ يُؤْتَ سَعَةً مِنَ الْمَالِ قَالَ إِنَّ اللَّهَ اصْطَفَاهُ

عَلَيْكُمْ وَزَادَهُ بَسْطَةً فِي الْعِلْمِ وَالْجِسْمِ وَاللَّهُ يُؤْتِي مُلْكَهُ مَنْ يَشَاءُ وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ"

**"Peyğəmbərləri onlara dedi: "Allah Talutu sizə hökmdar təyin etdi!" Onlar dedilər: "O necə bir hökmdar ola bilər ki, biz hökmdarlığa ondan daha çox layiqik və ona heç böyük var-dövlət də verilməmişdir." O dedi: "Allah sizin üzərinizə onu seçdi, elm və bədəncə onun gücünü artırdı. Allah Öz mülkünü istədiyi kəsə verir. Allah (hər şeyi) Əhatə Edəndir, Biləndir."**

Həmçinin Yusuf – aleyhissələm – Firondan onu xəzinədar etməsini tələb etdikdə bu məqama layiq olduğunu göstərmək üçün özünü elm ilə vəsf etmişdir. Ona görə də imamın elm əhli olması ittifaq ilə şərtdir. Lakin ictihad əhli olmasına gəldikdə isə ümmətin böyük əksəriyyəti bunun şərt olduğunu deyiblər. Hətta İmam əş-Şatibi "əl-İtisam" kitabında, əl-Cuveyni isə "əl-Ğiyəsi" kitabında bu şərt üzərində icma olduğunu deyirlər və əl-Cuveyni bu barədə hansısa ixtilafın nəql olunmadığını deyir. Lakin əl-Ğazzəli, İbn Həzm və bəzi digər elm əhli ictihad mərtəbəsini şərt görməyiblər; qeyd ediblər ki, şərt olan imamın ictihad əhlindən fətva almasıdır.
Lakin maraqlı tərəf budur ki, əl-Bağdadi'yə beyət edənlər, onu "xəlifə" olaraq müdafiə edənlər tamamilə fərqli bir tablo çəkirlər. Özlərini "İslam Dövləti"nin müftiləri, qaziləri kimi tanıtdıran "elm əhli" onun haqqında həddindən artıq mübaliğə və yalanla dolu mədhlər işlədirlər. Misal üçün özünü alim yerinə qaldırmış bəhreynli Turki Benali, Əbu Huməm Bəkr bin Abdilaziz əl-Əsəri ləqəbi ilə "Məddul-Əyədi li Bey'atil-Bəğdədi" adlı kitabçasında yazır:

"...حتى واصل دراسته الأكاديمية في الشريعة الإسلامية, فنال " البكالوريس", ثم "الماجستير" في الدراسات القرآنية, ثم "الدكتوراة" في الفقه وللشيخ إطلاع واسع في علوم التاريخ والأنساب الشريفة, وكذا فقد اتقن القراءات العشر للقرآن, وله من الكتب المطبوعة رسالة الماجستير في الدراسات القرآنية ورسالة الدكتوراة في الفقه وكتاب في أحكام التجويد"

**"... ta ki, İslam şəriəti sahəsində akademik təhsilinə davam etdi və bakalavr dərəcəsinə, sonra Quran elmlərində magistr dərəcəsinə və sonra fiqhdə doktorluq dərəcəsinə nail oldu. Şeyxin tarix və şərəfli nəsəblər barədə geniş bilikləri vardır. Həmçinin Quranın on qiraətini mükəmməl şəkildə öyrənmişdir. Onun çap olunmuş kitabları; Quran elmləri haqqında magistr işi və fiqhdə doktorluq işi və təcvid hökmləri haqqında bir kitabı vardır."**[126]

Burada ağlımızda belə bir sual ortaya çıxır. Əgər həqiqətən də bu əl-Bağdadi fiqhdə doktorluq əldə edibsə, üstəlik onun çap olunmuş kitabları varsa o zaman görəsən Turki Benali nə üçün bu kitabların adlarını yazmır? Əgər təriflədikləri

[126] "Məddul-Əyədi li Bey'atil-Bəğdədi", səh: 4

kimi əmirləri fiqhdə dərinləşibsə o zaman nə əcəb onun dərin fiqhinə dəlalət edəcək kitablarının adlarını bizdən gizlədirlər?! “Məddul-Əyədi” kitabının sahibi Turki Benəli yalanında həya etmədən əmiri haqqında bu sözləri deyir:

“ولقد اجتمع في الشيخ أبي بكر ما تفرق في غيره: علم ينتهي إلي النبي صلى الله عليه وآله وسلم ونسب ينتهي إلي النبي صلى لله عليه وآله وسلم.”

**“Şeyx Əbu Bəkr’də başqasında bir araya gəlməyən iki xüsusiyyət birləşib: peyğəmbərə - salləllahu aleyhi va əlihi va səlləm – qədər çatan elm və peyğəmbərə - salləllahu aleyhi va əlihi va səlləm – qədər çatan nəsəb.”**

Bu təkcə Turki’nin fikri deyildir, hətta bunları vəzifəyə seçmiş “şura məclisi” adlandırdıqları camaatın da fikridir. Bu “şura məclisi” bəyanlarında deyir:

“...بأن الكلمة قد اجتمعت على بيعة الشيخ المجاهد أبي بكر البغدادي الحسيني القرشي أميرا للمؤمنين بدولة العراق الإسلامية، وكذا تولية الشيخ المجاهد أبي عبد الله الحسني القرشي وزيرا أولا ونائبا له. والشيخان الفاضلان من أهل القدم الراسخة في العلم”

**“... ki, Şeyx mücahid Əbu Bəkr əl-Bağdadi əl-Huseyni əl-Quraşi’yə İraq İslam Dövlətində möminlərin əmiri olaraq beyət etmək, eləcə də Şeyx mücahid Əbu Abdilləh əl-Hüseyni əl-Quraşi’ni onun naibi, baş naziri vəzifəsinə təyin etmək üzərində ittifaq etdilər. Hər iki fəzilətli şeyx də elmdə möhkəmləşmiş/dərinləşmiş kəslərdəndir...”**

Məhz bu şəkildə əl-Bağdadi’nin tərəfdarları onun haqqında həqiqətə uyğun olmayan, həddindən artıq mübaliğəli və şişirdilmiş sözlər işlədirlər. Turki Benali’nin sözləri isə heç bir ölçüyə sığmayan, yalan üzərində bitmiş sözlərdir. Görəsən həqiqətən də Əbu Bəkr əl-Bağdadi əsrinin nadiri, dəhrinin yek adamıdırmı? Kişini həm dostlarından, həm də düşmənlərindən sorarlar. Ona görə də onu şəxsən tanıyan birinin sözünə yer verəcəyik. İraqda ilk günlərdən müqavimətdə iştirak edən “Ceyşul-Mucahidin” qrupunun əmiri Şeyx Əbu Abdilləh Muhəmməd əl-Mənsur onun haqqında deyir:

“أما أنا فإني أشهد الله الذي لا إله إلا هو بما أعرف عن قرب هذا الدعيّ الذي سمى نفسه أبا بكر البغدادي وقد درس عندي مع مجموعة من الفضلاء شيئا قليلا من كتاب زاد المستقنع في سنة 2005 م ثم انقطع الدرس بسبب اعتقالي وقد عرفته معرفة دقيقة وقد كان محدود الذكاء بطيء الاستيعاب باهت البديهة فليس هو من طلبة العلم المتوسطين ودراسته دراسة أكاديمية في الجامعات الحكومية ومستواها هزيل جدا والتي لا علاقة لها بتكوين طالب علم فضلا عن عالم... ”

**“Mənə gəldikdə isə mən özünü Əbu Bəkr əl-Bağdadi adlandıran bu saxta iddiaçını yaxından tanıdığım üçün bildiklərim barəsində Özündən başqa (ibadətə layiq) ilah olmayan Allahı şahid tuturam; o, 2005-ci ildə bir qrup fəzilət sahibi kəslərlə birlikdə mənim yanımda “Zədul-Mustəqni” kitabından bir şeylər öyrəndi, sonra mənim həbs olunmağım səbəbi ilə dərs dayandı. Mən onu çox yaxşı tanıyıram; zəkası məhdud, gec qavrayan, bədahəti olmayan biridir. O heç orta səviyyəli elm tələbələrindən deyildir və təhsili hökumət universitetlərindəki akademik təhsildir, səviyyəsi çox düşükdür, alim bir kənarda qalsın, heç bir elm tələbəsi yetişdirməklə əlaqəsi olmayacaq dərəcədədir.”**[127]

Yenə eyni səhifədə sözünü bir daha təsdiqləyərək deyir:

“فإني أؤكد حالفًا بالله غير حانث أنَّ أبا بكر هذا ليس راسخًا في العلم بل ولا طالب علم متمكن فحسب، إنما لا يتقن كتاباً واحدًا معتمدًا في العقيدة أو الفقه أبدًا، وإخواننا من طلبة العلم العراقيين من جميع الجماعات والتوجهات يعرفون هذا جيدًا، ويعلمون أنه ليس بينه وبين العلم نسب، ويدركون المستوى الهزيل جدا للعلم الشرعي الذي تقدمه الجامعات الحكومية”

**“Mən Allaha and içərək və andımı pozmadan bir daha vurğulayıram ki, bu Əbu Bəkr elmdə möhkəmləşmiş biri deyildir, hətta nəinki mütəməkkin bir elm tələbəsi deyildir, heç əqidədə və ya fiqhdə mötəməd bir kitabı belə itqan etməyib. İraqdakı bütün camaatlardakı elm tələbəsi qardaşlarımız bunu gözəl bilirlər və bilirlər ki, onunla elm arasında bir nisbət yoxdur və hökumət universitetlərinin təqdim etdiyi şəriət elmlərinin çox düşük olan səviyyəsini yaxşı idrak edirlər.”**[128]

Kitabının əvvəllərində açdığı haşiyədə da onu şəxsən tanıdığını deyir və buyurur:

“ أقول ذلك وأنا خبير بقياداتهم فالزرقاوي رحمه الله بقي في بيتي مدة ليس بالقصيرة وما يسمى الآن زورا بأمير المؤمنين – عليه من الله ما يستحق – كان فردا في جماعتنا ودرس عندي شيئا قليلا من زاد المستقنع ثم قُدِّرَ لي الاعتقال وترك جماعتنا بعد اعتقالي لأسباب ظاهرها إداري وباطنها كما أظن – والعلم عند الله – الهوى وحب الظهور. ومن خلال معرفتي الدقيقة بالشخصين أقول ليس بينهما أفعل تفضيل أبداً. فما يسمى زورا بأمير المؤمنين سيء الخلق جاهل من أهل الأهواء أساء كثيرا إلى الجهاد في العراق واليوم ينقل أهواءه وجهله إلى الشام. أما الزرقاوي رحمه الله فنختلف معه في بعض مسائل التكفير وفي كثير من

[127] “əd-Dəvlətul-isləmiyyə beynəl-Həqiqəti val-Vəhm”, səh: 132;
[128] Eyni mənbə: səh: 132-133;

مسائل السياسة الشرعية لكنه رحمه الله كان أفضل ممن سمى نفسه بالبغدادي... ”

“**Mən onların rəhbərliklərini tanıyaraq bunu deyirəm: əz-Zərqavi – rahiməhullah – mənim evimdə uzun müddət qalıb və bu gün yalandan “möminlərin əmiri” adlanan kəs – Allah ona layiq olduğunu versin! – bizim camaatımızda adi bir fərd idi və mənim yanımda “Zədul-Mustəqni” kitabından bir şeylər öyrəndi. Sonra Allahın qədəri elə gətirdi ki, həbs olundum və mənim həbs olunmağımdan sonra o, zahirdə görünənə əsasən idari səbəblərə görə, batində isə güman etdiyimə görə - doğrusunu Allah bilir! – şəxsi istək və məşhur olmaq sevgisinə görə camaatımızı tərk etdi. Mən hər iki şəxsi yaxından tanıdığım üçün deyirəm ki, onların arasında heç zaman müqayisə ola bilməz. Yalandan “möminlərin əmiri” adlanan kəs əxlaqı pis, hava əhlindən olan bir cahildir, İraqda cihada qarşı çox zərər vurdu və bu gün batil istəklərini və cəhalətini Şama daşıyır. əz-Zərqavi’yə gəldikdə isə - Allah ona rəhm etsin! – biz onunla bəzi təkfir məsələlərində və şəriət siyasəti ilə bağlı çox məsələdə ixtilaf edirik, lakin o – Allah ona rəhm etsin! – özünü əl-Bağdadi adlandırandan daha üstün idi.**”[129]

Bu da onu yaxından tanıyan birinin şahidliyidir. Lakin burada etiraz edib deyə bilərlər ki, Muhəmməd əl-Mənsur müxaliflərdəndir. Onun şəhadəti qəbul olunmaz. Biz isə deyirik ki, biz Muhəmməd əl-Mənsur’un dediklərini qarşı tərəfdən tutarlı bir rədd gəlməyənə qədər qəbul edirik. Ona qarşı əl-Bağdadi tərəfdarlarından birinin yazdığı “Kəşful-Məstur” adlı məqaləsini oxumuşuq və orada bu deyilənlər xüsusunda heç bir cavab yoxdur. Məqalə sadəcə Muhəmməd əl-Mənsur’un zamanında əz-Zərqavi və sonra da “İslam Dövləti” ilə ixtilafının liderlik üzərində olduğunu zikr edir, lakin əl-Bağdadi’nin onun yanında “Zədul-Mustəqni” kitabından azca bir şeylər oxuması barədə dediklərini inkar etmir, əksinə əz-Zərqavi’nin onun evində qalmasına dair söylədiklərini təsdiq edir. Həm də əl-Bağdadi tərəfdarlarının onun yazdığı və çap olunmuş kitablarının adını verməməsi, açıqlamaması onun haqqında deyilənləri təsdiqləmiş olur.

**Yeddinci səbəb**:

əl-Bağdadi əslində 2010-cu ilə qədər məchul biri idi. Hətta 2010-cu ildə Əbu Ömər əl-Bağdadi’nin yerinə keçdikdə Xorasandakı əl-Qaida rəhbərliyi onun haqqında məlumata sahib deyildi. Görəsən bu necə cihad sahəsində tanınmış biridir ki, bu sahənin ən bariz şəxsləri, ən təcrübəli şəxsləri onu tanımırdılar. Doğrudur ki, imamın özünü şəxsən tanımağın vacib olub olmaması alimlərimiz arasında ixtilaflıdır. İmamı tanımağın hamıya fərz olduğunu deyənlər arasında Əbul-Həsən əl-Əşari yer alır. Muhəmməd ibn Furak onun görüşlərini qeydə aldığı kitabında deyir:

[129] Eyni mənbə, səh: 7

"وكان يقول: إن معرفة عين الإمام من فروض الأعيان لأن طاعته تلزم كل عين من المكلفين فإذا صح عقد الإمامة لرجل وجب على سائر المكلفين أن يعرفوه وينقادوا له ويعتقدوا إمامته"

"**Deyərdi: İmamın özünü tanımaq hamıya fərzdir, çünki ona itaət etmək mükəlləflərdən hamıya vacibdir. Beləliklə də əgər bir nəfər üçün imamlıq əqdi səhih olarsa digər mükəlləflərə onu tanımaq, ona boyun əymək və onun imamlığına etiqad etmək vacib olur.**"[130]

Lakin əksər alimlərimiz imamı tanımağın hər bir müsəlmana vacib olduğunu demir. Bu heç də o anlama gəlmir ki, imam məxfi qala bilər, gizli həyat sürə bilər. Əksinə həll və əqd əhli imamı şəxsən tanımalıdır və onun kimliyini, şəxsi xüsusiyyətlərini, elmini, əxlaqını, cəsarətini bilməlidir. Bilməlidir ki, onun imamlıq məqamına layiq olub olmadığına doğru qərar versinlər. Lakin bizim halımızda hətta iddia olunan "xəlifənin" tam adını belə ümmət kafir mediyasından öyrənməli oldu. Şübhəsiz ki, həll və əqd əhlinin imamı tanımasının fərz olması alimlər arasında ixtilaflı məsələ deyildir, ixtilaflı olan imamı hər bir müsəlmanın tanımasının vacib olub olmamasıdır. Üstəlik imamın aşkarda olması, ümməti tərəfindən görülməsi, hiss olunması lazımdır, sadəcə gizli dairələrdə gəzən və ildə iki üç dəfə səs yazısı buraxan və bəzən öldüyü güman edilən bir "xəlifə" ümmətə lazım deyildir. Alləmə Əbul-Bərakət ən-Nəsəfi rafizilərin gizli imam inancını rədd edərkən deyir:

"وينبغي أن يكون الإمام ظاهرا لا مختفيا ولا منتظرا ليمكنه القيام بما نصب هو له إذ نصب من لا يمكنه القيام بذلك غير مفيد."

"**İmam gərək aşkarda olsun, gizli və ya gözlənilən olmasın ki, təyin olduğu vəzifəsini yerinə yetirməsi mümkün olsun, çünki bunları yerinə yetirmək imkanı olmayan birini təyin etməyin bir faydası yoxdur.**"[131]

Etiraz edib deyə bilərlər ki, ən-Nəsəfi'nin burada dedikləri rafizilərin inandıqları qeybdəki imamları barəsindədir. Bu etirazın cavabı budur ki, ibrət deyilən sözün özündə deyildir, lakin o sözün daşıdığı mahiyyətdədir. Rafizilərin imam olaraq qəbul etdiklərinin ümmətə bir faydası olmadığı kimi məxfilik möhrü altında gizlənmiş bir xəlifənin də ümmətə faydası yoxdur. Məhz əl-Bağdadi'nin məxfi bir kimliyə sahib olması onun haqqında müxtəlif təsəvvürlərin formalaşmasına səbəb olmuşdur. Ona görə də bəzi kəslər onun zəif və başqaları tərəfindən idarə edilən biri olduğunu deyirlər. Digərləri isə onun qureyşli olduğunu şübhə altına alırlar. Biz isə onu yalnız gördüyü işlərin nəticəsinə görə dəyərləndirə bilirik və indiyə qədər gördüyümüz nəticələr yalnız parçalanmanın çoxalması, müsəlman qanlarının axıdılması, təkfir, malların oğurlanması olub.

[130]"Məqalət əş-Şeyx Əbil-Həsən əl-Əşari", səh: 192;
[131] "Şərhul-Umdə fi Aqidəti Əhlis-Sunnəti val-Cəmaah", səh: 476;

**Səkkizinci səbəb**:

Burada ən aşkar səbəblərdən biri bu camaatın sıralarında sözü keçən, etibarı olan bir elm əhlinin olmamasıdır. Aralarında elm əhli kimi tanınan kəslər isə əslində elm tələbəsi adlana biləcək kəslərdir və öz şeyxlərinə, böyüklərinə qarşı baş qaldırmış, tərbiyyəsizlik etmiş kəslərdir. Ona görə də bu "xilafətin" mövcud olduğu qısa bir müddət ərzində verilən fətvalar və əmrlər şəriətə tam müxalif hökmlər və əmrlər olub.
əl-Adnani çıxışlarının birində kafir ölkələrində aman alaraq yaşayan müsəlmanları xəyanət etməyə, kafirlərin xəbəri olmadan onlara qarşı qəfildən hücum etməyə, onları öldürməyə çağırır. Məzhəb alimləri bütün bunları xəyanət hesab etdikləri üçün haram sayıblar. Həmçinin Dabiq jurnalının doqquzuncu buraxılışında əl-Bağdadi camaatının yezidi qızları əsir götürərək onlarla cinsi əlaqədə olmaqları etiraf edilir və bununla fəxr edilir. Lakin dörd məzhəbin ittifaqı ilə[132] müsəlman və ya kitab əhli olmayan cariyələr ilə cinsi əlaqədə olmaq haramdır. Üstəlik eyni jurnalda bu mövzunu qələmə alanlar İslamda quldarlığı peyğəmbər sünnəti kimi başa düşürlər və elə zənn edirlər ki, bu, tərk edilmiş bir sünnətdir. Lakin nə Quran, nə də sünnət insanları kölə etməyə təşviq etmir, əksinə Quran və sünnət kölələri azad etməyə təşviq edən dəlillər ilə doludur. Lakin müsəlmanların müharibədə kölə götürməkləri zərurətdən irəli gəlirdi və İslamın nəzərə aldığı bəzi məsləhətlərin tələbi idi. Həmçinin İraq "İslam Dövlətinin" şəri heyəti tərəfindən hazırlanmış "İləmul-Ənəm" adlı risalədə hətta müsəlmanların üzərində bir imam olmadan orucun, verilən zəkatın səhih olmadığı da iddia edilir. Bu cür cahilcəsinə seçilmiş rəylər və verilmiş fətvalara misallar çoxdur, xüsusilə də təkfir və qanları halal etmək mövzusunda fətva verməkdəki cürətləri bunu göstərir ki, bu işin başında duranlar cahil insanlardır. Misalları çoxaltmaq olar, lakin dediklərimizin məğzi budur ki, həqiqi elm əhli olmadıqda və cahillər işin başına keçdikdə belə bir mənzərə ilə qarşılaşırıq. Ümumiyyətlə bu xilafətdə hökm hansı üsula görə verilir? İddia olunan "xəlifə" şübhəsiz ki, müctəhid deyildir, heç alim də deyildir. O zaman ixtilaflı məsələlərdə ixtilafı qaldırmaq üçün hökmünə müraciət olunan qazi və ya müfti vəzifəsində kim oturub? Əhliyyəti nədir? Bütün bunlar bu günə qədər də bizim üçün qaranlıqdır. Adları çəkilən bəzi şəxslərin bu vəzifələr üçün nalayiq olmaqları isə şəkk götürməyən bir bilgidir.

---

[132] Hətta "əl-İfsah" və digər kitablarda bunun üzərində icma olduğu nəql olunmuşdur. İbn Abdilbərr, əl-Qurtubi və başqaları bunu mübah görənlərin görüşünün şaz olduğunu deyiblər. əl-Qurtubi təfsirində (5/140) deyir: "**Bu, şaz və tərk olunmuş bir görüşdür, ölkələrin fəqihlərindən heç kim bu görüşə əhəmiyyət verməyib.**" İbn Abdilbərr "əl-İstizkər" kitabında (5/494) deyir: "**Bu məsələdə Mücahid və Tavus'dan rüxsət rəvayət olunub və bu, şaz və tərk olunmuş görüşdür.**" İbn Qudəmə isə "əl-Muğni" kitabında (7/143) deyir: "**Bu görüş bizə yalnız Tavusdan gəlib çatıb.**" İbn Qudəmə daha sonra Tavusun görüşünü dəstəkləyən dəlilləri zikr edir və sonra deyir: "**Bu dəlilin onların mübahlığına dəlaləti zahirdir, lakin elm əhli bunun əksi üzərində ittifaq edib.**" Əbu Həyyan əl-Əndəlusi "əl-Bəhr əl-Muhit" adlı təfsir kitabında bunun üzərində icma olduğunu deyir. Doğrudur ki, elm əhlindən bəziləri bu dəlillərə əsasən rüxsət verənlərin görüşünü doğru saymışdır, lakin bu, elm əhlinin ittifaqına müxalif olduğu üçün şaz sayılan bir görüşdür. Alimlər isə icma ediblər ki, qaziyə və müftiyə şaz olan görüşlərlə hökm vermək və fətva vermək icazəli deyildir. Görəsən ümmətin dörd məzhəbini tərk edib bu zamanda belə bir şaz görüşlə əməl etməyi kim tərcih edib? Məgər əl-Bağdadi'nin camaatında dörd məzhəbə müxalif olaraq şaz görüşü tərcih edəcək əhliyyətə sahib bir müctəhid varmı?!

## Elm əhlinin rəyi

Bütün bu dediklərimizə və digər səbəblərə görə müasir zamanımızda İslam şəriətini ən yaxşı bilən elm əhli alimlərimiz əl-Bağdadi camaatının qurduğu "xilafəti" rədd ediblər və onun şəriətə müxalif əsaslar üzərində qurulduğunu deyiblər. Burada onlardan bəzilərindən sadir olmuş sözləri qeyd edəcəyik. İlk öncə sevdikləri və hörmət etdikləri alimlərdən zikr edəcəyik. Şeyx Süleyman bin Nəsir əl-Ulvan deyir:

"أبو بكر (البغدادي) ما انتخبه لا أهل الحل ولا أهل العقد وإذا كان قائده والمسؤول عنه (الظواهري) ما رضي عن عمله كيف يطالب الآخرين بمبايعته؟!"

**"Əbu Bəkr (əl-Bağdadi'n)i nə həll əhli, nə də əqd əhli seçməyib. Əgər onun rəhbəri və ondan məsul olan (əz-Zavahiri) onun əməlindən razı olmayıbsa o zaman başqalarından ona beyət etməsini necə tələb edə bilər?!"**

Süleyman əl-Ulvan isə <u>hələlik</u> ittiham olunmamış biridir, həbsdə olduğu üçün Səudiyyə hökumətinin əlində oyuncaq olduğunu da iddia edə bilmirlər. Ona görə də onun sözü əhəmiyyətlidir. Həmçinin Süleyman əl-Ulvan'a görə "xilafət" elan edilmədən öncəki "İraq İslam Dövləti" sadəcə bir cihad əmirliyi idi və əl-Qaidə camaatına tabe idi.
Şeyx Abdulaziz ət-Tarifi də bu barədə öz rəyini bildirmişdir. O, hələ "xilafət" elan edilmədən öncə "İraqda və Şamda İslam Dövləti" (İŞİD) adını daşıdıqda demişdi:

"الانضمام تحت رايتها (داعش) ما دام أنها لا تقبل بحكم الله المستقل عنها لا يجوز
أما من كان تحت رايتها يذهب إلى رايات كثيرة وهي عديدة ومتنوعة"

**"Özündən asılı olmadan müstəqil şəkildə Allahın hökmünü qəbul etmədiyi müddətdə onun (İŞİD'in) bayrağı altında sıralarına qoşulmaq icazəli deyildir. Amma artıq bayrağı altında olanlar isə digər qruplara getsinlər, onlar çoxdur və müxtəlif növdürlər."**

Şeyx Abdullah əl-Ğudeyyən, Şeyx Abdullah bin Abdirrahmən əs-Sa'd, Şeyx Sad bin Turki əl-Xasələn, Şeyx Saleh bin Abdilləh bin Humeyd, Şeyx Yusuf bin Abdilləh əl-Əhməd, Şeyx Muhəmməd əl-Həsən Vild Dədu əş-Şənqiti, Şeyx Muhəmməd Buxubzə, Şeyx Xalid bin Abdilləh bin Muslih, Şeyx Abdurrahmən bin Saleh əl-Məhmud, Şeyx Saleh əl-Favzan, Şeyx Nasir bin Süleyman əl-Umər və daha bir çox tanınmış, elminə görə sayılan alimlər bu camaatın etdiklərini rədd ediblər və onları nəinki "xilafət", heç bir dövlət kimi də qəbul etməyiblər.

Biz hələ cihad sahəsində elminə görə tanınmış Əbu Muhəmməd əl-Maqdisi, Əbu Qatədə əl-Filistini, Əbu Bəsir ət-Tartusi, Ömər bin Məsud əl-Həduşi, Həni əs-Sibəi, Tariq Abdulhəlim, Əbu Munzir əş-Şənqiti, Həsən bin Əli bin əl-Muntəsir əl-Kəttəni və başqalarını zikr etmirik. Burada Əbul-Məhasin qardaşımızın bəzi sözlərinə toxunmağımız lazımdır. Qardaşımız deyir:

> "**Lakin bu cahil iddia edir ki, imamı ümmətin nüfuzlu adamları və alimləri seçməlidir və bununla Maqdisi, Əbu Qatada, Tariq Abdul-Halim və Həni Sibai kimi adamları qəsd edir. O kəslər ki, onları 200-300 min nəfər qəbul edə yaxud etməyə. Sonra həyasızcasına onların ümmətin alimləri olduqlarını iddia edir. Görəsən ümmət dedikdə bu adam öz dəstəsinimi qəsd edir?! Vallahul mustəan!**"

Əbul-Məhasin qardaş məqaləsində cahil sözünü çox işlədir. Çox yerdə məsələyə atifi bir yanaşma göstərir. Biz bu kitabımızda böyük imamlarımızdan və alimlərimizdən nəql etdiyimiz sözlər ilə izah etdik ki, imamı həqiqətən də ümmətin nüfuzlu adamları, alimləri və liderləri seçməlidir. Bu barədə əl-Ğazəli'dən, əl-Cuveyni'dən, İbn Teymiyyə'dən, hənbəli və maliki məzhəblərindən, hətta şafi'ilərdən və hənəfilərdən, həmçinin müasir alimlərimizdən nəql etdik ki, beyət edəcək şəxslər ümmətin tabe olduğu, sözlərini dinləyib itaət etdikləri şəxslər olmalıdır. Bunu əl-Maqdisi, Əbu Qatədə, Tariq Abdulhəlim və Həni əs-Sibəi ilə kifayətlənməsi lazım deyildir, lakin şübhəsiz ki, bu adları çəkilən adamların sözünü sayıb dinləyənlər az deyildir. Lakin həll və əqd əhli bu gün bunlarla kifayətlənmir. Ona görə də bu cür ucuz yollar ilə oxucuların gözünə pərdə salmaq lazım deyildir. Ümmət dedikdə isə geniş bir coğrafiyada yayılmış müsəlman kütlələr qəsd edilir və onların itaətini, beyətini qazanmaq onların sayıb hörmət etdikləri, tabe olduqları böyüklərinin beyətini qazanmaq ilədir.

> "**İngiltərə, Kanada və İordaniyə təcridxanasına dəvətnamə gəlmədiyinə görə beyət batil olarmış!!!**"

Bu sözləri Əbul-Məhasin qardaş yuxarıdakı sözlərinin arxasında qeyd edir. Əslində həm onun özünə, həm də cihad sahəsindən xəbəri olan hər kəsə məlumdur ki, əgər Əbu Muhəmməd əl-Maqdisi beyət etmək istəsəydi lap İordaniya'nın təcridxanasından səs ilə bəyan edərək beyət edərdi, necə ki, hələ təcridxanada olarkən əl-Bağdadi camaatı onunla əlaqə qurub bəzi məsələlər haqqında onun rəyini rahatlıqla öyrənə bilirdilər. Eləcə də İngiltərə, Kanada məsafə baxımından uzun olsa da əlaqə baxımından uzaq deyildir. Əgər həqiqətən də əl-Bağdadi'nin xəlifəliyə layiq olub olmaması sualını bu şəxslərə ərz etmək istəsəydilər bunu rahatlıqla edə bilərdilər. Nəinki adları çəkilən bu şəxslərə, eləcə də ümmətdə sözü sayılan və seçilən alimlərlə, digər şəxsiyyətlər ilə rahatlıqla əlaqə saxlaya bilərdilər. Ancaq əl-Bağdadi və onun ətrafındakı insanlar çox gözəl bilirdilər və anlayırdılar ki, xəlifə məsələsini bu insanlara ərz etsələr onlar bununla razılaşmayacaqdılar, çünki hələ xilafət elan edilmədən öncə belə bu şəxsiyyətlər və ümmətin alimləri onların əməllərini rədd edirdilər, onları xaricilik, bağilik kimi sifətlər ilə vəsf edirdilər. Bunu çox gözəl bildikləri üçün onların rəyini öyrənməyə, onlar ilə məşvərət etməyə ehtiyac duymadılar, necə ki, İraqdan tullanaraq heç bir dövlətçilik qurmadan gülünc bir şəkildə Şamda da

dövlət elan edərkən o torpaqlardakı camaatların heç biri ilə məşvərət etməmişdilər. Ona görə də ümmət əl-Bağdadi'nin camaatını istibdədi, aşırı və zalım bir camaat kimi tanıyır. Buna görə də məsələ məşvərət etməyin imkansızlığı məsələsi deyildir, məsələ beyət etməyin imkansızlığı məsələsi deyildir, lakin məsələ saymamazlıq, istibdəd və kibr məsələsidir. Əgər belə olmasaydı öz başına "xilafət" elan edərək digər camaatları, əmirlikləri ləğv etməyə cürət etməzdilər. Əgər belə olmasaydı müsəlman qanlarının axmaması üçün müstəqil şəkildə Allahın hökmü ilə mühakimə olunmağa razı olardılar və "dövlət fərdlər tərəfindən mühakimə olunmaz" deyərək təkəbbürlük göstərməzdilər.

# Tənbih

Burada kitabın möhürünü qoymaq surəti ilə bəzi məsələlərə diqqət çəkmək istəyirəm. Biz nəinki əl-Bağdadi camaatının, eləcə də Taliban camaatının xilafət qurduğuna inanmırıq. Ona görə də Əbu Munzir əş-Şənqiti’nin Taliban əmirliyi haqqında etiqad etdiklərinin əsas olduğunu deyirik. Üstəlik Taliban əmirliyi də heç bir zaman xəlifəlik iddiasında olmayıb, əksinə yalnız Əfqanıstan daxilində İslam Əmirliyi qurmağı məqsəd gördüklərini deyiblər. Bu, reallıqda lövbər atmış, xurafatlardan uzaq olan kəslərin düşüncəsini təmsil edir, çünki öz imkanlarını gözəl bilirlər.

Həmçinin qeyd etməliyik ki, hər bir müsəlman ən azından qəlbində İslam Dövlətinin qurulmasını istəməlidir, qəlbindən belə bir istəyi keçirməyən, Allahın şəriəti ilə idarə olunan ölkədə yaşamağı arzu etməyən hər bir müsəlmanda nifaqdan bir şöbə vardır. Şəriətlə idarə olunmağı istəməyən və onu rədd edən insan isə küfr əhlidir. Ona görə də ümmətin söz sahibi liderlərinə, imkan sahibi rəhbərlərinə bu amal istiqamətdə iş görmək, əmək sərf etmək vacibdir. Kitabımızın müqəddiməsində xəlifəliyin bir fərz olduğunu vurğuladıq. Lakin ümmətin zəifliyi səbəbi ilə bunu birdən qurmaq əql sahiblərinin başa düşdüyü kimi imkansızdır, çünki fənər tikmək istəyib də şəhər dağıdanlardan olmamalıyıq, qaş düzəltmək istədiyimiz yerdə göz çıxardanlardan olmamalıyıq. Ümmətin indiki halını bir zərurət olaraq gördüyümüz üçün bütün ümmət üzərində qurulacaq xilafətin halhazırda imkansız olduğunu düşünürük. Lakin ilk növbədə ayrı-ayrı bölgələrdə müsəlmanları şəriətlə idarə edəcək, ədalət prinsipini bayraq edəcək islam dövlətlərinin qurulması vacibdir. Bundan sonra bu dövlətlərin iqtisadi və hərbi cəhətdən güclənməsi lazımdır və daha sonra bütün ümməti birləşdirəcək bir ittifaq üzərində çalışmalıdırlar.
Ən sonda isə, əziz müsəlman, sənə müraciət edərək deyirik: Allahın elçisinin – salləllahu aleyhi va səlləm – bu hədisində sözünü etdiyi zümrədən olmaqdan qorx!

“يَأْتِي فِي آخِرِ الزَّمَانِ قَوْمٌ حُدَثَاءُ الأَسْنَانِ، سُفَهَاءُ الأَحْلاَمِ، يَقُولُونَ مِنْ خَيْرِ قَوْلِ البَرِيَّةِ، يَمْرُقُونَ مِنَ الإِسْلاَمِ كَمَا يَمْرُقُ السَّهْمُ مِنَ الرَّمِيَّةِ، لاَ يُجَاوِزُ إِيمَانُهُمْ حَنَاجِرَهُمْ”

**“Axır zamanda yaşları az, ağılları zəif olan bir qövm çıxacaq, insanların dedikləri ən xeyirli sözləri söyləyəcəklər, oxun şikardan çıxdığı kimi İslamdan çıxacaqlar və imanları boğazlarından ötəyə keçməyəcək.”**[133]

[133] “Sahih əl-Buxari”, 3611, 5057;

وصلى الله وسلم على نبينا
وعلى آله وصحبه
أجمعين

